# MƏHƏMMƏD FÜZULİ

## LEYLİ VƏ MƏCNUN

N.RZANIN
BƏDİİ
NƏSRLƏ
ŞƏRHİ

—"Lütf eylə! —dedilər,
—ey süxənsənc!
Faş eylə cahanə
bir nihan gənc!
Leyli-Məcnun
əcəmdə çoxdur,
Ətrakdə ol fəsanə yoxdur.
Təqrirə gətir bu dastanı,
Qıl tazə bu əski bustanı".

"Lütf eylə, dedilər:
—Ey söz sərrafı!
Bir gizli xəzinəni də
sən aç!
Fars dilində Leyli-Məcnun
əfsanəsi çoxdur,
türklərinsə yoxdur.
Bu dastanı tərpət,
bu köhnə dastanı təzələ".

# MƏHƏMMƏD FÜZULİ

## LEYLİ VƏ MƏCNUN

**N.RZANIN**
**BƏDİİ**
**NƏSRLƏ**
**ŞƏRHİ**



AZƏRBAYCAN DÖVLƏT NƏŞRİYYATI
BAKI—1999

**BBK Cb2(Az)**
**P 59**

İxtisas redaktoru
prof. ***SAMƏD ƏLİZADƏ***

Nəşriyyat redaktoru
***Aynə HÜSEYNOVA***

Rəssam
***Tale MƏLİK***

**P 59 N.Rza. Məhəmməd Füzulinin "Leyli Məcnun" əsərinin bədii nəsrlə şərhi.**
Bakı. Azərnəşr. 1999. 224 səh.

P 59 $\frac{4702010104}{M\ 651(07)-99}$

## "DÜŞVAR"I ASAN — NƏZMI NƏSR EDƏN HƏKİM...

Müqəddəs, ilahi, əbədi bir Türk dünyası naminə özünün övlad və şair xidmətinin ən böyüyünü Füzuli türk dili qarşısında göstərmişdir: bədii türkcənin şah beyti olan "Divan" və "Leyli və Məcnun" yazmışdır. Məhz bu vaxtdan bütün islam Şərqində həm şifahi, həm də yazılı bədii ən'ənədə ümumi, vahid bir "türk dil məkanı" formalaşmışdır. Bu məkanın "müəllifi" Füzuli idi!..

Həmin məqsədi şair şüurlu - nəzəri şəkildə qarşıya qoymuşdu və onu əməli şəkildə, axıra qədər həyata keçirmişdi: "Ey feyz - rəsani - ərəbü - türkü - əcəm!" Qıldın ərəbi əfsəhi - əhli - aləm. Etdin füsəhayi - əcəmi Isadəm. Bən türkzəbandan iltifat öyləmə kəm".

Göründüyü kimi, Füzuli düşvarı asan, yoxu var etməyi tanrı xisləti bilir, Tanrının özünə yalvarır və dualar edir ki, "tanrı işi"ni "türkcə"də görməkdə ona yar və pərəstar olsun!.. Ümumiyyətlə şair sözə, dilə sakral münasibət bəsləyir,şe'ri "uca dərgahdan gələn feyz" hesab edir. Özü də bütün bunlar yalnız arzu, dua, "münasibət" olaraq qalmır: bütünlükdə həm "Leyli və Məcnun"un, həm də "Divan"ın semantik stixiyası - ilahi, sirli, təhtəlşüur bir aləmdən xəbər verir. Hər iki kitabda şair bizimlə Qur'andan gələn ilahi üslubda, göylərin, müqəddəsliyin insanla danışdığı müştərək poetikada və semantikada danışır: "Aləm sədəfində insandan qiymətli bir gövhər görmədim və insan gövhərində isə sözdən şərəfli bir cövhər tapmadım". Yaxud: "Can sözdür, əgər bilirsə insan. Sözdür ki, deyirlər özgədir can". Sözə və insana verilən bu gövhər /və cövhər!/ qiymətinin nüfuzu keşiyində dünyada bəlkə də ən böyük eşq cəfakeşinin və söz sərrafının özü durur. Belə sərrafın və cəfakeşin qoruduğu qalaya- "beytül - müqəddəs"ə, ilahi Kə'bəyə və türbəyə iti skalpellə, yalnız cərrah bıçağı ilə daxil olmaq doğurdan da adamdan böyük hünər və "ilahi cəsarət" istəyir.

Əslində belə cəsarətin də öz ən'ənəsi və artıq neçə əsrdir ki, sabitləşən tarixi və təcrübəsi vardır. Belə ki, "Leyli və Məcnun"la bağlı mətnşünaslığın bünövrə səhifələri hələ Füzuli müasirlərindən Əhdi Bağdadinin ilk təfsirləri ilə /"Gülşəniş - şüəra", 971/ başlayır. Həmid Araslı, Əbdülkərim Əlizadə, Rüstəm Əliyev, Cahangir Qəhrəmanov, Samət Əlizadə, Tahir Məhərrəmov, Əbülfəz Rəhimov, Firuz Sadıqzadə kimi çağdaş mənbəşünas alimlərin hazırladığı elmi-tənqidi mətnlərlə tamamlanır. Əlavə etsək ki, şe'rlərinin mətni üzərində ilk dil əməliyyatını Füzuli özü aparıb /cavanlıqda dostlara və gözəllərə payladığı qəzəlləri ahıllıqda bir yerə toplayıb, üzərlərində təshihlər aparıb və onlardan divan tərtib edib/ onda dediyimiz tarix daha da qədimləşər və zənginləşər.

Türkiyədə Nəcməddin Onanın, həmçinin, Hüseynin, Azərbaycanda Sabir Əliyevin təşəbbüsləri isə daha bənzərsiz və unikal səciyyə daşıyır: Füzuli şe'rinin söz stixiyasını çağdaş nəsrin bizə daha anlaşıqlı dilinə çevirməyin əsasını onlar qoyurlar.

"Leyli və Məcnun"un bu nəşri hər iki sahədə ən'ənə və uğurların zəminində meydana çıxır; bir redaktor kimi yüksək ixtisaslı mütəxəssisin - Samət Əlizadənin simasında mətnşünaslığın da nailiyyətlərini özündə əhtiva edir.

Əlbəttə, sənət baxımından da, xronologiya baxımından da, "Leyli və Məcnun"un nəşri tarixində bir janr kimi bədii nəsr /təfsir/ elmi mətndən sonrakı mərhələdir. Mətnşünas - əlyazmasının, xəttatın və katibin səhvi üzərində işləyir, təfsirçi — Füzulinin öz dili və üslubu üzərində! Mətndə bir nöqtə ilə /"gözü " "kor" eləməklə!/ söz dəyişir, təfsirdə isə kora çevrilən gözlünün tam halda rəsmi, portreti, obrazı ilə bağlı bütün süjet, hadisə, fabula dəyişir. Metamarfoza obrazlı rəsmin, fikrin, emosiyanın, bütünlükdə informasiyanın özündə baş verir.

Ikinci halda tikinti vahidi artıq söz və kəlmə (kərpic) deyil, təfsirçi misra - misra, sətr - sətr işləyir və burada poetik Qala bədii zirvələrdən — misralardan və beytlərdən hörülür. Bütün bunların nəticəsində isə birinci halda — nüsxələr, ikincidə — əsərlər, obrazlar arasında fərq əmələ gəlir ki, onun günahı daha böyükdür. Bir sözlə, mənbəşünaslıqda kamillik bizi əsərin mətninə, təfsirilikdə kamillik - Füzulinin özünə daha çox yaxınlaşdırır.

Ədəbi-elmi ictimaiyyətdə təqdim olunan bu kitabda görkəmli ziyalımız, nüfuzlu filoloq-həkim, professor Nürəddin Rza ikinci ən'ənənin davamçısı kimi çıxış edir, "Leyli və Məcnun"u onun yeni nəsr variantı ilə birlikdə oxucuların mühakiməsinə verir.

Təfsirçinin iyirmi illik üslub və dil axtarışı, fonatik saf - çürük və leksik ələk - vələk işi, həmçinin, kamil elmi - tənqidi mətnlərin artıq çoxdan əldə olması /təfsir üçün e'tibarlı tənqidi mətn kimi H.Araslının mə'lum və mö'təbər mətni - akademik beş cildliyin II cildi, Bakı, EA, Ədəbiyyat Institutu, 1958- əsas götürülmüşdür/ belə bir niyyətin həyata keçməsini aktual və mümkün etmişdir.

Bədii mə'nanın, ovqatın axarını və stixiyasını Füzuli müasirlərinin duyğulandığı, düşündüyü və yaşadığı linqvistik mühitdən /həmçinin, tarixi-sosioloji, ədəbi-mədəni mühitdən/ təfsirçinin özünün müasirlərinin yaşadığı dil və düşüncə məkanına zədəsiz /mümkün qədər az itki ilə/ daxil etmək hər bir yaradıcı təfsirin əsasını təşkil edir. "Leyli və Məcnun"un konkret nümunəsində bu vəzifə bir qədər də çətinləşir. Axı Füzuli, poeziyanın obrazlığı xeyrinə bir dilin yox, üç /!/ dilin /türk - fars - ərəb/ vəzn, ifadə, avaz və mə'na imkanlarını səfərbər edir. Bu "üç qatlı" kəhkəşanın bədii cazibə, işıq və enerji ehtiyatlarını təkcə bir dilin /türkcənin!/ çağdaş məcrasına, bugünkü ifadə və ehtiva cəzirəsinə sığdırmaq mümkündürmü? Axı orta əsr şe'rinin stixiyası, fitri, təbii, bədii ilkinliyi və bakirliyi nəinki janrdan - janra və epoxadan - epoxaya, həyatda əlifbadan - əlifbaya /ərəb qrafikindən kirilə və latına/ çevirəndə də zədə alır, yadlaşır, özgələşir.

Mövlanə Məhəmməd Füzuli özü üç dildə, amma təkcə bir əlifbada yazıb və əvvəllər Füzulinin dünyada cəmi bir "Leyli və Məcnun"u olub, sonralar isə hər dövr Leylinin və Məcnunun sayını artırıb, elmin də, elmi mətnin də, əlifbanın da hər yeni mərhələsi və çeşidi bizə təzə bir Füzuli və "Leyli və Məcnun" təqdim edib.

Füzulinin bədii-estetik cəhətdən ən vüs'ətli və zəngin, linqvistik-üslubi baxımdan ən çevik və lakonik əsəri olan "Leyli və Məcnun"u nəsr dilində ifadə etmək — sənətdə vahiməli aşırımlardan adlamaq, həm də müxtəlif psixoloji maneələri dəf etmək deməkdir. Çağdaş təfsirçini tə'qib edən ilkin və sürəkli hiss budur: necə edəsən ki, şairin poeziyası mə'nanın hüsnündə, şe'riyyətdə nəsrə çevrilməsin - poetik dühası zəkata, ürəyə tə'sirdə nasiranə şəkil almasın?! Lakin əsərin nəsr dilində səslənməsi tarixin və zamanın tələbi kimi meydana çıxarsa, öncə orta əsərlərin ədəbi - fəlsəfi və elmi - tarixi biliklərinə yiyələnməli, daha sonra dürlü - dürlü hazırlıq yollarından keçməlisən. Çünki belə bir ciddi və siqlətli iş klassik poeziya məhvərində Füzulinin fərdi yaradıcılıq üslubunun sirlərinə vaqif olmalı və bədii - estetik cəhətdən cilalanmış, mə'suliyyətli bir qələmlə işə başlamağı tələb edir; işin əməli gedişində isə təfsirçi gah yazıçıya, gah da linqvist - stilistə və mətnşünasa çevrilir: ərəb, fars və əski türk sözlərinin bütün müstəqim və məcazi mə'na—yükünü təhrif etmədən—daşıyıb süzgəcdən keçirməli olur, şairin fikir axarını diqqətlə izləməyə və hər bir kontekst daxilində bədii qayəsini qorumağa çalışır.

Bu zaman təfsirçi iki əməliyyatı eyni vaxtda aparır: şe'r sintaksisini nəsr qrameri ilə, az anlaşıqlı ərəb və fars sözlərini isə ən işlək türk leksik vahidləri ilə əvəz edir. Üslubda, janrda bədii sintaksisin çeşidini qismən dəyişəndən sonra mətndə də üç dilin söz vahidləri sırasında leksik yerdəyişmə, əvəz etmə işi ilə məşğul olur. Ritm sistemi, söz sırası, ekspressiv vurğu və çalar, spesifik tələffüz səhmanı... hər şey nəzərə alınır. Həm də bu zaman müəllif hərfdə qrafikləşən, sözdə kodlaşan mə'na, struktur, semantik vahidlərin ilkin stixiyasına mümkün qədər sadiq qalmağa çalışır. Bu spesifik yaradıcılıq əməliyyatında Nürəddin Rzanın təbib və ədib vərdişləri səmərəli vəhdət tapır, yetkin səriştəlilik sayəsində poemanın mətni hissə - hissə sadələşdirilir, aydın və anlaşıqlı dillə ifadə olunur. Ilk baxışda, poetik əsərin qeyri - bərabər hissələrə - "bənd"lərə bölünməsi sün'i və texniki tə'sir bağışlaya bilər. Halbuki, bu işin özü hər dəfə əsərin mətninə daxil olmağa, "zərrədə bütövü görməyə", bədii və sintaktik bütövlərin hüdudunu düzgün müəyyənləşdirməyə, qrammatik əlaqə və münasibətlərin milli təbiətini qorumağa, qısa misra - cümlələrdə dahiyanə təzahür edən bədii məqsəd və intonasiya çalarlarını incəliyinə qədər duymağa imkan yaradır. Xoşbəxtlikdən, təfsirçi - müəllif görəcəyi işin predmetini və sosial - mədəni vəzifəsini öncə dəqiq "təşxis" edib

fəaliyyətə başlamış, özünün dediyi kimi, "Füzulinin bu ölməz, şah əsərinin gənclərimizin oxuyub anlamalarını bir qədər əsaslandırmaq... yüz minlərlə Azərbaycan oxucusuna yardım məqsədilə bu çətin işə girişmişdir".

Məqsəd beş yüz yaşlı dahi əcdadla onun bugünkü şəcərəsi - ulu nəticəsi arasında körpüyə çevrilmək və savadlı Füzuli oxucusu tərbiyə eləməkdir. Bunu gərək təbibdən əvvəl filoloq-müəllimlər /ədəbiyyatçılar/ edə idilər. Nə etməli, Allah onlara insaf versin, bir -birlərinə o qədər umud olublar ki, axırda onların da işini, vəzifə borcunu həkim - ziyalı yerinə yetirməli olub. Bütün bunlara görə biz Nürəddin müəllimə ikiqat minnatdar oluruq. /Bəlkə də əvvəlcə elə məhz həkim skalpeli daha çox lazım imiş ki, qələmə də yol açılsın və cərrahiyyə əməliyyatı bədii mətndən əvvəl "biganəlik" adlı mə'nəvi xəstəliyə tətbiq olunsun/. Bəllidir ki, əsərin həcmcə beşdə - birini "giriş" fəsilləri /dibaçə, münacat, nə't, qəsidlər, saqinamə və s./ tutur; bunların sırasında farsca bir qəsidə də vardır. Dini - fəlsəfi mətləblərlə zəngin olan bu fəsillərin nəsrlə sadələşdirilməsinə az əmək sərf olunmayıb. Təkcə başlıqlara diqqət etmək kifayətdir ki, indiki oxucuların üzünə tarixən bağlanmış "dəmir qapı"nın necə açıldığını yəqin edəsən: "Bu, həzrəti-izzətdən həmd ilə istimdadi-mətalibdir və əsari-şükr ilə istid'ayi -sətri - laibdir " /Bu, həzrət ilahiyə sitayiş arzularımı yerinə yetirməsi üçün xahişdir və ona şükr edərək bu sətirlərin qüsurunu örtmək üçün yalvarışdır/; "Bu, vacibul - vücud isbatına bürhani - qate'dir və bəqai - sair mövcudata dəlili-mane'dir" /Bu, varlığı vacib olanın isbatına qəti bir sübutdur və başqa varlıqların daimi olmadığının dəlilidir/. Şübhəsiz, əsərin mətnində sadələşdirilmiş "nəsr əməliyyatı" aparılmadan onlarca poetik fraqmentin nəinki ümumi ədəbi - bədii məzmunu, hətta ayrı - ayrı misra, yaxud, beytlərin müstəqim nominativ informasiyası da oxucuya çatmır: "Hər daşə ki, yetdi, tökdü yaşın, Lə'l eylədi kuhü dəşt daşın. Göz yaşını bəs ki, tökdü hər su, hər mərhələdən axıtdı min cu. Bir əbri - bəla idi, -güvahi: Baran - sirişki, bərq - ahi". Səhralara sərgərdan üz qoyan Məcnunun feci halını əks etdirən bu üç beytin anlaşılması üçün təfsirçi ən azı on sözün lüğəti tərcüməsini verməkdən başqa, söz sırasını nəsr dilinə uyğun dəyişir və sonuncu beytdə punktasiya əməliyyatı aparmalı olur /durğu işarələrinin yerini və növünü müəyyənləşdirir/. Əks təqdirdə, əvvəlki nəşrlərin bu kontekstində Məcnuna ümumiləşdirici "əbri-bəla" /bəla buludu/ adı verilməsi nə bədii məntiq, nə də sintaktik cəhətdən əsaslandırılmış olardı. Həmin parçanın nəsr variantı isə belədir: "Göz yaşını tökdüyü hər səhra daşı lə'lə çevrildi. Gözünün yaşını hansı tərəfə tökdüsə, min arx axdı. Bir bəla buludu idi, şahidi olan göz yaşları - yağış, ahı - şimşək idi". Başqa bir parçaya diqqət edək: "Peykan zireh içrə oldu peyvənd, Gül şaxələrində qönçəmanənd. Əlqissə, xilafi -rəzmi - əvvəl Ə'daye müzəffər oldu Novfəl. Xəsm etdi qəbul hökmi - taət, Başlandı təzərröü şəfaət". Bu misralarda döyüş səhnəsinin obrazlı təsvirini, Novfəlin qələbə çalmasını, düşmən üzərində hökmünü və rəqibin aman e'tiraflarını da oxucu ancaq nəsr variantını oxuduqdan sonra bütün dolğunluğu ilə qavraya bilir: "Oxlar zirehlərə sancıldı - elə bil gül budaqları qönçə bağlamışdı. Qısası, əvvəlki vuruşdan fərqli, Novfəl qalib çıxdı. Düşmən itaət hökmünü qəbul etdi, aman istədi".

Şübhəsiz, klassik poetik dili çağdaş nəsr dili ilə sadələşdirmək ancaq ilkin "manee"ni dəf etmək - mə'nanı kommunikativ - informativ planda aydınlaşdırmaq deməkdir. Çünki, bu əsərin də müxtəlif məqamlarında gördüyümüz kimi, cümlə kontekstində Füzuli sözünün cilvənənən neçə - neçə mə'na çaları labüd olaraq kölgədə qalır, poetik siqlətin obyektiv dəyəri daha geniş və dərin şərhlər tələb edir. Məsələn, burada "Hər ərsədə hər əsər ki, gördüm, Sənsən deyib ol əsər yügürdüm"- beyti nəsrlə "Harada bir əsər gördüm, "sənsən" deyə ona tərəf yüyürdüm" kimi verilərək xeyli bəsitləşdirilmişdir. Beytin orijinalında müstəsna bədii ahəngi tə'min edən təkrir, assonans, alliterasiya hadisələrinin, ərəb hərfləri simasında görmə, eşitmə duyğusu ilə aşılanmış gözəl qafiyənin itkisini təbii hesab etsək də, həmin təbii itki" ilə eyni vaxtda yoxa çıxan "qeyri-təbii" itgiyə artıq bəraət vermək mümkün deyildir: sətrə çevrilən birinci misrada "ərs" sözünün "sahə,dünya" kimi mə'naları, "əsər" sözünün "nişanə; əlamət", ikincidə isə həm də "xəlq olunmuş, yaradılmış hər

hansı şey /predmet/", mə'nasında olduğu nəzərdən qaçır və beləliklə, "Allahın bütün "dünyalarında", hər sahədə, hər yerdə və hər şeydə təcəssüm tapdığı" fikri şərhdən kənarda qalır...

Ümumiyyətlə,bədii mətndən yayılan informasiya heç zaman necə var elə,dəyişməz şəkildə qalmır. Bədii mə'nanın tam həcmini nə təhlildə mütləq elmi düstura çevirmək mümkündür, nə də təfsirdə dəqiq ekvivalentə. Füzulidə bədiiliyin enerjisi ən azı dörd qata nüfuz edir və onun axını bir tərəfə yox, dörd tərəfə yön alır.Burada artıq "Leyli və Məcnun"un bu vaxta qədər yazıldığı üç əlifbaya dördüncü əlifba - kod, not və morze əlifbası da əlavə edilir və hətta ayrıcı dalğa lokatoru da dövriyyəyə daxil olur. Belə ki, püxtə təfsirçi əvvəlcə mətndən, sözdən yayılan informasiyanın kodunu müəyyənləşdirir və yalnız bu zaman mavi sonsuza - efirə səpələnən bədii informasiyanı nisbətən səhvsiz, dəqiq ədəbi dalğada tuta bilir. Yuxarıdakı nümunə də göstərir ki, Füzuli mətnində sənətkarlığın, obrazlılığın kodunu tapmaq imkansızdır, amma informasiyanın kod sistemini müəyyənləşdirmək və Füzulini başa düşmək üçün əməldə, işdə rəhbər tutmaq mümküdür və zəruridir.

Lakin bu heç də hələ hamısı deyil. Füzulinin "Leyli və Məcnun"unun mətni düz beş əsrdir ki, Füzulisiz yaşayır. Yuxarıda sözü gedən bədii kodların həyatdakı əsasını bu beş yüz ildə kəsb etdiyi əlavə normativ yük, izafi bədii enerji də məhz ilkin mayaya "əlavə gəlir", "əlavə bədii qazanc" kimi daimi, fasiləsiz artan yatırım qatlarını təşkil edir və çağdaş təfsirdə və təhlildə mütləq əks olunmasını labüdlüyə çevirir /Füzuliyə Füzuli müasirlərinin - Əhdi Bağdadinin verdiyi təfsirlə Nürəddin Rzanın verdiyi təfsir arasındakı fərqdə əslində elə bundan ibarət olmalıdır/. Yoxsa, lüğəvi, hərfi informasiya ilə kodlaşmış informasiya arasında fərq təkcə bədiilik yox, üstəlik, tarixilik baxımdan da sıfıra bərabər olardı. Axı biz Füzuliyə təkrar - təkrar bir də ona görə qayıdırıq ki, təkcə Füzulini yox, həm də "mən"imizi, Füzuli modelində dünyanın özünü, onun indisini və Füzulidən bizə qədərki beş yüz ilini "oxuyaq" və dərk edək.

Nəhayət, bütün bunlar gəlib son, yekun fərqində öz ifadəsini tapır: bu vaxta qədər bizimlə birbaşa danışmış və bundan sonra bizimlə həm də Nürəddin Rza vasitəsilə danışmağa başlayacaq iki Füzuli arasındakı fərqdə! Xoşbəxtlikdən, səhifələrdə mətnlər yanbayandır, yuxarıda gətirdiyimiz nümunələrdə eyniyyəti və müxtəlifliyi üzə çıxarıb fərqinə varmaqda biz çətinlik çəkmədik və yəqin ki, oxucu da çətinlik çəkməyəcəkdir.

Füzuli dili üzərində mətn əməliyyatını yalnız beyində və ürəkdə cərrahiyyə əməliyyatı ilə müqayisə etmək olar; ən xırda bir zədədən nəbz /nəfəs/ dəyişər və ruh məhv ola bilər. Söz milli poeziyanın beynindən və ürəyindən gedəndə isə cavabdehlik birə yüz qat da artır. Elə ona görə də həkim Nürəddin Rza öz cərrah bıçağını - skalpeli - Füzuli ruhunun bətni olan "Leyli və Məcnun"un mətnində müstəsna həssaslıq və ehtiyatla işlədir. Ən müasir təbii və elmi avadanlığın rentgen işığına Füzuliyə olan müqəddəs eşqinin, düz yarım əsrlik ilahi pərəstişinin də işığını əlavə edir. Əsil Füzuli məhz belə bir sehrli rentgendə - bir alimin ürəyindən, bir də kosmosdan gələn etik və fəlsəfi, ilahi və ruhani işıqda, şüada görünə bilir.

Nəzərə alsaq ki, "Leyli və Məcnun"da Füzuli Məcnunu nəzmə çəkməmiş, "nəzmi məcnunlaşdırmışdır" /M.Ə.Rəsulzadə/ və məcnunlaşan şe'rin də işığının, ilahi işıq kimi, bir yox, yeddi rəngi var, onda təsəvvür etmək olar ki, təfsirçi həkim yeri gəldikcə təkcə şair yox, həm də rəssam missiyası ilə qarşılaşmış, boya və fırça vəzifələrini də həll etməli olmuşdur.

Gördüyümüz kimi, vəzifənin dərkinin dərinliyi onun həlli üçün aradan qaldırılması zəruri olan "düşvar"ın çətinliyini şərtləndirmişdir. Odur ki, həm özünə, həm də ilahi sözün gücünə inanmış bu dəfə artıq Füzuli yox, ... Nürəddin Rza e'tiraf və təkrar etməli olmuşdur:

*Məndə tövfiq olsa bu düşvarı asan eylərəm,*
*Novbahar olacaq tikəndən bərgi - gül izhar olur.*

Şübhəsiz, indi təfsirçi də, redaktor da bərk narahat və nigarandır: görəsən, "novbahar olacaq" və "tikəndən bərgi - gül izhar olacaqmı?" Şübhəsiz, bu suala qəti cavabı təfsirin bundan sonra başlanacaq həyatı və oxucu özü verəcəkdir.

Hələlik isə ilk oxucu təəssüratı kimi biz bir daha e'tiraf və təsdiq edirik: Bütünlükdə bu kitabda və onun hər səhifəsində bir yox, iki "Leyli və Məcnun" var, onlardan birinin mətni - Füzulinin, digərinki isə həm də Nürəddin Rzanındır. Əbədi dahiyə növbəti həmmüəllif və tərəfi-müqabil olmağa təfsirçi - həkim çox böyük ümidlə, inamla cəsarət etmiş və bu cəsarətdən yeni, maraqlı, mənsur bir "Leyli və Məcnun" doğulmuşdur.

Əlbəttə, mənsur "Leyli və Məcnun"ların əsas ədəbi, funksional vəzifəsi həmişə eyni olmuşdur: bələdçi olmaq, əsl "Leyli və Məcnun"un natural mətnini çağdaş oxucuya nisbətən daha tam və bütöv şəkildə çatdırmaq!

İ s t i s n a s ı z, hər hansı şərhin mə'nası, rolu da onun orijinalla bir yerdə, bir bütövdə olmasındadır. Bu istiqamətdə tədqiq və təfsir təcrübəsi əvvəllər də olmuş, gələcəkdə də hələ çox olacaqdır. Məqsəd tanrımızın, "mən"imizin və dünyamızın dərkində bizdən həmişə daha ucada olan Füzuliyə daha çox yaxınlaşmaq və sonsuzluğa, gələcəyə doğru bu fasiləsiz səfərdə onunla əbədi yol yoldaşı olmaqdır. Hər yeni nəslin bu məqsədə çata bilməsi üçün hər yeni alim və ədib gücü çatdığı qədər iş görür və dəryaya damla əlavə edir. Bu mə'nada təfsirin müəllifi də kitabın redaktoruna məxsus bu poetik və müdrik sözləri eyni məhəbbət və səmimiyyətlə təkrar edə bilər: "Füzuli dəryadır! Bu təfsirin müəllifi də bu dəryadan ovçu tutduğu qədər götürmüşdür"...

*Yaşar Qarayev*

## FÜZULİNİN "LEYLI VƏ MƏCNUN"UNU MÜASİR AZƏRBAYCAN DİLİNDƏ(NƏSRLƏ) IŞLƏMİŞ "MÜƏLLİIFDƏN".

*Əziz oxucum! 10 ildir ki, bir kitabın əsiriyəm - dahi Füzulinin "Leyli və Məcnun"unun. Füzulinin böyüklüyünə uşaqlıqdan olmasa da, gənclik illərimdən guya bələd idim. Bir neçə qəzəlini oxumuşdum, məktəbdə onun həyatı və əsərləri ilə tanış olmuşdum. Hətta gənclik illərində "Leyli və Məcnun"u da oxumuşdum. Boynuma alım ki, əsas və daha sanballı "Leyli və Məcnun"um Nizaminin əsəri idi. Ümumiyyətlə, mənim ömrümün birinci yarısında Azərbaycan ədəbiyyatının ən qüdrətli siması Nizami idi. Füzuli barədə o zamankı gənc nəslin təsəvvürü nisbətən səthi idi. "Leyli və Məcnun" operası barədə bilirdim və bir neçə dəfə dinləmişdim. Ancaq ön cərgədə Üzeyir Hacıbəyovun heyranedici musiqisi və ifaçıların oxumaq məharəti və şöhrəti dayanırdı. Əlbəttə, öz nəslimdən danışıram. 60-cı illərin ortalarından böyük şairimiz Bəxtiyarla və görkəmli alimimiz Xudu ilə oturub-durandan sonra Füzulinin əsl qiymətini duymağa başladım. Əslində, Füzulinin böyüklüyünə onun əsərlərini oxumaqdan çox onun barəsində eşitdiklərimə görə inanmışdım. Ən sevdiyim şe'ri "Şəbi Hicran" və "Leyli və Məcnun" poemasına daxil olan qəzəllərin (anlaya bildiyim) bir neçəsiydi. Mən, təəssüf ki, qalanlarını tam duya və anlaya bilmirdim. Ancaq ayrı-ayrı qəzəl misralarındakı gözəllik və dərinlik o qədər güclü idi ki, onu dahi saymağa kifayət edirdi.*

*Bir dəfə 1982-83-cü illərdə Xudu mənə bir qalın dəftər göstərib dedi ki, "Bu, ağdamlı bir gəncin Füzulinin "Leyli və Məcnun"unun müasir Azərbaycancaya tərcüməsidir. Gəl oxuyaq, görək nə yazır". Sevindik. Amma yazı bizi qane eləmədi. Füzuli yox idi, şe'r də. Bu yazı ilə tanışlıq bizi çox narahat etdi. Xudu təklif etdi ki, Füzulinin "Leyli və Məcnun"unu birlikdə oxuyaq. Oxuduq. Çox şeyi başa düşmədik. Sözlərin, metaforların, şərq üslubu ilə deyilmiş ədəbi, məcazi mə'nalı ifadələrin bir çoxunu istədiyimiz kimi duya və anlaya bilmədik. Tədricən qərara gəldik ki, biz Füzulinin "Leyli və Məcnun"unu tam duyub anlamaq dərəcəsində öyrənməliyik. Azacıq sonra Xudu qətiyyətlə bildirdi ki, mən "Leyli və Məcnun"u sözbəsöz, sətirbəsətir nəsrləşdirməliyəm. Dedim ki, bacarmaram. Mən nə yazıçı, nə şairəm. Zarafata salıb, cavab verdi ki, "əybi yoxdur, sən başla, görərlər ki, bacarmamısan, bacaranlar bu vacib işə qoşularlar".*

*Dünya ədəbiyyatının ən gözəl nümunələrindən az-çox xəbərdar olduğuma baxmayaraq yeni bir dünyaya düşdüm. Gənclikdə, romantik hisslərin daha itiliyi dövründə bu bəlkə də təəccüblü olmazdı. 50 yaşı ötəndən sonra bir kitaba belə heyranlıq çoxları üçün anlaşılmaz görünər. Ancaq bu belədir. Beş yüz il bundan əvvəl mənim ana dilimdə böyük, möhtəşəm türk dilinin bugünkü Azərbaycan türkcəsinin sözləri, deyimləri, cümlə quruluşu nümunələri ilə zəngin bir dildə, yazılmış elə bir əsər oxudum ki, klassik və müasir romantik ədəbiyyatın ən gözəl nümunələri piramidasının zirvəsində yer tutmağa layiqdir. Bu qədər zərifliyi, duzlu şirinliyi, metafora, bənzətmə zənginliyini, rəngarəng, gözlənilməz, heç kəsdə rast gəlmədiyim yeni bədii deyimləri bir əsərdə tapmaq məni heyrətləndirdi. Axı bu mənim son 25-30 ildə çox diqqətlə seçib oxuduğum ədəbi əsərlərlə tanışlıqdan sonra idi. Mən bir şeyə yandım: - yazıqlar olsun o əsl kitabsevərlər və bədii söz vurğunlarına ki, onlar nə səbəbdənsə Füzulinin "Leyli və Məcnun"unu oxumayıblar, ya da mənim kimi ilk tanışlıqdan onun qiymətini verə bilməyiblər! Təvazökarlıqdan kənar da olsa, mənə elə gəlir ki, Azərbaycan türkcəsində və rus dilində, Türkiyə, türkmən və özbək türkcələrində bədii ədəbiyyatı demək olar ki, eyni səviyyədə duyub və anlayıram. Bəlkə ona görə də bu dillərdən tərcümələri demək olar ki, daha oxumuram. Çingiz Aytmatov müstəsnadır. Qırqız türkcəsini çətin anlayıram. Onun rus dilindəki əsərlərini oxuyanda mən dili yaddan çıxarıram və inanıram ki, dilin canından başqa ruhu da var imiş. Düzünü deyim, bu daha çox nəsrə aiddir. Şe'rdə dilin canı ilə ruhu elə bağlıdır ki, ayırmaq çox çətin olur. Mən Füzulinin, Nizaminin, Əmir Xosrov Dəhləvinin və Nəvainin "Leyli və Məcnun" əsərlərini müqayisə etmək üçün dördünü də eyni bir şərq poeziyası bilicisi və tərcümanının - şair Starostinin tərcüməsində (sətri tərcümə Rüstəm Əliyevin idi) oxudum və bir daha inandım ki: - birinci - ən gözəl tərcümə belə orijinalı əvəz edə bilmir; ikinci - tərcüməçilər (sətri*

*və poetik) və dil eynidirsə tərcümə olunmuş əsərləri də müqayisə etmək mümkündür. Mən həmin üsulla tərcümədən oxuduğum Nizamini yenidən eyni tərcüməçidən oxuduğum başqa fars dilli klassiklərlə müqayisə etdim və Nizaminin türk ruhunu böyük sevinclə duya bildim.*

*Burada klassik şərq poeziyasının ən möhtəşəm dünya şöhrətli yaradıcılarının: Firdovsinin, Nizaminin, Sə'dinin, Hafizin, Füzulinin və bir çox başqalarının əsərlərinin ən e'tibarlı əlyazmalarının elmi tənqidi, təhlili əsasında dəqiqləşdirilmiş mətnlərini hazırlamış və onların farscadan ruscaya sətri tərcüməsini eləmiş dünya şöhrətli şərqşünas, professor Rüstəm Əliyevin son dərəcədə böyük, uğurlu zəhmətini xüsusi qeyd eləməliyəm. Füzuli "Leyli və Məcnun"unun Rüstəm Əliyevin elədiyi sətri tərcümə əsasında Starostinin poetik tərcüməsini oxuyub anlamağa başlayıb orijinalla müqayisə etdikdə başa düşdüm ki, bu gözəl poetik tərcüməni şair Starostin R. Əliyevin, bizcə, son dərəcədə dəqiq və gözəl sətri tərcüməsinin sayəsində yarada bilmişdir. Mən R. Əliyevin köməyi və rəhbərliyi ilə öz nəsr variantımı son dəfə işləyəndə bu həqiqəti varlığımla anladım.*

*Bir sözlə, Füzuli şe'rinin əsrarəngiz gözəlliyinə həm oxuduğum orijinalına, həm Nizami, Nəvai, Dəhləvidən rus dilinə sətri və poetik tərcümələrinin müqayisəsinə görə Füzuli "Leyli və Məcnun"un bütün mənə mə'lum olan "Leyli və Məcnun"ların ən gözəli olduğuna ürəkdən inandım və qəti şübhəm qalmadı.*

*Elə buna görə də, Füzuli "Leyli və Məcnun"unu oxusa da onu öz dəyərinə layiq duyub anlaya bilməmiş yüz minlərlə Azərbaycan oxucusuna, dəyərinə daha yaxın səviyyədə çatdırmaqda yardım məqsədilə bu çətin işə girişdim. Füzuli "Leyli və Məcnun"unu bilik və bacarığım səviyyəsində nəsrləşdirməyə çalışdım.*

*Füzulini indiyə qədər tamlığı ilə duyub anlaya bilməmiş oxucularımı təqsirləndirmirəm, çünki mən özüm də bu işə başlayana qədər onların sırasındaydım.*

*Mütəxəssislərdən və Füzulini yardımsız anlamaq, duymaq imkanları olan xoşbəxt oxuculardan yazımda mütləq tapa biləcəkləri nöqsanlar üçün üzr istəyirəm. Axı əslində bu iş onlar üçün görülməyib. İndiyə qədər bu işi bizlər, sıravi oxucular üçün görə bilən, lakin görməmiş müəllimlərimizə də Allah insaf versin.*

*1958-ci ildə akademik H. Araslının redaktorluğu ilə nəşr olunmuş nüsxəni bir daha vərəqlədim, oradan-burdan oxudum, özümün savadsızlığıma məəttəl qaldım. Hələ bir çoxları məni ədəbiyyat, şe'r həvəskarı kimi qələmə verirdilər. Bəs görəsən başqaları, mənim tay-tuşlarım necədir? Mə'lum oldu ki, tam azlıq təşkil edən yaşlı, hətta qocalmaqda olan nəslin türkcə, ərəbcə, farsca az-çox savadlı nümayəndələrindən, ədəbiyyatçı mütəxəssislərdən və əsasən Abşeron kəndlərində yaşayan bə'zi qəzəl həvəskarlarından başqa hamı ən azı mənim günümdədir, məndən aşağıları da çoxdur. Deməli, müasir oxucularımızın tam əksəriyyəti Füzulinin böyüklüyünü qəbul edir, onunla fəxr eləyirmiş, amma onun tam dəyərindən, əsl böyüklüyündən lazımınca xəbərləri yoxmuş.*

*İşi ilk variantda başa vurandan sonra mə'lum oldu ki, poemanın 1958-ci il nəşrində təxminən ümumi həcmin 5 faizi qədəri ixtisar edilmişdir. İxtisar olunanların bir hissəsi ərəbcə (ya farsca) imiş. Elə o vaxt yaxın dostum, professor Rüstəm Əliyevə müraciət etmək qərarına gəldim. Rüstəm məni alqışladı, ərəb və fars dilli parçaların Azərbaycan türkcəsində sətri tərcüməsini elədi və bundan başqa hazırladığım 250 makina səhifəsi həcmində nəsrləşdirilmiş mətni mənimlə bərabər başdan-ayağa oxudu və xeyli düzəlişlər və dəqiqləşdirmələr verdi. Mətn tam hazır oldu. Xudu oxudu, məni təbrik elədi və dedi ki, bugünkü nəslimiz üçün bu iş maraqlı və gərəkli olacaq. Artıq 1988-ci il idi. Qarabağ münaqişəsi başladı. Mən qohum, dost və yoldaşlarımın tə'kidinə baxmayaraq kitabı tamamlamadım. Rüstəm Əliyev izahlar və ön söz yazmaq və'd etmişdi. Onun da dalınca gedə bilmədim. Bir sözlə kitabı nəşrə vermədim. Ölkənin bu vaxtında belə bir işlə məşğul olduğumun düzgün qəbul edilməyəcəyi məni qorxutdu. 1992-ci ildə xəbər tutdum ki, 1991-ci ildə Sabir Əliyev (kitabda müəllif barədə heç bir mə'lumat yoxdur) mənim görməkdə olduğum işi görüb qurtarıb və nəşrə verib. Sevindim. Deməli, bu işin görülməsinin vacibliyi barədə Xudu ilə gəldiyimiz fikir doğru imiş. Biz tək deyilmişik. Kitabı diqqətlə oxudum və gördüm ki, bir qəsidədən başqa mətn tam əhatə*



*olunub, qəzəllərinsə orijinalı da, nəsrləşmiş variantı da verilib. Təəssüf ki, izahlar çox azdır. Sabir Əliyevin nəsrləşdirdiyi variant oxucular üçün şübhəsiz böyük töhfədir.*

*Ancaq Sabir Əliyevin nesrlə çevirməsi bizimkindən müəyyən dərəcədə fərqlənir. Başqa cür də ola bilməz. Anlaşılmaz ərəb və fars sözləri əvəz edilərkən işlədilə biləcək qarşılıqlar müxtəlif ola bilər və cümlə quruluşları da fərqlənə bilər. Bə'zi yerlərdə mə'nanı təhrif edən səhvlər də gözümüzə dəydi.*

*Sabir Əliyevin kitabında bir çox ərəb və fars sözləri olduğu kimi saxlanılıb, ya da səhifənin altında qeydlər şəklində mə'naları gətirilib. Bizim variantımızda imkan daxilində belə sözlərin miqdarı xeyli azaldılmış, yə'ni ancaq mə'nası hamıya mə'lum yad dilli sözləri müasir Azərbaycan türkcəsinə aid sözlərlə əvəz etməmişik.*

*Bizim və Sabir Əliyevin nəsrləşdirmə variantlarının ən böyük fərqi ondadır ki, biz səhifənin bir hissəsində orijinalı olduğu kimi ikinci yarısında nəsrləşmiş variantı veririk. Bizim variantda Məsnəvi cümlələrinin və nəsr cümlələrinin nömrələnməsi hansı misranın qarşılığının hansı nəsr parçası olduğunu seçmək imkanı verir. Beləliklə, nəsr variantı ilə yanaşı oxucu eyni bir vaxtda Füzulinin özünü oxuyub onun üslub gözəlliyini, qafiyə seçməsini, şe'rin səs və ahəngini və musiqisini duya biləcək.*

*Mən anladım ki, bu, çox cəhətdən çətin məsələnin ən çətini dil məsələsidir. 450 il bundan öncə Füzulinin yazıb bitirdiyi "Leyli və Məcnun"un dili bugünkü Azərbaycan türkcəsindən xeyli fərqlənir. Dil-Azərbaycan türkcəsidir, buna şübhə yoxdur. Minlərlə söz, yüzlərlə misra, tam bugünkü şəkildə və mə'nada işlənilib. Bu nə Anadolu, nə özbək, nə türkmən, nə qazax türkcəsi deyil. Bu gün də Güney Azərbaycanda, İraqda yaşayan milyonlarla azəri türkü bu dili bizdən daha asan başa düşürlər, bəs bizə nə olub? Biz dilimizi yad ərəb-fars sözlərindən təmizləyəndə, ilk dəfə ərəb əlifbamızı latın əlifbasına, daha sonra bir neçə variantda kiril əlifbasına dəyişəndə, Anadolu türkləri də daxil olmaqla bütün türk xalqları bu işi gördülər.*

*İnsaf xatirinə deməliyik ki, Anadolu türkləri latına sonuncu olaraq, bizə çatmaq üçün keçdilər. Xoşbəxtlikdən kirilə keçmədilər. Əsrin əvvəlində ortaya çıxan "Tərcüman" və Tiflisdə çıxan "Molla Nəsrəddin"i hamılıqla oxuyub başa düşən Anadolu, İran, İraq, Azərbaycan, Ural, Orta Asiya türkləri əsrin ortasında bu sahədə o qədər "inkişaf" etdilər ki, nə bir-birilərinin kitab, qəzet, jurnallarını oxuya bildi, nə də başa düşə bildilər. Keçmiş Sovet türkləri bir-biriylə rusca yazışıb-danışmağa başladılar.*

*Böyük qardaşımız, sovet türklərinin əlifbalarını mərhələlərlə, bir-birindən fərqləndirmək şərtilə dəyişdirəndə qarşısına qoyduğu məqsədə nail oldu! O, türk dünyasının SSRİ hissəsini həm mə'nəvi, həm də geopolitik cəhətdən parçaladı. Son 70 ildə türk dünyası Türkiyəni çıxmaq şərtilə altı "müstəqil" ittifaq respublikasına, bir neçə "muxtar" nahiyəyə parçalandı. Türk millətinin yerində "türk dilli xalqlar yarandı" Ermənilər, farslar və ruslara da bu lazım idi. Bugünkü real şəraitimizdə kirildən latına qayıtmaqda mə'na vardır. 70 il öncə ərəb əlifbasından latına keçərkən qazandığımız, xalqın olmazın sür'ətlə daha asan savadsızlığını ləğv eləməsi və bugünkü elmdə, texnikada əldə etdiyimiz danılmaz nailiyyətlər oldu. Ancaq mə'nəviyyatın əsası olan dildə və ədəbiyyatda hamılıqla çox şey itirdiyimizə artıq heç kəsin şübhəsi qalmadı. Görünür ki,biz inqilabdan önceki böyük qardaşımızın təhsil yolunu tutmalı imişik. Təhsil sistemimiz, sovet sosialist ideologiyamız və tərbiyəmiz, ömür payımıza düşən mə'nəvi mühit mənim və müasirlərimin əksəriyyətinin milli ruh səviyyəsini izn verilmiş dərəcədən yuxarı qalxmağa qoymayıb. Bu hadisə təsadüfi olmayıb və təkcə bizim problemimiz deyil, öz oraq-çəkicli qırmızı bayrağının tezliklə, hətta yaşadığımız əsrdə az qala bütün yer kürəsinin üzərində dalğalanacağına bizi inandırmağa çalışan kommunist dünyasının, SSRİ-nin başçılığı ilə yeridilən siyasətin nəticəsiydi. Beynəlmiləlçilik (oxu ruslaşmaq) şərəf və mədəniyyət, millilik isə "millətçilik", "gerilik", "məhdudluq" hesab edilirdi. Söz bir idi, əməl başqa. Desək ki, bu 70 və ya 170 ildə yerimizdə saymışıq, bu yalan olar. Axundovun, Zərdabinin, Sabirin, Üzeyir bəyin, Mirzə Cəlilin, Cabbarlının, Vurğunun və onlarca ölməz sənətkar və alim*

*ədəbiyyatşünaslarımızın ruhu bizdən inciyər. Ancaq həqiqət həqiqətdir. Ona göz yumulmaz. Bütöv bir nəsl - bizlər Şekspiri, Hüqonu, Höteni, Tolstoyu, Çexovu, Puşkini daha yaxşı tanıyıb, daha çox oxumuşuq. Mən istərdim bu bağışlanılmaz qüsur mənə və azlığa aid olsun. Təəssüf ki, belə deyil, əksəriyyətə aiddir. Çar Rusiyasının gimnaziyalarını bitirənlər rus dilindən başqa ən azı 3 dili tam öyrənirdilər: latın, yunan, fransız və ya alman dillərini. Deməli orta məktəbdə 3-4 dil öyrənməyin mümkünlüyü və faydalılığı sübut tələb eləmir. Bizim bugünkü Azərbaycanda da son illərdə Azərbaycan, rus, ingilis dilləri ilə yanaşı ərəb və ya fars dillərini də və təbii ki, ərəb əlifbasını da öyrənənlər, bilənlər az deyil.*

*Əfsus, biz gec ayılmışıq. Mən 60 yaşıma yaxın 7-8 il bundan qabaq anladım ki, biz öz mə'nəvi keçmişimizdən xeyli uzaq düşmüşük. 1000 illik ədəbiyyatımız, dilimiz və tariximizlə, aramızda asanlıqla keçilməyən bir əlifba və dil səddi yarandığı göz qabağındadır. Latın əlifbası, ingilis dili və hələlik rus dili də bizi dünyaya və gələcəyimizə gedən yola bağladığı kimi, keçmişimiz, bizi ərəb əlifbasını bilməyimizə və dilimizdə əsrlərdən bəri vətəndaşlıq hüququ qazanmış ərəb və fars mənşəli sözlərə münasibətimizi bir qədər dəyişməyə çağırır. Bu gün Nizami, Füzuli, Nəsimi və yüzlərcə şairin, ədibin tarixçinin əsrlərlə yaratdığı mə'nəvi xəzinənin açarını itirməyə haqqımız yoxdur. Elmi-texniki tərəqqi mə'nəvi tərəqqinin hamısı yox, vacib bir hissəsidir. İkinci hissənin əhəmiyyəti heç də az deyil. Son 8 ildə xalqımızın yaşadığı faciə mə'nəvi dəyərləri itirmək təhlükəsinin əhəmiyyətini bir daha göstərdi. Latından ərəb əlifbasına qayıtmaq mümkün də deyil, lazım da deyil. Ancaq Latınla yanaşı ərəb əlifbasını da orta təhsil proqramına salmaq məsələsi görünür ki, bir daha dərindən düşünülüb-daşınılmalıdır. Rus şovinizmindən avropasentrizm bataqlığına yuvarlanmaq qorxusu realdır. Keçmişi Avropadan qat-qat zəngin olmuş klassik şərq mədəniyyəti ilə əlaqələrimizi kəsə bilmərik və kəsməli deyilik. Milləti millət eyləyən dil, tarix və mə'nəviyyatın xəzinəsi və təməli olan ədəbiyyatdır. Elmin ayrı-ayrı sahələri, ayrı-ayrı fərdlərin problemidir, dil ədəbiyat tarix isə hamımızın. Füzulinin bu ölməz, şah əsərini gənclərimizin bugünkü Azərbaycan dilində oxuyub anlamalarını bir qədər asanlaşdırmağın vacibliyi məhz buna görə məni də çoxları kimi dərin qayğılandırdı. Çox arzu edərdim ki, Füzulinin və Nəsiminin ərəb və fars divanlarına, ərəb və fars sözlərindən geniş istifadə ilə yazılmış yüzlərlə, minlərlə ədəbi, tarixi və elmi ədəbiyyata münasibət dəyişsin. Unutmaq olmaz ki, bu gün türk dünyasına daxil olan ölkələrin kitabxanalarında, ədəbiyyat və tarix arxivlərində yüz minlərlə əvəz olunmaz dəyərli əlyazma əsərləri dil və əlifba səddi ucundan yatıb qalır, öz oxucusunu gözləyir. Biz "türk dilli xalqlar" isə hələlik bizim varlığımızı danmaq üçün var gücləri ilə çalışan "əziz" qonşularımızın yaratdığı əsasən antitürk, avropasentrik mənbələrə əsasən keçmişimizi öyrənməyə çalışırıq. Meyvələr göz qabağındadır. Avropasentrizmi, yeni xaç müharibələrini, panslavyanizmi heç kəs görmür. Dünyaya təhlükə təkcə "pantürkizm" və "islam fundamentalizmində" görülür!*

*Azərbaycan Elmlər Akademiyasının son dərəcədə zəngin əlyazmaları institutuna Füzulinin adının verilməsinə təkcə şərəf məsələsi kimi deyil, mədəni inkişafımızın konsepsiyasının vacib tərkib hissəsi kimi baxmaq lazımdır. Mən əminəm ki, ədəbiyyatçılarımız, dilçilərimiz bu nəşrdə mənim ağır və çox illik zəhmətimin nəticələrində qüsurlar və nöqsanlar tapacaqlar. Başqa cür ola da bilməz. Bu problem ədəbiyyat sevən həkimin yox, ədiblərimizin və tarixçilərimizin problemi olmalıdır. Keçmişimiz gələcəyimizə qaytarılmalıdır.*

*Oxucuya müraciətimizə yekun vuraraq deyə bilərik ki, Azərbaycan nəşriyyatlarının buraxdığı kitabların heç birində bizim yazıda olduğu kimi sətirbəsətir müasir dildə paralel sinxron yazılmağa cəhd edilmiş "Leyli və Məcnun" mətni yoxdur. Kitabların bir hissəsində verilmiş ərəb, fars sözləri lüğətləri "qeydlər" və "izahlar" əsəri rahat, duya-duya, qana-qana oxumaq imkanı vermir. Oxucuların böyük çoxluğu ya əsəri axıracan oxumur, ya da kifayət qədər anlayıb, duyub qiymətləndirə bilmir. Mən öz şəxsi təcrübəmdə, onlarca oxucuda apardığım yoxlamalarda buna inandım.*

Sabir Əliyevin kitabının başlıca çatışmazlığı ondadır ki, orada Füzuli mətni yoxdur. Müasir dildə verilmiş nəsr mətni Füzuli sənətinin ağlasığmaz böyüklüyü, şe'riyyətin zərifliyi, şirinliyi barədə tam təsəvvür yarada bilmir. Bununla belə Füzulini oxucuya çatdırmaqda çox uğurlu addımdır və təqdirə layiqdir. Hüseyninin kitabında (Ankara, İstanbul, 1980-ci illərin sonu) "Leyli Məcnun"un orijinal mətni ilə yanaşı "yeni türkcə" (Türkiyədə rəsmi ədəbi və elmi əsərlərin təmiz türkləşdirilmiş dili) nəşrində nəsr mətnini anlamaq orijinalı anlamaqdan xeyli çətindir və Füzuli bədii sözünün möhtəşəmliyi və gözəlliyi tə'sirini yaratmır. Bizim variantda məqsəd oxucuya Füzuli "Leyli Məcnun"unu özünün oxuyub və duymasında real yardımdır. Qoşa səhifədə qarşı-qarşıya yerləşdirilmiş nəömrələnmiş 3-4 beytdən ibarət şe'r cümlələrinin nəsrlə, imkan daxilində Füzulinin öz incəliklərini, təşbehlərini, təkrirlərini, simvollarını, məcazi mə'nalarını saxlamaqla oxucuya çatdırılmasına çalışılmışdır. Əsərin orijinal mətni akad. N.Araslının redaktorluğu ilə hazırlanmış beş cildlik nəşrə görə vnrilmişdir.

Oxucularımızdan, birinci növbədə ədəbiyyatçılarımızdan, dilçilərimizdən və bütün Füzulisevərlərdən yazılarımızda şübhəsiz tapılacaq nöqsanları bizim mütəxəssis olmadığımızı nəzərə alıb bağışlamalarını xahiş edirik.

Bütün yazılı və şifahi iradlar minnətdarlıqla qəbul ediləcək. Kitabın ilkin elmi redaktoru əziz dostum, böyük alimimiz Rüstəm Əliyevi bir daha dərin minnətdarlıqla yad edirəm və mərhumun ömür və əməl dostu Ruqiyyə xanım Qəmbər qızının bu işdə alim kimi fəal iştirakını xüsusi qeyd etmək istəyirəm. Kitabın nəşrində mənə əvəz edilməz mə'nəvi dayaq olmuş "Azərbaycan" özəl universitetinin rektoru, prof. fəlsəfə elmləri doktoru Səlahəddin Xəlilova təşəkkür edirəm.

Kitabın yenidən işlənilmiş son variantının redaktoru Füzulişüna s alim, gözəl insan, professor Samət Əlizadəyə və qiymətli məsləhətlər vermiş həkimlikdə, ədəbiyyat və tarix həvəskarlığımda 30 illik məslək dostum böyük ziyalımız professor Cavad Hey'ətə minnətdarlığımı bildirirəm.

## DİBAÇƏ

İlahi, Leyliyi-sirri-həqiqət sərapərdəyi-vəhdətdən iqtizayi-zühur edib təcəlliyi-cəmalilə fəzayi-surəti müzəyyən etdikdə və Məcnun ruhi sərgəşteyi-badieyi-qəflətdə ikən ol şə'şəəyi-cəmalı görüb, inani-ixtiyarı əldən getdikdə əgər əlaqeyi-abayi-ülvi və rabiteyi-ümməhati-süfli ol ləzzəti-canfəzayə və məsərrəti-dilgüşayə vaqif olmayıb, firibi-məvaizgunə və hiyleyi-nəsaehnümunə ilə mühərriki-silsileyi-inqitai-peyvəndi-vüsal və müdəbbiri-vəsileyi-infisali-iqdi-ittisal olmaq etsələr, təvəqqə oldur ki, nə ol Leyliyi-aləmarayə bu təqrir rəf'i-Hicabi-cismaində movcibi-tə'xir ola və nə ol Məcnuni-cahanpeymayə bu təqdir nəfyi-təsəvvürati-nəfsanidə baisi-təqsir. Və əgər bəhaneyi-fəsanə ilə eşqi-həqiqi və hüsni-əzəlidən füzalayi-bəlaqətpişə və bülğayi-Fəsahətəndişə cəvahiri-əsrari rişteyi-nəzmə səkib səməreyi-iğmazı şəcəreyi-ibarətdən götürüb, niqabi-xəfa və hicabi-əna rəf' etmək istəsələr, tərəqqüb oldur, hüsni-müsaidəti-sübhani və lütfi-müavinəti rəbbani hüsuli-mərtəbeyi-vüsulə və hüzuri-dərəceyi-zühurə mümtədd olub, Leyliyi-təxəyyülati-xaslarına və Məcnuni-hüsn ixlaslarına ihanəti-təşnii-süfəhadən və zilləti-e'tirazi-büləhadən ki, itlaqi-təərrüzləri əş'arə və təsəvvüri-göftarə məsabeyi tə'ni-bihudeyi-Leyli və mənzileyi-mən'i-bifaideyi-Məcnundur, mümtəne-tə'sir ola.

Və əgər bu fəqiri-müstəham Füzuliyi-bisərəncam ğayəti-qilləti-bəzaət və nəhayəti-nəqsi-əmtəəyi-fəsahət ilə istid'ayi-indiraci-silki-ərbabi-həqayiq və təmənnayi-inxirati-silsileyi-əshabi-dəqayiq edib, xəzaneyi-hüsni-Leyli təsxirinə və xərabeyi-eşqi-Məcnun tə'mirinə azim olur. Tərəssüd oldur ki, ol tərzi xaməvü nəqşi-namə əhsən vəchilə müyəssər olub hekayəti-Leyli kimi aləmgir və möhnəti-Məcnun kimi bəqapəzir ola.

## DİBAÇƏ (müqəddimə)

İlahi, həqiqət sirri olan Leyli vəhdət pərdəsindən çıxıb camalının görünməsi ilə surət fəzasını bəzəyərkən və Məcnunun ruhu qəflət səhrasında sərgərdan gəzərkən onun işıqsaçan gözəlliyini görüb ixtiyarının cilovunu əlindən verərkən, uca göylərin ata istəyi və yerlərin ana məhəbbətindən dolayı onların can bəxş eləyən səadəti və ürəyini açan sevincini dərk etməyib, inandırma və hiylə cildinə salınmış, xeyirxah məsləhət donuna geydirilmiş aldatma ilə aralarındakı vüsalı qırmaq və onları birləşdirən zənciri parçalamaq istəsələr, təvəqqi odur ki, bu hekayəm dünyanın bəzəyi olan Leylinin üzündən pərdənin götürülməsinə və dünyada çaşqın gəzən Məcnunun ürəyində alçaq fikirlərin axtarılıb tapılmasına bais olmasın. Yox, əgər bu əfsanəni söyləmək bəhanəsi ilə kamil söz sərrafları və şirin dil ustaları həqiqi məhəbbəti və gözəlliyi göstərmək istəsələr, şe'rin sirli incilərini sapa düzmək, söz ağacından ağır zəhmətin zərif meyvələrini dərmək, gizlinin üzündən gözə görünməz pərdəni götürmək istəsələr, qoy onda allahın köməyi və tanrının rəhməti onlara bu vüsul dərəcəsinə çatmaqda və zühur, dərəcəsinə yetişməgdə, yəni, vəhdət məqamına və həqqin təzahürünə qədər bu işi xeyirlə başa vurmaqda yar olsun, seçilmiş arzuların təcəssümü Leylini və ali gözəlliyin misalı olan Məcnunu nifrətə layiq, alçaq adamlardan, şe'rə və zərif sözə böhtan atanlardan, anlamadan Leylini qınayanlardan, Məcnunu zülm ilə qovanlardan saxlasın.

Və əgər mən sayılmayan, biçarə, bədbəxt Füzuli, öz həddən artıq naqis fəsahətimlə, allahın bir neçə sevimlisi, incə söz sərrafı olan dostların xahişi ilə Leyli gözəlliyinin xəzinəsinə 'əl yetirə bilsəm və Məcnunun sevgisini xarabalıq içindən çıxarıb yenidən qura bilsəm, arzum budur ki, mənim qələmimin yazdıqları və kağız üzərinə köçürülmüş sözlərim insanların gözlərinə xoş görünsün, qoy bu kitab Leyli barədə hekayət kimi bütün dünyanı fəth etsin və Məcnunun möhnəti kimi əbədi olsun.

## RÜBAİLƏR

Ey nəş'əti-hüsni eşqə tə'sir qılan!
Eşqilə binayi-kövni tə'mir qılan!
Leyli səri-zülfünü girehgir qılan!
Məcnuni-həzin boynuna zəncir qılan!

Tutsam tələbi-həqiqətə rahi-məcaz,
Əfsanə bəhanəsilə ərz etsəm raz,
Leyli səbəbilə vəsfin etsəm ağaz,
Məcnun dili ilə etsəm izhari-niyaz.

Lütf ilə şəbi-ümidimi ruz eylə!
Iqbalımı tövfiq ilə firuz eylə!
Leyli kimi ləfzimi diləfruz eylə!
Məcnun kimi nəzmimi çigərsuz eylə!

## RÜBAİLƏR

Ey gözəlliyilə eşqə tə'sir eyləyən!
Eşqi ilə dünya binasını abad eyləyən!
Leylinin saçlarının qıvrımlarını,
Məcnunun qəmli boynuna zəncir eyləyən!

Gerçək axtarmaqda məcaz yolunu tutsam,
Əfsanə bəhanəsilə sirr açsam,
Leyli adıyla sənin tə'rifini dilə gətirsəm,
Məcnun dili ilə arzularımı söyləsəm;

Rəhm et, ümidimin gecəsini gündüzə çevir!
Taleyimi qüdrətinlə işıqlı et!
Leyli kimi sözlərimi ürək açan,
Məcnun kimi şe'rimi ciyər yandıran elə.

**BU HƏZRƏTİ-İZZƏTDƏN HƏMD İLƏ İSTİMDADİ-MƏTALİBDİR VƏ ASARİ-ŞÜKR İLƏ İSTİD'AYİ-SƏTRİ-LAİBDİR**

1. Əlhəmdü livahibil məkarim,
Vəş-şükrü lisahibil mərahim.
Və hüvəl-əzəlliyyü fil bidayət,
Və hüvəl-əbədiyyü fin-nəhayət.
Qəd şaə bi-sün'ihi-bəyanüh,
Ma ə'zəmə fil-bəqai-şanüh.
2. Sübhanəllahi-zəhi-xudavənd,
Bişibhü şərikü mislü manənd.
Məşşateyi-noərusi-aləm,
Gövhərkəşi-silki-nəsli-Adəm.
3. Sərrafi-cəvahiri-həqayiq,
Kəşşafi-qəvamizü dəqayiq.
Peydakoni hər nəhan ki, başəd,
Pünhankoni hər əyan ki, başəd.
4. Me'mari-binayi-afəriniş,
Sirabkoni-riyazi-biniş.
Yarəb, mədədi ki, dərdməndəm,
Aşüftəvü zarü müstəməndəm!
5. Əz feyzi-hünər xəbər nədarəm,
Cüz bihünhəri hünər nədarəm.
Şüğli-əcəbi giriftəəm piş,
Pişü pəsi-u təmam təşviş.
6. Səngist bərahəm uftadə,
Bəhrist məra həras dadə.
Tovfiqi-toəm əgər nə başəd
Vər lütfi-to rəhbər nə başəd.
7. Müşkil ki, dərin giriveyi-təng
Lə'li bə dərarəm əz dili-səng.
Müşkil ki, murad rox nəmayəd,
Zin bəhr düri bədəstəm ayəd.
8. On kon ki, diləm füruğ girəd,
Lovhəm rəqəmi-səfa pəzirəd.
Ayineyi-xatirəm şəvəd pak,
Rovşən gərdəd çirağİ-idrak.
9. Qofli-dəri-arizu betabəm,
Hər çiz tələb konəm beyabəm.
Bəxşəd bə riyazi-dovlətəm ab,
Əbri-kərəmi-rəsulü əshab.*

**BU, HƏZRƏTİ İLAHİYƏ SİTAYİŞ, ARZULARIMI YERİNƏ YETİRMƏSİ ÜÇÜN XAHİŞDİR VƏ ONA ŞÜKR EDƏRƏK BU SƏTİRLƏRİMİN QÜSURUNU ÖRTMƏK ÜÇÜN YALVARIŞDIR**

1. Kəramətlər bəxş edənə eşq olsun, Mərhəmətlər sahibinə şükr, O, əbədiyyətdə əzəlidir və sonsuzluqda əbədidir. Onun bəyani yaradıcılığıdır; əbədiyyətdə şanı nə qədər əzəmətlidir.

2. O böyük allaha şükürlər! O, bənzərsiz, şəriksiz, misilsiz və oxşarsızdır. Dünyanın təzə gəlinini bəzəyən, Adəm nəslinin sapına gövhər düzəndir.

3. O, həqiqət cəvahirinin sərrafıdır. O, ən dəqiq nöqtələrin sirrini açandır. Bütün gizli sirrləri açandır. Əyan olanları gizlətməyə qadirdir.

4. Yaranış binasının me'marıdır. Dünya gülşənini su ilə doyurandır. Tanrım, kömək elə, xəstəyəm, pərişanam, ağlaram, dərdliyəm.

5. Hünər feyzindən xəbərim yoxdur, hünərsizlikdən başqa hünərim yoxdur. Təəccüblü bir işə girişmişəm. Onun əvvəli və axırı təşvişdir.

6. Bu iş yolumda böyük bir daşdır. Məni qorxudan bu fırtınanın bəhridir . Sənin mənə köməyin olmasa, mərhəmətin mənə rəhbər olmasa,

7. Bu dar cığırda qara daşın ürəyindən lə'l çıxarmağım çətin olacaq. Muradım üzünü mənə göstərməyəcək və bu bəhrdən əlimə dürr gəlməyəcək.

8. Elə et ki, qəlbim işıqlansın. Lövhəmin üzü tər-təmiz olsun. Xatirimin güzgüsü saf olsun. İdrakımın çırağı işıqlı olsun.

9. Arzu qapısının qıfılını açıb, axtardığım hər şeyi tapa bilim. Mənim sədaqətimin gülşəninə Peyğəmbər və onun dörd dostunun kəramət buludu su versin!

## BU, ŞÜKUFEYİ-GÜLZARİ-TOVHİDDİR Və NOVBAVEYİ-BÜSTANİ-TƏMCİDDİR

1. Ey munisi - əhli zövq yadın,
Əbvabi-əməl kilidi adın!
Ey gənci-əta tilismi ismin,
Sən gənci-nihan, cahan tilismin!
2. Ey cudi vücudi-kövnə vahib,
Zati kimi e'tirafı vacib.
Ey silsileyi-vücudə nazim,
Rəzzaqi-ərazilü əazim.
3. Ey pərdəkeşi-rümuzi-mübhəm,
Müstəhfizi-intizami-aləm.
Ey nəqştərazi-səfheyi-xak,
Sahibrəqəmi-xütuti-əflak!
4. Ey möhtəsibi-cihati-ərkan,
Kani-gühəri-vücubü imkan!
Ey məbdə'i-feyzi-afəriniş,
Səndən rövşən çirağı-biniş!
Ey pərdeyi-masiva-niqabın,
Səndən özgə sənin hicabın!
5. Ey sirri-vücudun əmri-mə'lum,
Mövcud həmin sən, özgə mə'dum!
Ey yeddi gülü doqquz gülüstan,
Feyzi-kərəminlə səbzü xəndan!
6. Ey varı yox eyləyən, yoxu var,
Yox varlığında zənnü inkar!
Ey şahidi-qeyb pərdədarı,
Fikrin güli-mə'rifət baharı!
7. Ey aləmə feyzi-cud səndən,
Xəlqə şərəfi-vücud səndən!
Ey cümlə cahan sənə rizacu,
Səndən xali, səninlə məmlu!
8. Ey şəm'i-əzəl fətiləsuzi!
Bəzmi-əbəd əncümənfruzi!
Ey şirkü şərikdən münəzzəh.
Sirri-əzəlü əbəddən agəh!
9. Ey bari xudayi-aləmaray,
Təhsin işinə həmin ola rə'y!
Əhsəntə, zəhi-həkimi-kamil!
Nə şükr ola sün'ünə müqabil?
10. Fitrət rəqəmin çəkən zamanda,
Həqqa ki, bir əmri "kön fəkanda"*
Hökm etdin ki, nə ola əhval,
Nə və'z ilə çizginə məhü sal.

## BU, TOVHİD GÜLÜSTANINDAN BİR ÇİÇƏKDİR Və ONUN TƏ'RİF BAĞÇASININ NÜBARIDIR

1. Ey zövq əhlinin adı dillərdən düşməyən, adı bütün əməllərin açarı olan dostu! Ey adı ehsan xəzinəsinin tilsimi! Sən gizli xəzinəsən, cahan tilsimindir.

2. Ey mərd varlığı ilə kainatı yaradan, sənin zatın kimi varlığının e'tirafı da vacibdir. Ey yaranmışlar silsiləsini quran, əzəmətlilərə də, rəzillərə də qida verən!

3. Ey anlaşılmaz işarətlərin pərdəkeşi, aləmin nizamını qoruyan! Ey yer üzünün nəqşini vuran və göylərin rəsmini çəkən!

4. Ey altı cəhətin sütunlarının hakimi! Ey vacib və mümkün varlıqların gövhər kanı! Ey yaradılış feyzinin əzəli, sən gözlərin işığısan! Ey pərdəsi gözə görünməz göylər olan! Sənin özündən başqa pərdən yoxdur.

5. Ey vücudunun sirrinin dərk edilməzliyi mə'lum olan! Var olan yalnız sənsən, başqaları isə yoxdur. Ey yeddi gül və doqquz gülüstanı kərəminin feyzilə yam-yaşıl və fərəhli edən.

6. Ey varı yox eyləyən, yoxu var, varlığına şübhə və inkar yoxdur! Ey öz sirrini pərdədə saxlayan, fikrin mə'rifət gülünün mə'rifət baharı.

7. Aləmin səxavət feyzi səndədir! Xalqın varlığının şərəfisən, cümlə-cahan razılığını axtarır! Dövran mərhəmətinin feyzi ilə doludur.

8. Ey əzəl şamının piltəsini yandıran! Ey əbədiyyət məclisini işıqlandıran, Ey şərik və oxşarlıqdan pak olan, əzəli və əbədi sirlərdən agah.

9. Ey dünyanı bəzəyən ulu tanrı, sənin gözəl əməllərinə eşq olsun! Ey kamil müdrik, əhsən sənə! Sənin yaradıcılığına layiq şükrümüz hardandır?

10. Sən yaranmışın nəqşini çəkən zamanda, "Kon"* və fəkan əmrini verən zamanda, həqiqətən də quruluşun necə olmasının hökmünü verdin: Ay və il sənin göstərişinlə necə dolanmalıdır.

11. Dövran nə zamanda ola axir,
Hər dövranda nə ola zahir.
Necə ola fərd-nəsli-Adəm,
Hər fərdi onun nə edə hərdəm.
Əşyaya çox etməzəm təhəyyür,
Səndən yanadır həmin təfəkkür.
12. Əşya əcəb olmaz olsa zahir,
Çün var sənin kimi məzahir,
Əmma çü sənə qədimdir zat,
İdrak sənə yetərmi, heyhat!
13. İdrakimizə kəmali-heyrət!
Tövhidinə bəsdurur dəlalət.
Əndişeyi-zat qılmaq olmaz,
Bilmək bu yetər ki, bilmək olmaz.
14. Ol dəm ki, urub binayi-möhkəm,
Çəkdin rəqəmi-nizami-aləm,
Həqqa ki, xoş intizam verdin,
Arayişini təmam verdin.
15. Etdin gərəyin gər az, gər çox,
Bir nəsnə gərəkli yox ki, ol yox.
Bir növ ilə eylədin mühəyya
Kim, gəldi qüsurdan mübərra.
16. Əşyada əgərçi raz çoxdur,
Ol kim ola razın onda yoxdur.
Əşya necə səndən olsun agah,
Əlqüdrətü vəl-bəqaü lillah.

11. Dövran nə zaman sona çatmalıdır. Hər dövranda nə zahir olmalıdır. Adəm nəslindən olan adam necə olmalıdır. Hər fərd hər an nə etməlidir. Şeylərə mən çox da heyrət etmirəm. Belə fikirlər məndən çox uzaqdır.

12. Əşyanın zahir olması təəccüblü deyil, çünki onun sənin kimi yaradanı var. Sənin varlığın çox qədim olduğu üçün, heyhat, idrakımız sənə çata bilməz!

13. Bizim idrakımızın sonsuz heyrəti. Sənin təkliyinin sübutudur. Sənin varlığın haqda fikirləşmək olmaz. Bircə onu bilməliyik ki, səni bilmək olmaz!

14. O vaxt ki, möhkəm bina qurub, dünya nizamının nəqşini çəkdin, doğrudan da onu elə gözəl nizamladın ki, bütün bəzənişi kamil oldu.

15. Lazım olanları lazımınca az, ya çox etdin. Lazım olanlardan elesi yoxdur ki, olmasın. Ətrafda sirlər çox olduğuna baxmayaraq, hər şeyi elə yaratdın ki, dünya qüsursuz oldu.

16. Əşyalarda əgər sirr çoxdursa, eləsi yoxdur ki, onda sənin sirrin olmasın. Əşya səndən necə agah olsun ki, qüdrət və əbədiyyət yalnız tanrıya məxsusdur.

## BU, MÜNACAT DƏRYASNIDAN BİR CÖVHƏRDİR VƏ TƏZƏRRÖ MƏ'DƏNİNDƏN BİR GÖVHƏRDİR

1. Yareb, kerem et ki, xarü zarem,
Dergahe besi ümidvarem.
Torpaq idim, eyledin bir insan,
Müstövcibi-eqlü qabili-can.
Ger can ise xaki-dergehindir,
Ver eql ise saliki-rehindir.
2. Men gülşeni-can içinde xarem,
Ayineyi-eqle bir qübarem.
Nem var ki, laf edem özümden,
Mehv eyle meni menim gözümden.
3. Ol gün ki, yox idi mende qüdret,
Qıldın mene ğeybetimde reğbet.
Can verdinü sahibi-dil etdin,
İdraki-ümure qabil etdin.
Ger sefheyi-surete misalım
Çekmezdi qeza, nolurdu halım?
4. Hala ki, hevalegahi-cudem,
Meqbuli-seadeti-vücudem,
Yüz şükr ki, yox sene xilafım,
Insafim var, var e'tirafım.
Öyle deyilem ki, bu arade
Sedd ola sülukim e'tiqade;
Her lehze eqidem ola zail,
Tövhidine isteyem delail.
5. Rahi-telebinde biqerarem,
Əmma telebimde şermsarem.
Doğru yola getmedim, ne hasil?
Bir menzile yetmedim, ne hasil?
6. Her ersede her eser ki, gördüm,
Sensen deyib ol eser, yügürdüm;
Çün verdi xeyal ona xemü piç,
Men münfeil oldum, ol eser hiç.
7. Men eqlden isterem delalet,
Əqlim mene gösterer zelalet.
Tehqiq yolunda eql netsin.
Ə'mavü ğerib qanda getsin?
8. Tövfiq edesen meger refiqim,
Ta sehl ola şiddeti-teriqim.
Gör hirsimi, istegince ver kam,
Senden iqbalü menden iqdam.

## BU, MÜNACAT DƏRYASINDAN BİR CÖVHƏRDİR VƏ YALVARIŞ MƏ'DƏNİNDƏN BİR GÖVHƏRDİR

1. Tanrım, rehm ele xar ve zelilem! Ümidim yalnız senin dergahındır. Torpaqdan ağıla layiq can ve cana sahib bir insan yaratdın. Can senin qapının torpağıdır, Əql senin yolunun yolçusudur!

2. Men can gülşeni içinde xaram, Əqlin güzgüsünde tozam. Neyim var ki, özümden deyem? Meni öz gözümden sal!

3. Qüdretim olmayan günümde, yoxluğumda mene rehm etdin, can verdin, ürek ve elece de idrak sahibi eledin. Sen meni yaratmasaydın, halım ne olardı?

4. Hele ki, senin merdliyinden vücudum seadet tapıb, insafla ve ürekde yüz şükrler oxuyuram ki, sene sadiqem! Sene inamımın qarşısında heç bir sedd yoxdur. Her deqiqe eqidem pozulmur ve senin birliyine sübut axtarmıram.

5. Sene çatmaq yolunda sebrsizem ve bu isteyimden utanıram. Doğru yola getmesem, bir menzile yetmesem, elime ne çatacaq?

6. Harada bir eser gördüm, sensen deye ona teref yüyürdüm. O eser xeyalımda pozularken men üzüldüm, eser yox oldu.

7. Men ağlımdan yol isteyerken, o meni yolumdan azdırır. Axtarış yolunda ağıl neylesin, kor ve qerib hara getsin?

8. Mene kömek elini uzatsan, yolum da asanlaşar! Seni nece istediyimi gör ve meni arzuma yetir. Bext senden, emel menden!

9. Elmində əyandır e'tiqadım,
Sənsən, səndən həmin muradım.
Dünya nədirü təəllüqatı,
Əndişəyi-mövtdür həyatı.
10. Əmma deməzəm yalandır ol həm,
Sərmənzili-imtəhandır ol həm.
Billah ki, bu dilfirib mənzil,
Öylə mənə verdi rahəti-dil.
Kim, əski məqamımı unutdum,
Sandım vətənim, məqam tutdum.
11. Müşkül gəlir indi tərkin etmək,
Bir özgə məqamə dəxi getmək.
Mən böylə qılırdım e'tibarı
Kim, bunda olur könül qərarı;
Bundan dəxi yey məqam olmaz,
Zövqü bu yerin təmam olmaz.
12. Əmma çü sənindurur bu göftar
Kim, dünyadan özgə axirət var;
Oldur ki, məqami-cavidandır,
Kami-dilü rahəti-rəvandır.
13. Göftarına e'tiqad qıldım,
Ol yaxşıraq olduğunu bildim.
Bildim bu imiş sənin muradın
Kim, əhli-kəmal ola ibadın,
Bunda eylə rütbəyi-kəmalə,
Onda yetə dövləti-vüsalə.
14. Fərz oldu bir əzmə cəzm qılmaq,
Me'raci-kəmalə əzm qılmaq.
Bu rahdan etmək olmaz ikrah,
Xoş rahdurur sənə gedən rah.
15. Əvvəldə çü lütfün oldu mə'lum,
Axır günü də həm etmə məhrum!
Çün yadi-vüsal edib rəvanım,
Əzmi-rəhi-qürbün edə canım,
Ol ləhzə həm etmə şəfqətin kəm,
Tövfiqinə qıl rəfiq hər dəm!
16. Çün əql ilə can əmanətindir,
Məndə əsəri-inayətindir,
Bunları mənimlə zar qılma,
Bir neçə əzizi xar qılma!
17. Ta kim, bu məqami tərk edəndə,
Səndən yana əzm edib gedəndə,
Məndən cəzə ilə getməsinlər,
Dərgahə şikayət etməsinlər.
Şum olmasın onlara vüsalım,
Olmasın olardan infialım.

9. E'tiqadım elminə əyandır, səndən səni isteyirəm! Dünya nədir? İstəkləri nədir? Ölüm fikrindən başqa bir şey deyil.

10. Ancaq onu yalan sanmıram, bir imtahan məqamı sayıram. Billah, bu könül aldadan yer məni elə rahatlandırdı ki, köhnə məqamı unutdum bu məqamı vətən bildim.

11. İndi buradan ayrılmaq, başqa məqama getmək çox çətindir. Mən inanırdım ki, bu, ürəyimin qərarıdır. Bundan da yaxşı məqam ola bilməz və buranın zövqü bitəcək deyil.

12. Ancaq bu dünyadan başqa, axirətin varlığı sənin sözün olduğu üçün, oranın əbədi məkan və ürəyin kama yetişib rahatlanacaq yeri olduğuna inandım!

13. Sözünə inanıb onun aliliyini bildim və anladım ki, məqsədin qullarının kamal əhli olmasıdır. Burada kamal rütbəsinə, orada da qovuşma səadətinə yetişməsidir.

14. Kamal marağına yol tutmaq qərara alındı. Bu yol xoşdur və bundan yorulmaq olmaz.

15. Əzəldən mənə rəhm göstərdin, axır gündə də onu məndən alma, ruhum sənə qovuşmağa üz tutsun, yolum sənin yolun olsun, o ayaqda mərhəmətini azaltma, dostluğun mənə yoldaş olsun!

16. Ağlım da, canım da sənin xeyirxahlığının əmanətidir. Bunları ağlar qoyma, bir neçə əzizi xar eləmə!

17. Bu məqamdan getsələr, səndən azsalar, zülmü məndən görməsinlər, sənə qovuşmağım uğursuzluq sayılmasın, onlardan xəcalətim olmasın.

**BU, VACİBÜL-VÜCUD İSBATNNA BÜRHANİ-QAT'EDİR**
**VƏ**
**BƏQAİ-SAİR MÖVCUDATA DƏLİLİ-MANE'DİR**

1. Etmek gerek ehli-feyzi-biniş,
Tehqiqi-vücudi-aferiniş.
Bilmek gerek onu kim, cevahir
Ne genci-nihandan oldu zahir?
Ne dairedir bu devri-eflak,
Ne zabitedir bu merkezi-xak?
2. Cisme erezi kim etdi qaim,
Nare neden oldu nur lazim?
Her xilqete gerçi bir sebeb var,
Aya, sebebi kim etdi izhar?
Ger kaf ile nundan oldu alem,
Aya, neden oldu kafü nun hem?
3. Bihude deyil bu karixane,
Bifaide gerdişi-zemane.
Haşa ki, bu bargahi-ali
Bir dem iyesinden ola xali.
Haşa ki, bu türfe neqşi-qerra
Neqqaşından ola müberra.
4. Fikr eyle ve gör, nedir bu üslub,
Ne saniedir bu vez'i-mensub?
Her zerreyi-zahirin zühuri
Bir özgeye bağlıdır zeruri.
Ger ğayete eylesen teemmül,
Zahir olur onda mezheri-küll.
Versen özüne fenayi-mütleq,
Isbat olur ol fena ile heq.
5. Ger var ise me'rifet mezaqi,
Fani sene bes delili-baqi.
Heqqa ki, hemin vücud birdir,
Bir zate vücud münhesirdir.
Əksidir onun vücudi-eğyar,
Me'nide yox e'tibar ile var.
6. Var olanı xelq yox sanırlar,
Yox varlığına aldanırlar.
Yoxdur bu vücudun e'tibarı,
Heq ayinedir, cahan ğübarı.
7. Ey eql, edebe riayet eyle,
Bu bilmek ile kifayet eyle!
Tehqiqi-sifate qane olğıl,
Əndişeyi-zate mane olğıl!
Ol perdeye kimse rah bulmaz,
Tehqiq bil, onu bilmek olmaz.

**BU, VARLIĞI VACİBİN ISBATINA QATI BİR SÜBUTDUR**
**VƏ**
**BAŞQA VARLIQLARIN OLMADIĞININ DƏLİLİDİR**

1. Ağıl əhli varlığın ve yaradılışın sirrini izləməlidir, cavahirin hansı gizli xezinədən olduğunu bilmək gərəkdir. Göylərin dolanması və yerin mərkəzdə dayanışı nə deməkdir?

2. Şeylərə əlamətləri, oda işığı kim veribdir? Hər yaranışın bir səbəbi varsa, bəs səbəbin özünün nə olduğunu kim desin? Aləm "Kaf" və "Nun"dan yaranıbsa, bəs "Kaf" və "Nun" nədən yaranıb?

3. Axı zəmanənin bu dövranı elə-belə boş, faydasız deyil. Vay o gündən ki, bu türfə gözəl naxış öz nəqqaşına biganə olsun, bu ali saray o öz sahibindən ayrı olsun!

4. Düşün, gör bu nə üsuldur və kimə aiddir! Hər gözə görünən zərrə mütləq başqasına bağlıdır. Sona baxsan, orada hər şeyin cəmləşdiyini görərsən. Özünü yox edirsənsə, yoxluğunla haqqı təsdiqləyirsən.

5. Əgər arifsənsə, sən yoxluğun özündə belə daimi varlığı görərsən. Varlıq təkdir və tək birinə aiddir. Başqalarının varlığı onun danılmasıdır, əslində isə varlıq saydığın yoxdur.

6. Xalq var olanı yox sanır və yoxun varlığına aldanır. Vücuda e'tibar yoxdur, haqq güzgüdür, dünya onun tozudur.

7. Ey əql, ədəb gözlə və bunu bilməklə kifayətlən. Sifətləri, əlamətləri öyrənməklə qane ol, mahiyyəti axtarmaqdan saqın. Heç kəs o pərdəyə yol tapa bilməz. O axtarmaqla tapılan deyil.

8. Gər yetsə idi bu sirrə idrak,
Deməzdi rəsul "maərəfnak".
Xəlq oldu bu bəhri-heyrətə ğərq,
Ta xəlqdən ola xaliqə fərq.

9. Hər riştə ki, həqq əyan edibdir,
Sərriştəsini nihan edibdir,
Bir kimsə əgər olaydı agah
Kim, xəlqi necə yaradır Allah;
Mümkün ki, iradətilə ol həm,
Xəlq edə bileydi özgə aləm.

10. Verməz çü kəmali-hikməti-həqq
Təhqiqi-rümuzə rahi-mütləq.
Faş oldu ki, sirri-həqq nihandır,
Aləmdə nişanı binişandır.

8. Əgər bu mümkün olsaydı Rəsul deməzdi: "Səni dərk edə bilmədik". Xalq bu heyrət dəryasına daldı ki, yaranmış ilə yaradıcı arasında fərq olsun.

9. Haqq yaratdığı hər sapın (kələfin) ucunu gizlində saxlayıb. Bir kəs allahın xalqı necə yaratdığını bilsəydi, o bəlkə də ayrı bir aləm yarada bilərdi!

10. Tanrı ağıla bu hikməti verməmişdir. Sirrin açılmasının dəqiq yolunu göstərməmişdir. Mə'lum oldu ki, haqqın sirri gizlidir - nişanəsi nişansızlıqdır!

## BU, İZHARİ-E'TİRAFİ-CƏHALƏTDİR
## VƏ
## IQRARİ-ISRAFİ-
## MƏ'SİYƏTDİR

1. Ey hikmete baxmayan nezersiz,
Əhvali-zemaneden xebersiz!
Te'n etme ki, çerx bivefadır,
Daim işi cövr ile cefadır.
2. Şerh eyle mene ki, çerx netdi?
Ondan ne cefa zühura yetdi?
Nen var idi kim, elinden aldı,
Nə mertebeden aşağı saldı?
3. Dövrane getirdi mehrü mahi,
Axıtdı sefidivü siyahi.
Gəh ateşe zecri-ab verdi,
Geh bade ğemi-türab verdi.
4. Şem'i-emelin münevver etdi,
Her ne diledin müyesser etdi;
Qıldı seni hiçden bir adem,
Əsbabi-tene'ümün ferahem.
5. Çerxin xud işi seninle böyle,
Sen neyledin onun ile, söyle!
Her dem onu bivefa oxursan,
"Dunsan" deye beddua oxursan.
Çün ol sene qıldı mehribanlıq,
Yaxşılığa eyleme yamanlıq!
6. Ey ruh ki, cami-cehl edib nuş,
Hübbi-veten eyledin feramuş.
Kim saldı seni bu teng rahe,
Qandan düşdün bu damgahe?
7. Sen terk qılıb edem diyarin,
Bulduqda vücud e'tibarin,
Qılmışdı seninle hikmetüllah,
Əcnasi-hevasü eqli hemrah.
Ta aleme geldiyin zamanda
Bazari-tereddüdi-cahanda
Sermayelerinden edesen sud,
Ol sud nedir? - Riyazi-me'bud.
8. Hala ki, xesaret oldu vaqe,
Sermayelerin tamam zae.
Heyranü mükedderü tehidest,
Əhvalı xerabü rütbesi pest,
Dönsen yene geldiyin meqame,
Qabilmi düşersen ehtirame?
Əlbette, zelilü xar olursan,
Bu fe'l ile şermsar olursan.

## BU, ÖZ CƏHALƏTİNİN E'TİRAFIDIR
## VƏ
## GÜNAHLARININ ÇOXLUĞUNUN
## QƏBULUDUR

1. Ey hikmete baxmayan kor, zemanədən xəbərsiz! Çərx vəfasızdır, işi-gücü zülmdür deyə te'nə vurma!

2. Anlat mene görüm dövran sənə neyləyib, ondan sene ne zülm yetişib. Nəyin var idi ki, elinden aldı, hansı mertebeden seni aşağı saldı?

3. Güneşi ve Ayı herekete getirdi, ağı-qaranı axıtdı.* Gah oda suyun ezabını, gah yelə torpağın tozunu verdi.

4. Əmel şemini yandırdı, bütün diləklərinə seni çatdırdı. Seni heçden insan yaratdı və yaxşı dolanış yolunu gösterdi.

5. Çərx sene bunları eledi, bes sen onunçün neyledin ki, her dem ona "rezilsən" deye bed dua oxuyursan ve vəfasız adlandırırsan? O ki, sənə mehribanlıq eyleyib, yaxşılığa yamanlıq eleme!

6. Ey ruh! Inad şerabını içib veten sevgisini unutdun! Kim seni bu dar yola saldı, hardan bu teleye düşdün?

7. Sen yoxluq diyarını tərk edib varlığın e'tibarını tapdın. Allahın hikmeti sene eql ve çoxlu duyuqlar verdi ki, dünyaya gelende ve cahanın telatümlü bazarında bu dövletden faydalanasan. Bu fayda allahın nezir-razılığıdır.

8. Indi ise ziyana düşmüsen, mayan zay olmuş, eliboş qalmısan, ehvalın pozulub, rütbeni itirmisen! Yene de geldiyin meqama qayıtsan, daha da hörmetlimi olacaqsan? Əlbette zelil ve xar olarsan, bu emelindən utanarsan.

9. Ey nefsperestü cismperver,
Olma ğemi-hirs ile mükedder!
Cehd eyle ezabi-gur yığma!
Se'y eyle metai-mur yığma!
10. Alma ele sağeri-meyi-nab
Kim, ğerqe eder seni bu girdab!
Olma nigerani-sebzeyi-beng*,
K'ayineyi-dinine salır jeng!
11. Def kimi köküsde lehv qoyma!
Ney kimi hevayi-nefse uyma!
Damani-teriqi-şer'i tutğıl!
Her ne ki, xilafi-şer'–unutğıl!
Tehqiqi-vesileyi-vüsul et!
Teqlidi-şerieti-resul et!

9. Ey tamahının qulu ve canını seven, herislikden kederlenme! Qarışqa kimi mal yığma, çalış qebir ezabı yığma.

10. Saf şerab qedehini eline alma, bu girdabda boğularsan. Dininin ayinesini paslandıran xaş-xaşdan* uzaq ol.

11. Def kimi sineni oyunla doldurma, ney kimi nefes havasına uyma. Şeriet yolunun eteyinden yapış, şeriete uymayan ne varsa, unut. Allaha qovuşmanın yolunu axtar, peyğemberin şerietini qebul et!

**BU, SƏRDƏFTƏRİ-ƏNBİYANIN
KİTABİ-ÖVSAFINDAN
BİR VƏRƏQDİR
VƏ
SƏRVƏRİ-ƏSFİYANIN
GÜLZARİ-LƏTAFƏTİNDƏN
BİR TƏBƏQDİR**

1. Ey padşəhi-səriri-lövlak,
Məqsudi-vücudi-xakü əflak!
Olmuş əflak xaki-rahin,
Çəkmiş əflakə xak cahin.
2. Ey raqimi-nüsxəyi-məani,
Mə'murəyi-elmi-dinə bani!
Şahənşəhi-məsnədi-risalət,
Rəssami-qəvaidi-ədalət!
3. Ey ərşnəvazü fərşpərvər,
Dəftərdari-hesabi-məhşər!
Sərdəftəri-ənbiyayi-mürsəl,
Onlara həm axirü həm əvvəl!
4. Ey vazei-istilahi-iyman,
Həqdən səbəbi-nüzuli-fürqan!
Sənsən sultanü qeyr xeylin,
Səndən özgə sənin tüfeylin.
5. Ey xəlvəti-qürbə şəm'i-məhfil,
Cibril tərəddüdünə mənzil!
Həqq əmri səninlə xəlqə cari,
Qövlünlə ol əmrin e'tibari.
6. Ey qiblənümayi-əhli-taət,
Gəncinəyi-gövhəri-şəfaət;
Taci-səri-ərş xaki-payin,
Şəm'i-şəbi-qədr nuri-rə'yin.
7. Ey vasitəyi-nizami-aləm,
Ə'yani-vücudə sədri-ə'zəm.
İrfani-sifatü zatə arif,
Keyfiyyəti-kainatə vaqif!
8. Ey zatın üçün bəşər vücudi
Adəmdə sənə mələk sücudi!
"Yasin" sədəfi-düri-sifatın,
"Taha" güli-bustani-zatın.
9. Ey məktəbi-danişə müəllim,
Məhruseyi-hökmi-şər'ə hakim!
Dərgahinə ənbiya rücui,
Tə'ziminə asiman rükui.

**BU, PEYĞƏMBƏRLƏR SƏRDƏFTƏRİNİN
VƏSFİ KİTABINDAN BİR VARAQDIR
VƏ
MÜQƏDDƏSLƏRİN SƏRVƏTİNİN
LƏTAFƏT GÜLZARINDAN
BİR TABAQDIR**

1. Ey levlak* taxtının padşahı, yerlərin və göylərin yaradılış məqsədi! Göylər yolunun tozu olmuş uca məqamın göylərə yüksəlmiş.

2. Ey mə'na səhifəsini yazan və din elminin binasını quran! Sən peyğəmbərlik taxtının şahənşahı və ədalət qaydalarının qurucususan.

3. Ey göyü oxşayan, yeri bəsləyən və məhşər ayağının hesabdarı. Peyğəmbərlər siyahısında birinci, sən onların həm əvvəli, həm də sonusan!

4. Ey inam yolunun çağırışçısı və həqdən quran göndərilməsinin səbəbkarı, sən sultansan, başqaları sənin qəbilindəndir!

5. Ey müqəddəs xəlvət otağının çırağı və Cəbrailin çaşıb qaldığı yeri bilən, Allah əmri sənlə və sənin sözünlə xalqa çatdırıldı, hörmətin və sevginin dəyəri oldu!

6. Ey Allaha tapınanlara yol göstərən, şəfa cövhərinin xəzinəsi, yerlərin və göylərin başının tacı, qədr gecəsinin şamı və düşüncənin işığı!

7. Ey aləmin nizamının vasitəsi və əzəmətlilərin böyük sədri, sifətlərin və zatın bilicisi, kainatın halını bilən!

8. Ey var olduğun üçün bəşər yaranmış, Adəm və mələklərin səcdəgahı. "Yasin" sənin sifətlərinin incisinin sədəfidir. "Taha"zatının bağçasının güļüdür!

9. Ey bilgi məktəbinin müəllimi, şəriət hökmü məmləkətinin hakimi! Dərgahına peyğəmbərlər qayıdır, tə'zimində göylər baş əyir.

10. Təhsin sənə, ey xücəstə fərcam
Kim, vəz" qılıb təriqi-islam,
Keyfiyyəti-halı rövşən etdin,
Xeyrü şər işin müəyyən etdin.
Əhvali-əvamirü nəvahi,
Mə'lum elədin bizə gəmahi.
11. Sən bildirdin ki, kimdir Allah,
Sənsiz kim olurdu ondan agah?
Gümrahları təriqə saldın,
Üftadələrin əlini aldın.
12. Faş oldu nəsihətin cəhanə,
Sən qoymadın ortada bəhanə.
Əmma bizə yoxdur ol səadət
Kim, hifzi-təriqin ola adət.
13. Ehmal edəriz itaətində,
Təqsir ədayi-xidmətində.
Hər necə ki xud şərmsarız,
Bu cürm ilə həm ümidvarız
Kim, feyzi-əvatifi-əmimin,
Şad eyləyə könlün əhli-bimin.
14. Asilərin olasan pənahi,
Nomidlərin ümidgahi.
Sənsən çü şəfii-hər məasi,
Nə qəm əgər olsa kimsə asi.
15. Gər məndə ola təmam taət,
İzhar nədən bular şəfaət?
Sənsən bu sərir padşahi,
Bu mülkdə olanın pənahi.
16. Hər əsrdə bir nəbi zühuri,
Hər dövrdə bir rəsul nuri,
Fitrət yolunu müzəyyən etdi,
Üzün şəmi ilə rövşən etdi.
Ta gəlməyə rövşən ola rahin,
Budur rəhü rəsmi padşahin.
17. Xabi-ədəm içrə şəxsi-aləm
Görmüşdü vücuddən müqəddəm
Kim, ləm'əyi-nurdən bir əfsər
Geymiş, vermiş özünə ziyvər.
18. Bidar olanda ol yuxudan
Getmişdi qərarı arizudan.
Çün istədi ol məname tə'bir,
Səndən ona müjdə verdi təqdir.
Dünyayə pəyami-feyzi-nurin,
Tənbihi-səadəti-zühurin.

10. Əhsənlər sənə, ey sonu uğurlu olan, islamın yolunu göstərib halımızı bizə anlatdın, xeyir və şər işini aydınlatdın. Halal və haramın mahiyyətini bizə öyrətdin!

11. Allahın kim olduğunu bizə sən öyrətdin, sən olmasaydın, haradan biləcəkdik? Azanlara düzgün yol göstərdin, zəiflərin əlindən tutdun.

12. Nəsihətin aləmə çatdı, heç bir başqa şeyə bəhanə qalmadı. Amma ki, sənin yolunu qorumaq xoşbəxtliyi bizə nəsib olmadı.

13. Sənə ibadətdə ləngik, qulluğunda təqsirkarıq. Bu xəcalət və günahımızla da ümid edirik ki, hamıya çatacaq mərhəmətiniz biz qorxanları da sevindircəkdir.

14. Sənə ağ olanların da pənahı və umudsuzların da umudgahı olasan! Sənə ağ olanların da arxası olduğun üçün olanların da qorxusu yoxdur!

15. Mən sənə tam tabe olsam, onda sənin bizi qorumaq qabiliyyətin necə üzə çıxardı? Sənsən bu taxtın padşahı, bu mülkdə yaşayanların sığınacağı.

16. Hər əsrdə bir peyğəmbər, hər dövrdə bir allah elçisi xalqın yolunu işıqlandırıb, üzünün nuru ilə bəzəyib ki, sənin gələn yolların işıqlansın, padşahın yolu belə olmalıdır!

17. Yoxluq yuxusu içində aləmin şəxsi öncədən sənin varlığını, işıqdan bir tac geyib sənin özünü bəzədiyini görmüşdü.

18. Aləm yuxusundan ayılıb səni görmək arzusu ilə yanmışdır. Bu yuxunun yozulmasını istəyəndə allah ona səndən müjdə vermiş, dünyaya sənin nurunun, bərəkətinin xəbərini vermiş, üzə çıxmanın yolunu göstərmiş.

19. Xəlqə verib intizari-məqdəm,
Ol dəm gəldi ki, gəldi Adəm.
Dünya tələbində oldu qaim,
Dövr ilə səni dilərdi daim.
Bir-bir yetib özgə ənbiyayə,
Me'racə çıxardı payə-payə.
20. Gəzməzdi səninlə sayə həmrah,
Guya ki, nihali-qəddin, əy mah,
Bu aləmə vermiş idi vayə,
Ol aləmə salmış idi sayə.

19. Xalq sənin bu dünyaya gəlməyinin intizarında ikən Adəm bu dünyaya gəldi. Adəm dünyaya gələndən də sonra dünya səni diləyirdi. Başqa peyğəmbərləri keçərək addım-adım səni Me'raca çıxardır.

20. Kölgən də səninlə yanaşı gedə bilmirdi, sanki ey ay üzlü, qəddi-qamətin bu aləmə nəsib olub kölgəsini o biri aləmə-qaranlıq dünyaya salmışdı.

## BU, ŞƏBİ-ME'RAC BƏYANİDİR
## VƏ
## TÜLUİ-AFTABİ-ASİMANİDİR

1. Çün feyzi-vücudun ilə, ey pak,
Rəşki-fələk oldu ərseyi-xak,
Didarını görməyi mələklər,
Pabusuna yetməyi fələklər,
Çox eyləyib iztirab peyda,
Allahdan etdilər təmənna.
2. Bir yaxşı zaman, şərəfli saət
Rəf oldu dualərə icabət.
Cibril yetib, yetirdi fərman,
3. - Key sərvi-riyazi-elmü irfan!
Xurşidini ərşə sayə qılğıl!
Me'raci büləndpayə qılğıl!
Ey qədri büləng padişəh, dur!
Lütf et, şəbi-qədr qədrin artır!
Rəf eylə hicabi-masəvani,
Seyr eylə məkani-laməkani!
Müştaqi-cəmaldir mələklər,
Möhtaci-vüsaldır fələklər.
4. Eyvani-süpehrdə sitarə
Min-min göz açıbdır intizarə.
Xoş ol ki, minib Büraqi xoşhal,
Buldun dərəcati-izzü iqbal.
Basdın ayağın bu çar tağə,
Çıxdın dərəcati-nöhrəvağə.
5. Nə'leyninə sürdü üz məhi-növ,
Xurşid rüxündən aldı pərtöv.
Göstərdi Ütarid* ehtiramın,
Xət verdi ki, mən sənin qulamın.
Nahidin edib füzun nişatın,
Bəzmi-tərəb eylədin büsatın.
6. Iqbalın olub qərini-xurşid,
Öyrətdi Məsihə rəsmi-təcrid.
Tiğində bulub nizam əyyam,
Tə'limi-şücaət aldı Bəhram.
7. Bürceysə*-müsaid oldu iqbal,
Feyzi-qədəmindən oldu xoşhal.
Keyvan* şəbi-qədrin eylədin ruz,
Oldun ona şəm'i-məclisəfruz.
8. Rə'yət-səfi-sabitatə çəkdin,
Ol məzrəə mehr toxmun əkdin;
Qıldın fələk ətləsini rəngin,
Ol məhfilə verdin özgə ayin.

## BU, ME'RAC GECƏSİNİN TƏSVİRİ
## VƏ
## GÜNƏŞİN GÖYƏ ÇIXMASIDIR

1. Ey pak, sənin varlığının bərəkətinə göylər qısqanarkən, mələklər səni görməyi, fələklər ayağını öpməyi Allahdan dilədilər.

2. Bir xoş və şərəfli saatda duaları qəbul olmuşdu, Cəbrayıl gəlib fərman gətirdi:

3. Ey elm və ürfan bağçalarının sərvi, ey uca dəyərli padşah, qalx, günəşin göylərin kölgəsi olsun, meracını yüksəlt, lütf elə qədr gecəsinin qiymətini artır, göylərin pərdəsini aç, sonsuz məkanı seyr elə, mələklər camalının həsrətindədir, fələklər görüşünün möhtacıdırlar,

4. Göylərin qatlarında səyyarələr sənin intizarını çəkir! Yaxşı ki xoşhallıqla Buraqa minib izzət və iqbal dərəcəsinə qalxdın, dörd tağlı doqquz qatlı göylərə yüksəldin.

5. Yeni ay sənin başmaqlarına üzünü sürtdü, günəş parlaqlığını sənin yanaqlarından aldı, Ütarid hörmət göstərərək "mən sənin qulunam" dedi, Zöhrənin sevinci aşdı-daşdı, əyləncə məclisi düzəltdi.

6. Bəxtin günəşə yaxınlaşıb İsaya təklik yolunu öyrətdi. Dövran sənin qılıncından nizama düşdü və Bəhram ondan şücaət dərsi aldı.

7. Bürceysin üzünə bəxt güldü, sənin qədəminin feyzindən xoşhal oldu. Keyvanın qədr gecəsi gündüzə çevrildi və onun məclisinə işıq verən şamı sən oldun.

8. Sabitlər cərgəsində bayraq qaldırdın, mərhəmət toxumu əkdin, göylərin atlasını rəngbərəng etdin, o məclisə başqa bir şəkil verdin.

9. Lövhü qələmi müzəyyən etdin,
Kürsi ilə ərşi rövşən etdin.
Cibrili qoyub, Büraqı saldın,
Tövhid yolunda fərd qaldın.
Rəf oldu sənə hicabi-mabeyn,
Nüzhətgəhin oldu qabi-qövseyn.
Getdin o yerə ki, getmək olmaz,
Yetdin o yerə ki, yetmək olmaz.

10. Bizdən həqə ərzlər yetirdin,
Həqdən bizə müjdələr gətirdin.
Lütf etdi sənə inayəti-həq,
Tövfiq nifazü əmri-mütləq;
Həm məxzəni-mə'rifət kilidi,
Həm nə'mətü mərhəmət ümidi.

11. Dəryadə olub ğəni gühərdən,
Zövq ilə dönəndə ol səfərdən
Gərm idi hənuz xabgahın,
Cünbüşdə ğübari-xaki-rahın.
İnsaf həmin ola siyahət,
Böylə səfər ilə istirahət.

12. Oldu sənə feyz bunca hasil,
Bu vaqiədən zəmanə ğafil.
Ğafilləri eylədin xəbərdar,
Əsrari-nihani etdin izhar.

13. Açdın dəri-iltifatü ən'am,
Verdin gərəyincə hər kəsə kam.
Çün şəfqəti-amin oldu məqsum,
Lütf eylə, məni həm etmə məhrum.

14. Biçarə Füzuliyəm ki, zarəm,
Zülli-günəh ilə şərmsarəm.
Tədbirdə süstəmü səbükray,
Sən bir mədəd etməsən mənə, vay!

15. Ey məş'ələyi-təriqi-tarik,
Vey rahnümayi-rahi-barik!
Ehsanını hadiyi-təriq et,
Bir feyzi-nəzər mənə rəfiq et,
Kalayişi-ixtilafdan pak,
Peyrəvliyin eyləyim tərəbnak,
Gülzari-vücudum edə seyrab,
Barani-riyazi-alü əshab!

9. Lövhəni və qələmi bəzədin, kürsünü və ərşi işıqlatdın. Cəbrayılı orada qoyub, Buraqı sürdün. Allahın birliyi yolunda tək qaldın.

Sənin üçün aradakı pərdə açıldı. Gəzib dolaşdığın yer iç-içə girmiş iki yay arası qədər yaxın oldu. Gedilməyən yerlərə getdin, çatılmayan yerlərə çatdın.

10. Haqqa bizdən xəbər apardın, haqqdan bizə müjdələr gətirdin. Hörmətinin və əmrinin kəsərinə yoldaş eyləyən haqq sənə lütf eyləyib kömək göstərdi - həm bilik xəzinəsinin açarını, həm də ne'mət və mərhəmət ümidi verdi.

11. Dəryada incidən doyub, zövq ilə o səfərdən dönərkən yatağın isti idi. Cənnətdə isə ayağının tozu var idi. İnsafla desək, elə yolçunun belə də istirahəti olmalıdır.

12. Sənə bu bərəkət yetişdikdə zəmanə bundan xəbərsiz idi. Gizli sirrləri açaraq qafilləri xəbərdar elədin.

13. İltifat və ne'mətlər qapısını açıb hər kəsi muradına yetirdin. Hər kəsə qaib şəfqətini böləndə, mərhəmət elə, məni də unutma.

14. Biçarə Füzuliyəm, ağlayıram, günahkaram, xəcalətliyəm, düşüncədə zəif, əməldə yanlışam. Sən mənə kömək etməsən, vay halıma!

15. Ey qaranlıq və dar yolun məş'əli, mənə verdiyin ehsanı doğru yola yönəlt və məndən nəzərini çəkmə. Qoy qarışıqlıq və dolaşıqlardan pak olum, sevinərək sənin arxanca gedim. Vücudumun gülşənini peyğəmbər və onun ali əshabının razılıq yağmuru sulasın.

## BU QƏSİDƏ HƏZRƏTİ-MƏHƏMMƏD ƏLEYHİSSƏLAM ŞƏNİNƏDİR

1. Ya mənbəül-məkarimi və ya me'dən ül-vəfa,
Ya məcməül-məhasini və ya mənbəül-əta.

2. Əntəl-ləzi büistə ileyna mübəşşirən,
Vəxtarəkəl-ilahə ənil xəlqi vəstəfa .

3. It'əl-ləzi təfəzzələhül qürbə vəl qəbul,
Vəntəl-ləzi təfərrədəhül izzü vəl-üla.

4. Mənirtica bilütfikə maxabə vəntəfi,
Məniqtəda bişər'ikə mazaə vəhtəda.

5. Ya övnə mən təfəqqədəhü ində şiddətin,
Ya kəhfə mən təhəssənə fizzəri vənnəca.

6. İsa nə mirəsəd bə to dər qədrü mənzilət,
Bər çərx əgər nəhəd zisəri iqtidar pa.

7. Me'rac yafti to vü bər Tur şod Kəlim,
Fərq əz to ta Kəlim ziərşəstü ta səma.

8. Abi to bud kateşi Nəmrudra nişand,
Ruzi ki, kərdə bud dər ateş Xəlil ca.

9. İqrari kafərist zişər'i to inhiraf,
Bürhani gümrəhist bə ğeyri to iqtida.

10.Ta münqətə nə gərdəd əz asibi ixtilaf
Şod bəstə bər to silsileyi-silki-ənbiya.

11.Baənbiyast nesbət zati-to çün elif*,
Həm ibtida toi bəheqiqət, həm intiha.

12.Təqdir cüz rizayi-to kari və mikonəd,
Peyvəstə taəti-to əda mikonəd qəza.

## BU QƏSİDƏ HƏZRƏTİ-MƏHƏMMƏD ƏLEYHİSSƏLAM ŞƏ'NİNƏDİR

1. Ey yaxşılıqların mənbəyi və vəfa mə'dəni,
Ey gözəlliklər məskəni, ehsan qaynağı!

2. Sən bizə müjdəçi göndərilənsən.
Xalqın içindən allah səni seçib ayırdı.

3. Sən allaha yaxınlaşmaq və
qəbul olunmaqla şərəfləndin!
Sən əzizlik və ucalığın "tək" seçdiyisən!

4. Sənin lütfinə sığınan umudsuzluğa
düşmədi, faydalandı.
Sənin şəriətini seçən itmədi, doğru yol tapdı!

5. Ey dar anda səni itirən insanın yardımçısı.
Ey düşünərəkdən sənə sığınanın sirdaşı
və yuvası!

6.Isa fələyə ayaq bassa da qədr və qiymətində sənə çatmadı.

7. Sən də merac etdin, Kəlim də Tura getdi, ancaq aranızdakı fərq yerlə göy qədərdi.

8. Xəlil atəşə atılarkən sənin suyun Nəmrudun odunu söndürdü.

9. Sənin şəriətindən dönmək kafirlikdir, səndən başqasına inanmaq satqınlıqdır.

10.Ixtilaf üzündən pozulmasın deyə peyğəmbərlər zənciri sənə bağlandı.

11.Peyğəmbərlərlə sənin nisbətin elif kimidir . Doğrudan da əvvəl də sənsən, axır da.

12. Sənin təqdirin allahın razılığıdır. Qəza sənin itaətindədir.

13.Ey afitabi-zatinə hər zərrə bir nəbi,
Min şə'rdin diyarinə hər zərrədən ziya.

13. Ey zatının günəşinin hər zərrəsi bir peyğəmbər olan, hər zərrəsindən min şəriət və din diyarına işıq saçan.

14.Sən ğayəti-vücudisənü özgələr tüfeyl,
Sən padişahi-mülksənü özgələr gəda.

14. Varlığın qayəsi sənsən, qalanlar xırdalıqlardır, şən mülkün padişahısan, qalanlarsa dilənçi.

15. Carubi-girdi-rəhgüzərin bali-Cəbrəil,
Taqi-rəvaqü dərgəhin eyvani-kibriya.

15. Yolunun tozunun süpürgəsi Cəbrayılın qanadıdır.
Dərgahının kəmərinin tacı allahın eyvanıdır.

16. Darüşşəfayi-həşrdə bimari-mə'siyət,
Şəhdi-şəfaətindən umar şərbəti-şəfa.

16. Yamanlıqlara düşən, məhşərin şəfa evində sənin şəfahətinin şəkərindən şəfa şərbəti umar.

17. Ey çaryari-kamilin ə'yani-mülki-din,
Ərbabi-sidqü mə'dələtü rif'ətü həya.

17. Ey dörd əsl dostun sahibi, onlar din mülkünün qoruyucusudurlar, doğruluq, ədalət, mərhəmət və həya sahibidirlər.

18. Dövrün bu dörd fəslilə bir mö'tədil zaman,
Şər'in bu dörd rüknilə bir mö'təbər bina.

18. Sənin dövrün bu dörd mövsümə görə çox yumşaqdır, şəriətin bu dörd dirəklə mö'təbər bir binadır.

19. Ya Mustəfa, Füzuliyi-möhtacə rəhm edüb,
Izhari-iltifat ilə qıl hacətin rəva.

19. Ey seçilmiş peyğəmbər, Füzuli möhtaca rəhm elə, iltifat göstər və ehtiyacını ödə!

## BU, ƏRZİ-ƏDƏMİ-QÜDRƏTDİR
## VƏ
## ÜZRİ-FİQDİ-QÜVVƏTDİR

1. Arayişi-söhbət eylə, saqi!
Ver badə, mürüvvət eylə, saqi!
Bir cam ilə qıl dimağımı tər,
Lütf eylə, bir iltifat göstər.
2. Ğəm mərhələsində qalmışam fərd,
Nə yar, nə həmnişin, nə həmdərd.
Həmcinslərim təmam getmiş,
Söz mülkindən nizam getmiş,
3. Bu bəzmdə sən qalıbsənü mən,
Bu bəzmi gəl edəlim müzəyyən.
Sən ver badə, mən eyləyim nuş,
Mən nəzm oxuyum, sən ona tut guş.
4. Bir dövrdəyəm ki, nəzm olub xar,
Əş'ar bulub kəsadi-əs'ar.
Ol rütbədə qədri nəzmdir dun
Kim, küfr oxunur kəlami-mövzun.
5. Bir mülkdəyəm ki, gər udub qan,
Məzmuni-ibarətə çəkib can;
Min riştəyə türfə lə'l çəksəm,
Min rövzəyə nazənin gül əksəm,
Qılmaz ona hiç kim nəzarə,
Derlər gülə xar, lə'lə xarə.
6. Ancaq deməzəm ki, xaki - Bağdad
Alayişi-nəzmdəndir azad.
Yoxdur bir mülk bu zamanda
Kim, nəzm revacı ola onda.
7. Nə hind, nə fars, nə Xorasan,
Nə Rumü Əcəm, nə Şamü Şirvan,
Olsaydı birində bir süxənsənc,
Əlbəttə, əyan olurdu ol gənc.
8. Gəncineyi-nəzm gizli qalmaz,
Sanmın günəş olsa nur salmaz.
Kanı necə kim nihan tutar daş,
Eylər onu lə'l aləmə faş;

## BU, QÜDRƏTİN YOXLUXUNUN VƏ QÜVVƏTİN OLMADIĞININ ÜZR İSTƏMƏKLƏ BƏYANIDIR

1. Ey saqi, söhbətə ziynət ver! Badə ver, insafın olsun, saqi! Bir cam ilə keyfimi təzələ, rəhm eylə, bir yaxşılıq göstər!

2. Qəm mərhələsində tək qalmışam, nə yarım, nə həmdəmim, nə həmdərdim var. Həmcinslərim hamısı gedib, söz mülkünün nizamı pozulub.

3. Bu məclisdə bir sən və bir mən qalmışıq, gəl bu məclisi bəzəyək. Sən badə ver, mənsə içim! Mən şe'r deyim, sən qulaq as!

4. Bir dövrdəyəm ki, nəzm olub xar, şe'r qiymətdən düşüb. Nəzmin qədri o yerə çatıbdır ki, şe'rlə deyilən söz küfr hesab edilir.

5. Bir mülkdəyəm ki, əgər qan udub, söz seçmək üçün canımı verib, min sapa qiymətli daşlar (incilər) düzsən, min bağçaya gül-çiçək əksəm, ona heç kəs baxmaz, gülə tikan, tikana gül deyərlər.

6. Ancaq demərəm ki, Bağdad torpağı şe'rlə bəzənməkdən azaddır. Zəmanəmizdə elə bir mülk(ölkə) yoxdur ki, orada şe'r inkişaf etmiş olsun.

7. İstər hind, istər fars və ya Xorasan, istərsə də Rum, Əcəm, Şam və ya Şirvan - birində bir söz ustası tapılırsa, əlbəttə o xəzinə dərhal üzə çıxır.

8. Nəzm xəzinəsi gizli qalmaz. Sanmayın ki, günəş olar, amma işıq salmaz. Daş mə'dəni gizlətmək istər, ləl'-cəvahir isə onu aləmə bildirər.

9. Hala məgər iqtizayi-dövran
Oldur ki, ola o gənc pünhan.
Dövran ilə mən nəqiz seyrəm,
Dövr əhlindən məgər ki, qeyrəm
10. Dövran istər ki, xar ola nəzm,
Biizzətü e'tibar ola nəzm;
Mən müntəzirəm verəm rəvacın,
Bimar isə eyləyəm əlacın.
11. Ol nəfyi-kəmali-hikmət eylər,
Lazım bilirəm xəsarət eylər.
Tə'miri-xərabə talibəm mən,
Inşəallah ki, ğalibəm mən.

9. Bəlkə xəzinənin gizli qalması hələlik zamanın tələbidir. Mənim baxışım zəmanədən fərqlənir, dövr əhli bir cürədir, mən başqa cür.

10. Dövran nəzmin xar və şərəfsiz, e'tibarsız olmağını istəyirsə, mən onun köməyinə gəlməyə hazıram, xəstədirsə əlac edərəm.

11. O, kamalın hikmətini inkar edər, əslində özünə ziyan vurar. Mənsə xarabaları tə'mir etmək arzusundayam və inşallah qalib çıxaram.

## SAQİNAMƏ

1. Saqi, məded et ki, dərdməndəm,
Ğəm silsilesinə paybəndəm.
Ğəm def'inə cami-mey dəvadır,
Tədbiri-qəm eyləmək rəvadır.
2. Sənden nə inayət olsa vaqe,
Fikr etmə ki, mende ola zaye.
Mən bir sədəfəm, sən əbri-niysan,
Ver qətrəvü al dürri-ğəltan.
Sənsən xurşidü mən siyəh xak,
Ver ateşü al cəvahiri-pak.
3. Rəhm et ki, ğəribü xaksarəm,
Bimunisü yarü ğəmküsarəm.
Ol bir neçə həmdəmi-müvafiq,
Yə'ni şüərayi-dövri-sabiq
Tədric ilə gəldilər cəhanə,
Tə'zim ilə oldular rəvanə.
4. Dövran oları müəzzəm etdi,
Hər dövr birin mükərrəm etdi.
Hər birinə hami oldu bir şah,
Zövqi-süxənindən oldu agah.
Türkü ərəbü əcəmdə əyyam,
Hər şairə vermiş idi bir kam.
5. Şad etmiş idi Əbunəvası
Harun xəlifənin ətası.
Bulmuşdu səfayi-dil Nizami,
Şirvanşahə düşüb girami.
Olmuşdu Nəvaiyi-süxəndan
Mənzuri-şəhənşəhi-Xorasan.
6. Söz gövhərinə nəzər salanlar,
Gəncinə verib gühər alanlar,
Çün qalmadı, qalmadı fəsahət,
Ərbabi-fəsahət içrə rahət.
Ol taifə çəkdi xirqəyə baş,
Halətlərin etməz oldular faş.
7. Ta olmaya rəsmi-şe'r məfqud,
Əbvabi-fünuni-nəzm məsdud,
Lazım mənə oldu hifzi-qanun,
Zəbti-nəsəqi-kəlami-mövzun.
8. Naçar tutub təriqi-namus,
Rahətdən olub müdam mə'yus,
Əhdi sözə istivar qıldım,
Əş'ar demək şüar qıldım.

## SAQİNAMƏ

1. Saqi, kömək elə, dərdliyəm! Qəm zəncirilə ayağım bağlıdır. Qəmi dağıtmaq üçün mey camı dərmandır, qəmə çarə eləmək düzgündür.

2. Sən nə kömək göstərirsən göstər, zənn etmə ki, itirərəm. Mən bir sədəfəm, sən yağış suyu. Damcı ver - dürr al. Sən günəşsən, mən qara torpaq. İstilik ver, saf cəvahir al.

3. Rəhmin gəlsin, mən qərib və dərdliyəm. Nə dostum, nə də həmdərdim var. Bir neçə həmdəmim olubsa da, (köhnə dövrlərin şairlərini deyirəm) hərəsi bir vaxtda dünyaya gəlib, tə'zim edib getdilər.

4. Onları dövran ucaltdı, hər dövr birini hörmət sahibi etdi. Hərəsinə bir şah hami oldu. Sözlərinin dadını türk də, ərəb də, əcəm də bilib hərəsinə bir kam verdilər.

5. Əbunəvası Harun xəlifənin bəxşişi şad etmişdi. Saf dilli Nizami Şirvan şahının qayğısı ilə rahatlıq tapmışdı. Söz sərrafı Nəvai Xorasan şahənşahından hörmət görmüşdü.

6. Söz gövhərinə nəzər salanlar, xəzinə verib gövhər alanlar artıq qalmadığı üçün, gözəl söz qalmadığı üçün, söz əhli hərəsi başını öz xirqəsinə çəkib halətlərini gizlədi.

7. Şe'rin yolu azmasın, nəzmin nəfəsi daralmasın deyə, mən bu yolu qorumaq və mənzum sözə sahib durmağı lazım bildim.

8. Əlacsız qeyrətə qısılıb, həmişəlik rahatlığımı itirib sözlə möhkəm əhd bağladım, şe'r deməyi özümə şüar elədim.

9. Çün xəlqə xilafi-müddəayəm,
Onlar zə'mincə süst rə'yəm.
Hər söz ki, gəlir zühurə məndən,
Min tə'nə bulur hər əncümən̈dən.
Eylər həsəd əhli bağlayıb kin,
Təhsin əvəzinə nəfyü nifrin.

10. Ümmid ki, rəf olub küdurət,
Təğyirpəzir ola bu surət.
Ol qövm bu gülşənə girəndə.
Bu gülşən içində gül dərəndə,
Gül tazə idivü səbzə növxiz,
Tərpəndikcə nəsimi-gülriz.
Onlar gülü dərdilər, məni-zar
Hala diləram dərəm xəsü xar.

11. Bu bəzmə olar verəndə təzyin
Mey saf idi, bəzm həm növayin.
Mey safi olara oldu ruzi,
Qaldı mənə daği-dürd suzi.
Bu dürdə mən olmuşam havaxah,
Bir nəş'ə verərmi, bilməzəm, ah!

9. Xalq sözümü və düşüncəmi səhv və düşmənçilik bildiyi üçün hər dediyim söz camaatın min tə'nəsilə qarşılanır. Həsəd çəkənlər mənə kin bağlayıb, afərin yerinə lə'nət yağdırdılar.

10. Ümid edirəm ki, bu kədər keçəcək, bu şəkil dəyişəcək. Qədim şairlər bu gülşənə girəndə və gül dərəndə güllər, yaşıllıq təzə idi. Gülaçan külək əsdikcə onlar da gül topladılar. Mən ağlar isə indi çör-çöp yığmaq diləyindəyəm.

11. Onlar bu məclisi bəzəyəndə şərab saf və məclis təzə idi. Meyin safı onların payına, xıltının dağı isə mənə düşdü. Mən bu dərdin istəklisiyəm; ah, bilmirəm, bir nəş'ə verərmi?!

## BU, SAQİYİ-BƏZMƏ BADƏ ÜÇÜN XİTABDIR

1. Saqi kərəm eylə, cam gəzdir!
Tutma qədəhi, müdam gəzdir!
Dövranə çox e'tibar qılma,
Gəzdir qədəhi, qərar qılma!
2. Tök alıb ələ gümüş sürahi,
Zər sağərə ruhbəxş rahi.
Sərf eylə riayətimdə əltaf,
Tənhalığımı gör, eylə insaf!
Şüğlüm bu büsat içində çoxdur,
Səndən özgə mədədçi yoxdur.
3. Həmdəmliyim ilə ar qılma!
Məndən nifrət şüar qılma!
Gər bilməz isən ki, mən də zatəm,
Nə zülməti-çeşmeyi-həyatəm,
Feyzi-hünərim şərabdən sor,
Suzi-cigərim kəbabdən sor.
4. Tutsan əlini məni-fəqirin,
Həqq ola həmişə dəstgirin.
Mən şairi Museyi-kəlaməm,
Sahirlərə mö'cizi-təmaməm.
Mən sahiri-Babili-nəjadəm,
Harutə bu işdə ustadəm.
5. Söz dərkinə sərf edib fərasət,
Əmlakına bulmuşam rəyasət.
Gəh tərzi-qəsidə eylərəm saz,
Şəhbazım olur büləndpərvaz.
6. Gəh dəbi-qəzəl olur şüarım,
Ol də'bə rəvan verər qərarım.
Gəh məsnəviyə olub həvəsnak,
Ol bəhrdə istərəm düri-pak.
7. Hər dildə ki, var əhli-razəm,
Məcmui-fünunə eşqbazəm.
Bir karigərəm həzar pişə,
Canlar çəkib istərəm həmişə
Dükkanım ola rəvaci-bazar,
Hər istədigin bula xiridar.

## BU, MƏCLİS SAQİSİNƏ ŞƏRAB ÜÇÜN XİTABDIR

1. Saqi, rəhmin gəlsin, cam gəzdir! Saxlama, müdam gəzdir! Dövrana çox da bel bağlama, qədəh gəzdir, dayanma, durma!

2. Gümüş qədəhi əlinə alıb, ruh açan qızıl badə ilə doldur. Mənim qulluğumda dur, tənhalığımı gör, insaf elə! Işim çoxdur! Səndən başqa köməkçim yoxdur.

3. Dostluğumdan utanma! Mənə nifrət eləmə! Əgər nə varlıq olduğumu, bu zülmətdə hansı dirilik çeşməsi olduğumu bilmək istəyirsənsə, hünərimin feyzini şərabdan, ciyərimin yanmağını kababdan soruş.

4. Mən yazığın əlindən tutsan, haqq həmişə sənin əlini tutacaqdır. Mən Musa kəlamlı şairəm, sehrbazlar üçün də mö'cüzəm. Mən Babilli sehrbazam, Haruta da bu işdə ustadam.

5. Söz anlamaqda fərasətli tərpənib onun mülkünə sahib olmuşam. Gah ilhamımın qartalı qəsidə yazmaqda göyə ucalıb.

6. Gah qəzəli şüar edib, bu yola düzəlirəm. Gah məsnəvi həvəsinə düşüb onun bəhrindən saf inci axtarıram.

7. Bütün dillərin sirdaşıyam, bütün elmlərlə sevişirəm. Min peşəli bir fəhləyəm; bazarımın genişliyi və kim nə istəsə tapa bilməsi yolunda can qoymuşam.

## BU, BIR TƏRİQ ILƏ KƏSRİ-NƏFSDİR VƏ MÜQƏDDİMEYİ-MƏDHİ-PADİŞAHİ-ƏSRDİR

1. Saqi, nə idi bu cami-gülgun
Kim, eylədi halımı digərgun?
Sərməst olubam, sözüm həbadır,
Hər laf ki, eylərəm - xətadır.
Tə'miri salıb dimağə təşvir,
Təşviri məzacım etdi təğyir.
2. Mən qandanü lafi-hüsni-köftar
Kim, söz deməyə olam səzavar.
Olsaydı mənim sözümdə bir hal,
Əlbəttə, olurdum əhli-iqbal.
Müstövcibi-izzü cah olurdum,
Şayəstəyi-barigah olurdum.
Məqbul düşərdim asitanə,
Mənzuri-şəhənşəhi-zəmanə.
3. Ol padişəhi-büləndbiniş
Kim, xaki-rəhidir afəriniş,
Müstəhfəzi-din, pənahi-islam,
Məxdumi-zaman, məlazi-əyyam,
Əbr istehsanü bərqi-kinə,
Şahənşəhi-Məkkəvü Mədinə,
4. Məstəlzəmi-həqq, müxilli-batil,
Sultani-muradbəxşi-adil,
Ərbabi-hünər ümidgahi,
Türkü ərəbü əcəm pənahi,
5. Dərya kimi eyləyən dəmadəm
Əndişeyi-qürbü bö'di-aləm,
Lütfilə verən yaxına lö'lü,
Əbrilə irağə göndərən su,
6. Lö'lösini eyləyən cahantab,
Ləbteşnələri dür ilə siyrab,
Gərdun kimi lütf edəndə zahir,
Damən-damən tökən cəvahir,
7. Gün kimi olanda cudə məzhər,
Xərmən-xərmən nisar edən zər,
Tüğray misal ali-Osman,
Sultani-süpəhşikən Süleyman,
8. Yerdə düşər olsa feyzi xakə,
Tə'n eyləyə xak ruhi-pakə.
Göydə nəzər etsə gər hümayə,
Xurşid salur hümayə sayə.

## BU, BIR NÖV NƏFSİMİN QƏRƏZSİZLİYİNİN VƏ ƏSRİN PADİŞAHININ TƏ'RİFİNİN MÜQƏDDƏMƏSİDİR

1. Saqi, bu gül rəngli cam nə idi ki, halımı dəyişdi; hər nə danışıramsa bütün xətadır? Tə'siri beynimə qarışıqlıq gətirdi, micazımı dəyişdirdi.

2. Mən hara, sözün lətafətilə lovğalanmaq hara ki, söz deməyə qadir olam? Sözümdə bir hal olsaydı, əlbəttə, mən də xoşbəxt olardım, izzət, cah-cəlal sahibi olardım, saraylara layiq sayılardım. Sarayda qəbul olunub cahan şahının gözünə dəyərdim.

3. O padşah ki, uzaqgörəndir, dünya onun ayağının tozudur. Dinin qoruyucusu, islamın arxasıdır, zəmanəmizin hökmdarıdır, dövrümüzün sığınacağıdır. Səxavət bulududur, vuruşda isə şimşəkdir. Məkkə və Mədinənin şahlar şahıdır.

4. Haqqı tutan, batili pozan, bəxşiş sahibi ədalətli sultan! Hünər əhlinin ümidgahı, türkün, ərəbin, əcəmin pənahı.

5. Dəniz kimi daim çalxanıb, dünyanın bu gününü və sabahını düşünən! Lütf ilə yaxına inci, uzağa buludlarla su göndərən!

6. Inci səpərək dünyanı işıqlandıran, dodağı, çatlayanları sudan doyuran! Göylər kimi mərhəmət göstərəndə ətək-ətək cəvahir səpən.

7. Günəş kimi səxavətlə göründükdə xırman-xırman qızıl yığdıran, Osman ailəsinin tuğrası-əmr möhürü olan, ordular dağıdan Sultan Süleyman!

8. Feyzi torpağa düşəndə torpaq ucalıb pak ruha tə'nə vurar. Göydə bir huma quşuna nəzər salanda onun qanadları günəşə kölgə salar.

9. Gər Şərqə ura sinani-sərkəş,
Gün kimi çıxar süpehrə atəş,
Vər Ğərbə çalarsa tiği-bürran,
Gərdunə yetər şəfəq kimi qan

9. Nizəsinin ucunu şərqə çevirsə, gün kimi göylərə atəş saçar, keskin qılıncını qərbə çalarsa, qan şəfəq kimi göyləri bürüyər.

10. Dün çərx yana nigah qıldım,
Nəzzareyi-lövhü mah qıldım,
Gördüm bu xəti ki, xameyi-xur,
Ol lövhdə eyləmişdi məstur.

10. Gecə göylərə baxdım, ayın löhvəsinə nəzər saldım, bir yazı gördüm:

11. Yarəb ki, müzəffər ola daim,
Zatilə binayi-ədl qaim,
Şayəstə ona səririi əfsər,
Aləmlərə ədli sayəgüstər.

11. Ya rəb, həmişə qalib olsun. Zatı ilə ədalət, binası həmişəlik olsun. Ona sərkərdəlik və dünyada ədalətin qoruyucu olmaq yaraşır.

## BU QƏSİDƏ PADİIŞAHİ-İSLAM ŞƏ'NİNƏDİR

1. Zəhi-kamil ki, əqli-nüktədan dərkində heyrandır,
Vücudi-bimisali intixabi-növi-insandır.

2. Fələk bir dürc, onun ati-şərifi gövhəri-yekta,
Cahan bir cism, onun hökmi-rəvani, filməsəl, candır.

3. Əsasi-hökmidir, mə'nidə bir səddi-Skəndər kim,
Onun yə'cucdir, bir yanivü bir yanı insandır.

4. Binayi-qədrdir mə'nidə ol ali imarət kim,
Müqərnəs taqi-gərdun ol imarətdən bir eyvandır.

5. Müzəffər daima Sultan Süleyman xani-adildir.
Ki, hər kim tabeyi-fərmanı olmaz - namüsəlmandır.

6. Cahangiri ki, gün tək mülk təsxirinə əzm etsə,
Mühəqqər cilvəgahı ərseyi-İranü Turandır.

7. Süxən təb'i, mürüvvət pişeyi kim, bəhri-əltafi,
Təməvvüc qılsa mövcü fəqr bünyadinə tufandır.

8. Kəminə kimseyə kəmtər ətası hasili-dərya,
Mühəqqər məclisə bəzli-həqiri bəhreyi-kandır.

9. Vücudi-pak ilə həq rəhmətidir aləmə nazil,
İtaət əhlinə göstərdiyi ədl ilə ehsandır.

10. Süleyman bargahidir yeqin heybətli dərgahi
Kim, onda divlər tabe, pərilər bəndəfərmandır.

## BU QƏSİDƏ ISLAM PADİŞAHI ŞƏ'NİNƏDİR

1. Elə bir kamildir ki, inciləri seçə bilən ağılda ona heyrandır. Misli görünməmiş vücudu ilə insanların ən seçilmişidir.

2. Fələk bir mücridir, o isə fələyin insanlar arasında tək bilib seçdiyi gövhərdir. Dünya cisimdir, onun şərəfli zatı isə cismi içində candır.

3. Mülkünün təməli əslində bir Iskəndər səddidir ki, bir yanı yəcucdur, bir yanı insandır.

4. Qüdrətinin binası bir uca imarətdir ki, göy qübbəsi onun eyvanıdır.

5. Ədalətli ürək sahibi Sultan Süleyman daima müzəffərdir, onun fərmanına tabe olmayan müsəlman deyil.

6. O dünya fatehi bir günəş kimi mülk tutmaq fikrinə düşsə, İran da, Turan da onun gəzinti yeridir.

7. Mərdliyi və sözübütövlüyü özünə adət etmişdir, onun lütfü dəniz kimi dalğalanarsa, fəqirliyi kökündən qoparacaq bir tufan qopar.

8. Kimsəsiz bir kimsəyə kiçik bir bəxşişi bütöv bir dəryanın incisini andırar. Kiçik bir məclisə balaca bir töhfəsi böyük bir kanın bəhəridir.

9. Nazil olmuş pak vücudu ilə aləmə haqq mərhəmətidir, itaət əhlinə ədalət və ehsandır.

10. Onun möhtəşəm dərgahı sanki Süleyman qəsridir, bu mülkə divlər tabedir, pərilər buyruq gözləyirlər.

11. Müəzzəm ləşkəridir bir bulut kim, düşmənə ondan
Firəngilər sədası rə'd, toplar daşı barandır.

11. Ordusu bulud kimidir, firəngilərin səsi göy gurultusuna, toplarının daşı yağışa bənzəyir.

12. Səməndi səgridəndə lame' olmuş əxtəri-saqib,
Süpahi dəprənəndə mövcə gəlmiş bəhri-ümmandır.

12. Atını səyirdəndə sönmüş ulduzlar belə parlayır, qoşunu tərpənəndə dalğalanan dənizi andırır.

13. Səfərdə çəkmək üçün heşmətü iqbal əsbabın,
Ərabə ərş lövhi, ordusu gərduni-gərdandır.

13. Səfərdə onun xidmətlərini və rahatlıq əşyasını daşımaq üçün göy üzü onun arabasına, fələksə ordusuna oxşayır.

14. Zəmanində yetib cəm'iyyəti-əsbabə ariflər,
Olub dərhəm həmin məhbublar zülfi pərişandır.

14. Zamanının arifləri bütün istədiklərinə çatıblar və o məhbublar zülf kimi bir-birinə dolaşıblar.

15. Xəlayiq sübh tək xəndan olub mehri-cəmalindən,
Dili-suzan ilə dövründə ancaq şəm' giryandır.

15. Üzünün günəşindən bütün xalq sübh kimi gülür, dövründə ürəyi yanan təkcə ağlar şamdır.

16. Həvadisdən məzaci-mülk tə'mirinə imkan yox,
Kəmali-ədl ilə ta mülkə Osman oğlu sultandır.

16. Ölkəyə, tam ədaləti ilə, Osman oğlu Sultan olandan bəri məmləkətin təbii fəlakətdən belə pozulmasına imkan yoxdur.

17. Behəmdillah, bugün xovfü xətadən şər' namusun
Bulub tovfiqi-nüsrət saxlayan Sultan Süleymandır.

17. Allaha şükr ki, şəriətin namusunu qorxu və fəlakətdən qoruyan Sultan Süleymandır.

18. Nişani-feyzdir ol nüsrətü iqbal kim, hala
Nə yan kim, əzm qılsa, rəhbəri tə'yidi-yəzdandır.

18. Zəfər və bəxt onun feyzinin əsəridir, hansı yana üzünü tutsa, rəhbəri allahın köməyidir.

19. Dilü candan, Füzuli, əzm iqbalinə ol şahın,
Riyazi-heqq üçün daim duaguyi-sənaxandır.

19. Füzuli allahın razılığı ilə şahın iqbalını ürəkdən öyür.

20. Çü oldur hamiyi-islam vacibdir onun mədhi,
Nə kim, mədhindən özgə söz demiş ondan peşmandır.

20. Çünki, o islamın qoruyucusudur, haqqında tə'rifdən başqa kim bir söz deyibsə, peşmandır.

21. Ilahi, baqi olsun daim insanpərvər iqbali
Cahani-fani içrə ta bəqayi-növ'i-insandır.

21. Ilahi, bu fani dünyada insan övladı var olduqca, onun insanpərvər bəxti həmişəlik olsun.

## BU, SƏBƏBİ-NƏZMİ-KİTABDIR
## VƏ
## BAİSİ-İRTİKABİ-ƏZABDIR

1.Saqi, tut əlim ki, xəstəhaləm!
Ğəm rəhgüzərində payimaləm.
Sənsən məni-mübtəlayə ğəmxar,
Səndən özgə dəxi kimim var?
2. Müşkül işə düşmüşəm, mədəd qıl,
Mey hirzi ilə bəlamı rəd qıl!
Həll eyləyə gör bu müşkülatı,
Kəm etmə qulundan iltifatı!
3. Bir gün ki, meyi-süheyl tə'sir,
Vermişdi mizaci-pakə təğyir,
Həmrəngi-bəhar olub xəzanım,
Dönmüşdü əqiqə zə'fəranım,
4. Cəm idi yanımda ittifaqi:
Sazü məzəvü şərabü saqi.
Peyvəstə ləbaləbü peyapey
Nuş eylər idim qədəh-qədəh mey.
Zövq üzrə mey artırırdı zövqüm,
Şövq üzrə ziyad olurdu şövqüm.
5. Ol bəzm idi afiyət baharı,
Mən bülbüli-zari-biqərarı.
Bir həddə irişdi nəş'əyi-cam
Kim, qalmadı əhli-bəzmə aram.
Əsrari-dil oldu aşikara,
Məsdud oluban dəmi-müdara
6. Olmuşdu rəfiqü həmzəbanım,
Ayineyi-tutiyi-rəvanım,
Bir neçə zərifi-xütteyi-Rum,
Rumi ki, dedin, qəziyyə mə'lum.
Yə'ni ki, qamu dəqaiq əhli,
Hər məs'ələdə həqaiq əhli.
Həm elm fənində nüktədanlar,
Həm söz rəvişində dürfəşanlar.
7. Kim eylər idi həqaiqi-raz,
Şeyxidənü Əhmədidən ağaz.
Kim söylər idi öğüb kəlami,
Övsafi-Cəliliyü Nizami.
8. Bilmişlər idi ki, hüsni-göftar
Qədrim qədərincə məndə həm var,
Çün var idi məstlikdə lafım,
Ta anlana sidqimü xilafım,
Mən xəsteyi etdilər nişanə,
Bir rəng ilə tiri-imtəhanə.

## BU, KİTABIN YAZILMASININ SƏBƏBİDİR
## VƏ
## ƏZAB-FƏLAKƏTİN BAİSİDİR

1. Saqi, əlimdən tut, xəstəyəm! Qəm yollarında ayaq altda qalmışam! Mən mübtəlanın qəmxarı sənsən, səndən başqa kimim var?

2. Çətinə düşmüşəm, kömək yetir, mey ilə məni bəladan qurtar. Kömək əlini qulundan əsirgəmə, məni bu çətinlikdən çıxar.

3. Bir gün süheyl kimi parlaq meyin tə'sirindən pak əhvalım xoşalmışdı, payızım bahar rənginə bürünmüşdü, zəfəran rəngli sifətim qızıl rəngi almışdı.

4. Saz, dadlı şərab, çərəz və saqi önümdə cəmlənmişdi. Arası kəsilmədən dolu qədəhləri boşaldırdım. Mey zövq içində zövqümü, şövq içində şövqümü artırırdı.

5. Məclis xoşbəxtlik baharı idisə, o baharın ağlar və səbirsiz bülbülüydüm. Camın nəş'əsi elə bir həddə çatdı ki, məclis əhlinin səbri qalmadı, ürək sirri açıldı, nəş'ə unuduldu.

6. Rum elinin bir neçə zərifi, mənim dil bilən dostlarım şirin nəğməmin güzgüsü olmuşdular. Rum deyəndə məsələ mə'lumdur, yə'ni ki, hamısı həqiqət və zəriflik əhli, həm elmdə incəlikləri seçənlər və həm də sözdən incisaçanlar idilər.

7. Kimi sirr açmaq istəyirdi, Şeyxidən və Əhmədidən deyirdi. Bə'ziləri də Cəlili və Nizaminin tə'rifindən danışırdı.

8. Bilmişdilər ki, mən də qüvvəm çatan qədər incə söz söyləyə bilirəm, məclisdə sərxoş olub lovğalandığım üçün onlar mənim düzlüyümü, əyriliyimi yoxlamaq məqsədilə, bir növ kələk işlədərək, mən xəstəni imtahan oxuna hədəf etdilər.

9. - "Lütf eylə! - dedilər, - ey süxənsənc!
Faş eylə cahanə bir nihan gənc!
Leyli-Məcnun əcəmdə çoxdur,
Ətrakdə ol fəsanə yoxdur.
Təqrirə gətir bu dastanı,
Qıl tazə bu əski bustanı".
10. Bildim bu qəziyyə imtəhandır,
Zira ki, bu bir bəlayi-candır.
Sövdası dirazü bəhri kutah,
Məzmunu fəğanü naləvü ah,
Bir bəzmi-müsibəti-bəladır
Kim, əvvəli ğəm, sonu fənadır.
11. Nə badəsinə nişatdən rəng,
Nə nəğməsinə fərəhdən ahəng.
İdrakı verər xəyala azar,
Əfkarı edər məlali əfkar.
12. Olsaydı təvəccöhü münasib,
Tövcihinə çox olurdu rağib.
Olsaydı təsərrüfündə rahət,
Çox kamil ona qılırdı rəğbət.
13. Billah ki, nə xoş demiş Nizami,
Bu babdə xətm edib kəlami:
"Əsbabi-soxən nişatü nazəst,
Zin hər do soxən bəhanəsazəst,
Meydani-soxən fərax bayəd.
Ta təb" süvareyi nomayəd.
Dər gərmiyi-rikü səxtiyi-kuh
Ta çənd soxən rəvəd bəənbuh?"
14. Bir iş ki, qılır şikayət ustad,
Şagirdə olur rücui bidad,
Gərçi, bilirəm, bu bir sitəmdir,
Təklifi bunun ğəm üzrə qəmdir,
Əmma necə etmək olur ikrah?
Bir vaqeədir ki, düşdü nagah.
Yeydir yenə üzrdən şüruim,
Bu işdə təvəkkülə rücuim.
15. Ey təb'i-lətifü əqli-vala!
İdraki-büləndü nitqi-guya!
Düşdü səfərim diyari-dərdə,
Kimdir mənə yar bu səfərdə?

9. "Lütf eylə, dedilər: - Ey söz sərrafı! Bir gizli xəzinəni də sən aç! Fars dilində Leyli-Məcnun əfsanəsi çoxdur, türklərinsə yoxdur. Bu dastanı tərpət, bu köhnə bustanı təzələ".

10. Bildim ki, bu qəzanın imtahanıdır, canın bəlasıdır, sevdası uzun, bəhri qısadır, məzmunu ah, nalə, fəğandır. Bir müsibət və bəla məclisidir ki, əvvəli qəm, sonu heçdir.

11. Nə badəsində nəş'ə rəngi, nə nəğməsində fərəh ahəngi vardır. Anlayanın ruhu əzab çəkir, düşünənin ağlı.

12. Əgər həlli asan olsaydı, bu yolda mənimlə yarışan da çox olardı. Bu işə qarışmaq rahatlıq gətirsəydi, çox ağıllılar onu seçərdi.

13. Allaha and olsun, Nizami necə də xoş deyib və bu məsələdə sözü tamamlayıb:
Şadlıqdır, eyhamdır sözün arğacı*,
Bunlarla düzəlir söz ehtiyacı.
Gərək söz meydanı gen olsun müdam,
Atını dörd yana səyritsin ilham.
Qumsala, daşlığa ilham gedərmi
Getsə də torpağa tə'sir edərmi?

14. Bir işdən ki, ustad şikayət etsin, şagirdin buna müraciət etməsinə lüzum varmı? Düzdür, bilirəm ki, bu zülmdür, qəm üstünə qəm gəlməkdir. Amma necə imtina edim. Gözlənilmədən başıma gələn işdir. Üzr istəməkdənsə, çalışıb bir iş görməyim yaxşıdır.

15. Ey zərif təbim və uca ağılım! Yüksək idrakım və parlaq nitqim. Səfərim dərd çölünə düşüb, mənə bu yolda kim dost olacaq?

16. Hər kimdə ki, vardır istitaət,
Dərdü ğəmü möhnətü qənaət,
Oldur bu müsafirətdə yarım,
Zövq əhlinə yoxdur e'tibarım.
Mərkəb gərək olsa əzmi-rahə,
Bəsdir bizə xaməvü siyahə.
Vər tuşeyi-rah olursa mətlub,
Məzmuni-xoşü ibarəti-xub,

16. Kimin ki, dərd-qəm və möhnət dözümü var, bu yolda mənim dostum olur. Keyf əhlinə e'tibarım yoxdur. Əgər minik gərək olsa, biz qələm və kağızla kifayətlənməliyik. Azuqə gərək olsa, bizə xoş məzmun və gözəl sözlər bəs eləməlidir.

17. Əzm eyləyəlim, təəllül etmən!
Mənzil kəsəlim, təğafül etmən!
Ey bəxt, vəfasız olma, sən həm!
Həmrahlıq et bizimlə bir dəm!

17. Yuxuya qalmayaq, yola düşək! Mənzil kəsək, vaxt itirməyək. Ey bəxt sən də vəfasız olma, bizimlə bir müddət yoldaşlıq et!

## BU, SƏADƏTLİ BƏY HƏZRƏTLƏRİNİN MƏDHİDİR

1. Ey xameyi-sərkəşi-səbükxiz,
Vəqt oldu ki, olasan gühərriz!
Mən acizəmü bu əmr müşkil,
Imdad dəmidir, olma ğafil!
Asari-mürüvvət eylə izhar,
Bir təprən, əgər mürüvvətin var!
Sən qıl hünəri mən alayım ad,
Sən çək ələmi, mən olayım şad.
2. Çün nəxli-hədiqeyi-hünərsən,
Miftahi-xəzaneyi-gühərsən.
Cəhd eylə çıxar cəvahiri-pak,
Fikr etmə ki, yoxdur əhli-idrak!
Demə ki, bolub kəsad bazar,
Bulmaz bu mətaimiz xiridar.
3. Yetməzmi sənə əmiri-kamil,
Sərdari-zəmanə, Veysi-adil?
Ol bəhri-ətavü kani-əltaf
Kim, şə'ninə gəldi ədlü insaf.
4. Sərdari-müəzzəmü mükərrəm,
Cananeyi-mülkü cani-aləm.
Zatında onun həmişə mövcud,
Elmü ədəbü şücaətü cud.
5. Ədlindən əgər təraneyi-çəng,
Faş eyləyə bəzmdə bir ahəng,
Yel şəm'ə dəxi təərrüz etməz,
Pərvanəyə şəm' zülmü yetməz.
6. Hüsni-ədəb ilə eylə mö'tad,
Yanında nə vəqt qılsalar yad,
Ol sözü deməz ki, ola təkrar,
Ta yetməyə sayəsində azar.
Üslubi-şücaət üzrə mahir,
Xurşid sifət cahanda zahir.
7. Həm xas onu söyləməkdə, həm am,
Həm Rum dolu adıyla, həm Şam,
Gər cudinə kimsə olsa talib,
Mümkün ola lütfi qəhrə ğalib.
Yə'ni mənə öyrədib səxavət,
Bir hacəti istəmək nə hacət?
Olmuş ona xaneyi-əmarət
Bu dörd bina ilə imarət

## BU, SƏADƏTLİ BƏY HƏZRƏTLƏRİNİN MƏDHİDİR

1. Ey başı uca, ayağı iti qələm! Gövhər saçmaq zamanıdır! Bu iş çətindir, mənsə gücsüzəm, kömək vaxtıdır, xəbərin olsun! Insaf elə, bir tərpən. Sən hünər göstər, mən ad qazanım. Sən bayraq ucalt, mən sevinim.

2. Indiki, hünər bağçasının xurma ağacısan, gövhər xəzinəsinin açarısan, cəhd elə saf cəvahir çıxar, elə bilmə ki, idrak əhli yoxdur. Demə ki, bazar kasadlaşıb və mətahımızın alıcısı tapılmaz.

3. Zamanın Sərdarı kamil və adil əmiri Veys sənə bəs etməzmi? O ehsan dənizidir, lütf kanıdır. Ədalət və insaf onun şəninə yaraşır.

4. Əzəmətli və səxavətli sərdardır, dünyanın canı və ölkənin sevimlisidir. Elm, ədəb, şücaət və səxavət onun vücudundadır.

5. Əgər məclisdə çəng təranəsi onun ədalətindən bir mahnı ucaltsa, külək şama basqın etməz, şam pərvanəyə zülmünü dayandırar.

6. Onun adı yanında çəkilərsə ədəblə dinlə. O dediyini bir də deməz, kölgəsinə belə azar yetirməz. Cəsarətində ustadır. O günəş sifətli bütün aləmi işıqlandırır.

7. Həm adlı-sanlılar, həm də sadə adamlar ondan danışır. Rum və Şam da onun adıyla doludur. Birinin onun səxavətinə ehtiyacı olsa, mərhəmət, qəzəbə üstün gələr. Odur ki, mən ona ehtiyacımı açmağa ehtiyac qalmaz. Onun əmirlik sarayı bu dörd binadan* qurulmuşdur.

8. Ey dustnəvazü düşmənəndaz,
Şahinrəvişü büləndpərvaz!
Düzdüm sənə türfə aşiyanə,
Yə'ni əbədi nişatxanə.
9. Mə'mur edibən binayi-ali,
Cənnət sifəti, irəm misali.
Ta ruzi-əbəd bunu məqam et.
Bidəğdəğə işrəti-müdam et!
10. Billah ki, deyil yaman əsər bu,
Gər adisə müddəa yetər bu.
Mən kim sənə olmuşam sənaxan
Sultan Veysə necə ki, Səlman,
Budur ğərəzim ki, cavidani
Adın tuta ərseyi-cahani.
Ta baqi ola bu səbz gülşən,
Həm mən olum əhli-zikr, həm sən.

8. Ey dostu oxşayan, düşməni yerə vuran, şahin xislətli yüksəklərə ucalan, sənə türfə bir yuva tikdim - yə'ni əbədi sevinc evi.

9. Cənnətə oxşar və irəmə bənzər əzəmətli bir bina ucaltdım. Əbədilik orada yaşa. Bu bağda həmişəlik eyş və işrət eylə.

10. Allaha and olsun, bu pis əsər deyil, əgər ad məqsəddirsə, bu yetər. Səlman Sultan Veysi tə'rif elədiyi kimi, mən də səni mədh eyləyirəm. Arzum budur ki, adın yer üzünü əbədilik tutsun. Bu yaşıl gülşən var ikən mən də, sən də həmişəlik yad edilək.

## BU, TUĞRAYİ-MİSALİ-MƏHƏBBƏTDİR VƏ DİBAÇEYİ-DİVANİ-MÖHNƏTDİR

1. Dehqani-hədiqeyi-hekayət,
Sərrafi-cəvahiri-rəvayət
Mə'ni çəmənində gül dikəndə,
Söz riştəsinə gühər çəkəndə
Qılmış bu rəvişdə nüktədanlıq,
Gülrizlikü gühərfəşanlıq
2. Kim: xeyli-ərəbdə bir cavanmərd,
Cəmiyyətü izzü cah ilə fərd,
Müstəcməi-cümleyi-fəzail,
Bulmuşdu rəyasəti-qəbail,
Əmrinə ərəb mütiü münqad,
Gəh Bəsrə məqamı, gah Bəğdad.
3. Bir büq'ədə olmayıb qərarı,
Gəzməkdə keçərdi ruzigarı.
Hər ləhzə urardı ol yeganə,
Sərçeşmələrə siyah xanə,
Seyr eylər idi sürüb tənə'üm,
Gözlər üzərə misali-mərdüm ,
Övzai-xiyami-mişkfami,
Xəlqə şəbi-qədr tək girami.
4. Hər mənzilə kim, güzar edərdi,
Səhrayi bənəfşəzar edərdi.
Gülzarlar içrə lalə çağı
Bənzərdi evinə lalə dağı.
5. Əmvalı cəmii-cinsdən çox,
Əmma bu cəhanda varisi yox.
Gər qılsa onu tələf həvadis.
Yox bir xələfi ki ola varis.
6. Fərzəndsiz ədəmi tələfdir,
Baqi edən ədəmi xələfdir.
Nəsl ilə olur bəqayi-insan,
Nəzmi-bəşərü nizami-dövran.
7. Can cövhərinə bədəldir övlad;
Övlad qoyan, qoyar həmin ad.
Xoş ol ki, xələfdən ola xoşdil,
Dünyada bir oğlu ola qabil,
Pirayəsi ola dəstgahə,
Sərmayəsi ola izzü cahə.

## BU, MƏHƏBBƏT MÖHÜRÜNƏ BİR MİSALDIR VƏ ƏZAB DİVANININ GİRİŞİDİR

1. Hekayə bağçasının bağbanı rəvayət cəvahirinin sərrafı, mə'na çəmənində gül əkəndə və söz sapına incilər düzəndə fikrini belə incələmiş, güllər və gövhərlər saçmış:

2. Ərəblər içərisində bir nəfər izzət və şərəfdə tək və bütün fəzilətləri özündə birləşdirən comərd qəbiləyə başçılıq edirdi. Ərəblər onun əmrinə baş əyirdi, gah Bəsrədə, gah Bağdadda gəzərdi.

3. Bir yerdə qərar tutmazdı, günləri gəzməklə keçərdi. O, çox çeşmələr başında çadırlar qurdurardı, naz-ne'mətdə, göz içində bəbək kimi dolanardı. Qara çadırları xalqa qədr gecəsi kimi əziz idi.

4. Hansı mənzilə ayaq qoysa səhranı bənövşəliyə çevirərdi. Gülzarlarda lalələr açılan zaman onun evi lalə köksündəki qara dağa bənzəyirdi.

5. Bütün növ var-dövləti var idi, amma sonsuzdu. Əgər bir fəlakətdən tələf olsaydı, bir oğlu yox idi ki, ona varislik etsin.

6. Oğulsuz insan yox kimidir. Insanı ölümsüz edən oğuldur. Bəşərin və dövranın əsası və qaydası budur.

7. Can cövhərinin əvəzi övladdır. Övladı olanın dünyada adı qalır. Xoş o kesdir ki, övladdan yarıyıb; qabiliyyətli oğlu var, dünya dəsgahını onunla bəzəyir, hörməti, izzəti onunla qazanır.

8. Ah, ər ola bir səfihü sərkeş,
Ətvari kərihü xülqi naxoş,
Təşni' oxuna olub nişanə,
Bizar ola ondan ata-anə.
9. Əlqissə, ol əfzəli-qəbail,
Ol piri-həmidətül-xəsail,
Fərzəndə olub həmişə talib,
Təhsili-bəqayi-nəslə rağib,
Çox mahliqa sənəmlər aldı,
Çox türfə zəminə töxm saldı.
10. Çox nəzrlər etdi hər məzarə,
Çox qıldı niyaz girdigarə,
Tə'sir qılıb fəğanü ahi,
Övn etdi inayəti-ilahi,
Bir gecə açıldı babi-rəhmət,
Buldu əsəri-dua icabət.
11. Məqsud şəmi münəvvər oldu,
Sənduqi-əməl dür ilə doldu.
Tədric ilə qıldı kilki-təqdir
Nəqşi-qərəzi rəhimdə təsvir.
12. Bər verdi nihali-bağı-məqsud,
Açıldı güli-hədiqeyi-cud.
Çün və'də irişdi, doğdu bir ay,
Xurşid rüxiylə aləmaray.
13. Şad oldular ondan ata-anə,
Şükranə verildi çox xəzanə.
Əlqissə, ədəmdən oldu peyda
Bir tifli-müzəkkərü müzəkka.
Xurşid kimi kəmalə qabil,
İsa kimi tifllikdə kamil.
14. Ol dəm ki, bu xakdanə düşdü,
Halını bilib fəğanə düşdü.
Axır günün əvvəl eyləyib yad,
Axıtdı sirişkü qıldı fəryad.
Yə'ni ki: "Vücud dami-ğəmdir;
Azadələrin yeri ədəmdir.
Hər kim ki, əsir olur bu damə,
Səbr etsə gərək ğəmi-müdamə".
15. Olmuşdu zəbani-hali guya
Söylərdi ki: "Ey cəfaçı dünya!
Bildim ğəmini sənin ki, çoxdur,
Ğəm çəkməyə bir hərif yoxdur.
Gəldim ki, olam ğəmin hərifi,
Gəl təcrübə eylə mən zəifi!
Hər qanda ğəm ola, qılma ehmal,
Cəm eylə, dili-həzinimə sal!

8. Vay o gündən ki, pozğun, pis xasiyyətli, səfeh, başı boş bir övladın ola. Ata-ana tə'nə oxuna nişan olub övladdan bezə.

9. Qısası, o gözəl xasiyyətli insan həmişə oğul həsrətində, nəslini davam etdirmək arzusundaydı. Çox ayüzlü sənəmlərlə evləndi, çox növ torpağa toxum səpdi.

10. Çox məzara nəzir dedi, tanrıya çox yalvardı. Ahının tə'siri oldu, allahın mərhəməti ona yar oldu, mərhəmət qapısı açıldı, duası qəbul olundu.

11. Məqsədinin şamı yandı, ümid sandığı dürlə doldu. Tədriclə qadirin qələmi bətndə istənilən naxışı çəkdi.

12. Arzu bağının cavan ağacı bar verdi, səxavət bağının gülü açıldı. Vaxt yetişəndə günəş simalı, dünyanı bəzəyən bir ay doğuldu.

13. Ata-ana çox şad oldu, xəzinələr payladılar. Heçlikdən bir zəkalı oğlan uşağı dünyaya gəldi. O, gün kimi kamallı, İsa kimi uşaqlığından kamil yarandı.

14. Elə ki, bu torpağa gəldiyini bildi, halının son gününü düşündü, fəğan edib göz yaşı axıtdı, elə bil ki, deyirdi: "Vücud qəm məskənidir, azadələrin yeri heçlikdir. Kim ki, bu mülkə əsir olur, daimi qəmə dözməlidir".

15. Elə bil dil açmışdı, deyirdi ki: - "Ey zülmkar dünya! Bildim ki, sənin qəmin çoxdur və qəm çəkənin yoxdur". Mən gəldim ki, sənin qəminlə dost olam. Gəl mən yazığı sınaqdan keçir! Heç ləngimə, harda qəm varsa, mənim nazik ürəyimə sal;

16. Həm ver mənə ğəm yemək kəmali,
Həm aləmi ğəmdən eylə xali!
Peyvəstə məni əsiri-ğəm qıl!
Kəm qılma nəsibimi, kərəm qıl!
Zövq ilə keçirmə ruzigarım,
Fani olana yox e'tibarım.

16. Mənə qəm çəkməyi öyrət, həm də dünyanı qəmdən azad et, həmişəlik məni qəm əsiri elə və bu payımı azaltma, ömrümü zövq ilə keçirmə, çünki faydasız olana e'tibarım yoxdur;

17. Ey eşq, ğəribi-aləm oldum,
Avarəyi-vadiyi-ğəm oldum.
Tədbiri-ğəm etmək olmaz oldu,
Gəldim, geri getmək olmaz oldu.
Səndən diləerəm mədəd ki, daim
Təmkinim ola sən ilə qaim.

17. Ey eşq, dünyanın yazığı, qəm vadisinin avarası olmuşam. Nə qəmimin əlacı, nə də geri getməyə yolum yoxdur. Səndən bircə həmişəlik kömək diləyirəm ki, mənə dözüm və təmkin verəsən.

18. Bu bəzmdə kim, şərabı qandır,
Saqi cəlladi-biamandır;
Bir mey mənə sun ki, məstü mədhuş,
Daim özümü qılam fəramuş.
Nə gəldiyimi bilim cəhanə,
Nə onu ki, necədir zəmanə.
Aləm gözümə görünməyə hiç,
Bu riştədə bulmayam xəmü piç".

18. Bu məclisdə sənin şərabın qandır, saqi isə imansız cəlladdır. Mənə elə mey ver ki, məst olub huşumu itirib özümü unudam. Nə cahana gəldiyimi biləm, nə də zəmanənin halından xəbərim olsun. Dünya da gözümə heç görünməsin və bu boyunbağında dolaşıqlıq görməyim".

19. Dayə onu pak qıldı qandan,
Qaldırdı bu tirə xakdandan.
Ğüslün verib abi-çeşmi-tərdən,
Süd yerinə verdi qan cigərdən.
Əqvamü qəbaili olub şad,
Ol növrəsə Qeys qoydular ad.

19. Dayə onu yerdən götürdü, göz yaşı ilə yudu, qandan pak elədi, süd yerinə ciyərinin qanını verdi. Qohum-qardaş şad oldu, uşağın adını Qeys qoydular.

20. Can ilə qılırdı dayə ə'zaz,
Əsbabi-kəmali-tərbiyət saz.
Lakin ol edib həmişə nalə,
Xoşnud deyildi heç bu halə.
Ə'zasın edib əlilə əfkar,
Eylərdi müdam naləvü zar.
Süd içsə sanırdı kim, içər qan,
Əmcək görünürdü ona peykan.
Yox idi firib ilə qərarı,
Yanında firibin e'tibarı.

20. Dayəsi canla-başla onu əzizləyib bəsləyirdi, amma uşaq hey ağlayırdı, naləsini kəsmirdi, halından razı deyildi, bədənini əlilə didib nalə qılırdı. Əmcək ona ox kimi görünürdü, içdiyi südü qan bilirdi, oyuncaq da istəmirdi.

21. Bir gün onu gəzdirirdi dayə,
Dərdini yetirməyə dəvayə.
Bir evdə məgər ki, bir pərivəş
Ol tifli bəsi görüb müşəvvəş
Rəhm etdi, əlinə aldı bir dəm,
Tifl onu görüncə oldu xürrəm,
Hüsnünə baxıb qərar tutdu,
Fəryadü fəğanını unutdu.
Olduqca əlində, oldu xəndan;
Düşdükcə əlindən oldu giryan.

21. Bir gün dayə onu dərdinə dərman eləmək üçün əlində gəzdirirdi. Evlərin birində pərisifət birisi uşağı çox narahat görüb, onu bir anlığa qucağına aldı. Uşaq onu görən kimi şadlandı, üzünə baxıb sakitləşdi, fəryadını unutdu, onun qollarında olduğu vaxtda, kiridi, geriyə alınan kimi yenə ağlamağa başladı.

22. Mahiyyətini çü daye bildi,
Ol mahı ona ənis qıldı.
Oldu bu dəxi onunla mö'tad,
Nə daye, na ana eylədi yad.
23. Zatında çü var idi məhəbbət,
Məhbubu görüncə tutdu ülfət.
Eşq idi ki, oldu hüsnə mail,
Hüsnü nə bilirdi tifli-qafil.
24. Mə'lum idi əhli-halə ol hal
Kim, nüsxeyi-eşqdir bu timsal.
Əlbəttə, bu tifli zar edər eşq,
Aşüfteyi-ruzigar edər eşq;
Əlbəttə, qılır bu sübh tə'sir,
Xurşid çıxıb olur cahangir.
25. Çün tərbiyəti-ədibü daye
Verdi əsəri-təmam ol ayə.
Gün-gündən edib kəmal hasil,
Ol mahi-növ oldu bədri-kamil.
26. Gəldikcə meyi-vəfadən əyyam,
Hər dövrdə sundu ona bir cam.
Ta qıldı onu təmam sərməst,
Tədric ilə dami-eşqə pabəst.
27. Çün sür'ət ilə dönüb zəmanə,
On yaşına yetdi ol yeganə;
Atasına müqtəzayi-adət,
Fərz oldu ki, onu edə sünnət.
Cəm etdi əhaliyi-diyari,
Hər sahibi-izzü e'tibari;
Bəzl eylədi ol qədər zərü sim
Kim, yetdi qiyasə fəqrdən bim.
28. Xəlq onda görəndə kəsrəti-mal,
Bim oldu ki, mün'əkis ola hal.
Ol saf zəmir, pak məşrəb,
Bir bəzmgəh eylədi mürəttəb
Kim, görmədi onu çeşmi-sağər,
Cəmşiddən özgəyə müyəssər.
Itmamə yetib təriqi-sünnət,
29. Tə'limi-ülumə yetdi növbət.
Əsbab ona eyləyib mürəttəb,
Verdilər onunla ziybi-məktəb.

22. Dayə məsələni anlayıb o ayüzlünü uşağa dost elədi. Uşaq beləcə dincəlib nə dayəsini, nə anasını yada salmadı.

23. Məhəbbət tifilin zatında olduğu üçün sevdiyini tapan kimi ona bağlandı. Uşaq gözəlliyi nə bilirdi ki, bağlılığın səbəbi ancaq eşq idi.

24. Ağıllılar bunun eşq nümunəsi olduğunu anlayırdılar və bilirdilər ki, eşq bu uşağı ağlar və vurğun edibdir. Əlbəttə, bu sübhün günəşi də doğulub dünyanın sahibi olacaqdı.

25. Dayə ona ədəb qaydasıyla tərbiyə verdi. Uşaq günü-gündən ağıllandı və təzə ay dolğunlaşdı.

26. Aləm hər addımda vəfa şərabından ona daha bir cam içirtdi, ta o vaxta qədər ki, tamam məst elədi və eşq tələsinə saldı.

27. Vaxt sür'ətlə keçdi, uşaq on yaşına çatdı. Atası adət üzrə sünnət elətdirdi. Ətraf əhlini topladı, izzət və e'tibar sahiblərini çağırdı, o qədər qızıl-gümüş səpdi ki, kasıblarla dövlətlilər arasındakı fərq qorxuya düşdü.

28. Xalq bu qədər mal-dövləti görüb işin tərsinə dönəcəyindən, yə'ni varlılarla dövlətlilərin yerlərin dəyişəcəyindən qorxurdu. O, ürəyi təmiz və saf təbiətli bir məclis qurdu ki, camların gözü bunu yalnız Cəmşid məclisində görmüşdü.

29. Sünnət ayini başa vurulandan sonra növbə elm təhsilinə gəldi. Məktəb ləvazimatı seçib onunla məktəbi bəzədilər.

**BU, BÜNYADİ-BİNAYİ-BƏLADIR**
**VƏ**
**MÜQƏDDİMEYİ-ƏLƏMİ-İBTİLADİR**

1. Məktəbdə onunla oldu həmdəm
Bir neçə mələkmisal qız həm,
Bir səf qız oturdu, bir səf oğlan,
Cəm oldu behiştə hurü ğilman.
2. Oğlanlara qızlar olsalar yar,
Eşqə bulunur rəvaci-bazar.
Qız nərgisi-məst edib füsunsaz
Oğlana satanda işvəvü naz
Oğlan necə səbr pişə qılsın,
Vər səbri həm olsa nişə qılsın?
3. Ol qızlar içində bir pərizad
Qeys ilə məhəbbət etdi bünyad.
Bir türfə sənəm ki, əqli-kamil
Gördükdə onu olurdu zail.
4. Zülfeyni-müsəlsəli girəhgir
Can boynuna bir bəlali zəncir.
Əbrusi xəmi bəlayi-üşşaq,
Həm cüft lətafət içrə, həm taq.
5. Hər kipriyi bir xədəngi-xunriz,
Peykani-xədəngi ğəmzeyi-tiz.
Dəryayi-bəla cəbini-paki,
Çin cünbüşi mövci-səhmnakı.
6. Çeşmi-siyəhinə sürmədən ar,
Hindusinə sürmə həm giriftar.
Rüxsarinə rəngi-ğazədən nəng,
Hərgiz ona ğazə verməmiş rəng.
7. Göz mərdüməgindən olsa xali,
Göz mərdüməgi olurdu xali.
Lə'lü dürü göstərərdi hərdəm
Övraği-gül içrə iqdi-şəbnəm.
8. Əbvabi-təkəllüm etsə məftuh,
Əmvatə verərdi müjdeyi-ruh.
Şümşadi-lətifinə mürəkkəb,
Sibi-zənəxü turunci-ğəbğəb.
Əndamı lətifeyi-ilahi,
Dəryayi-lətafət içrə mahi.
9. Şəhbaz baxışlı, ahu gözlü,
Şirin hərəkətli, şəhd sözlü.
Rahü rəvişi müdam ğəmzə,
Başdan ayağa təmam ğəmzə.

**BU, BƏLA SARAYININ QURULMASIDIR**
**VƏ**
**QƏM VƏ FƏLAKƏTİN GİRİŞİDİR**

1. Məktəbdə bir neçə mələk kimi qız onunla yoldaş oldu. Bir cərgə qız, bir cərgə oğlan oturdu, elə bil behiştə huri və qılmanlar toplaşmışdı.

2. Oğlanlar qızlara yoldaş olanda, eşqin bazarı iti olur. Qız nərgiz kimi məstedici və füsünkar baxışla oğlana işvə-naz satanda, o, necə səbr eləsin və niyə səbr eləsin?

3. O qızlar içində bir pərizad Qeysə məhəbbət bağladı. Elə bir türfə gözəl idi ki, ağıl əhli onu görəndə ağlını itirirdi.

4. Iki zəncir hörüyü can boynunda bir bəla zəncirinə dönürdü. Bir cüt zərif, çatma əyri qələm qaş, aşiqin bəlası - qan tökən yaya bənzəyirdi.

5. Hər kirpik, ürək yaralayan ox, qıyqacı baxışlar oxun ucluğu idi. Təmiz alnı bəla dənizini, saçının qıvrımı qorxulu dalğaları andırırdı.

6. Sürmə qara gözlərindən utanırdı, hindu, xalına isə əsir olmuşdu, yanaqlarından qızıl xəcalət çəkirdi, çünki ona rəng verə bilməzdi.

7. O, göz bəbəyindən ayrılsaydı, elə bil baxanın gözü bəbəyini itirərdi. Qırmızı dodaqlarının arasında dişləri gül içində lə'lə, inciyə bənzəyirdi.

8. Danışanda ölülərə dirilik müjdəsi verirdi. Çənəsinin alması və zənəxdanı gözəl şümşad boynuna münasib idi. Əndamının ilahi zərifliyi gözəllik dənizində balığa bənzəyirdi.

9. Qartal baxışlı, ceyran gözlü, şirin hərəkətli, bal sözlü, yolu-yürüşü qəmzəli, özü başdan-ayağa qəmzə.

10. Ayruqca şəklü xoşca peykər,
Yaxşıca sənəm, gözəlcə dilbər,
Aləm səri-muyinin tüfeyli,
Məhbubeyi-aləm, adı Leyli.
11. Qeys onu görüb həlak oldu,
Min şövq ilə dərdnak oldu.
Ol nadirə həm ki, Qeysi gördi,
Min zövq bulub, özün itirdi.
Gördü ki, bir afəti-zəmanə,
Misli dəxi gəlməmiş cəhanə.

10. Qısası, özgə biçimli bir gözəl, əsl büt, yaraşıqlı dilbər! Dünya saçının ucunun tüfeylisi, dünya-gözəli adı Leyli.

11. Qeys onu görüb həlak oldu, min şövqlə dərdə düşdü. O nadirə də ki, Qeysi gördü, min zövq içində özünü itirdi. Baxdı ki, elə bir zəmanə bəlasıdır ki, tayı-bərabəri dünyaya gəlməmiş.

## BU, SİFƏTİ-MƏCNUNDUR
## VƏ
## İBTİDAİ-MÖHNƏTİ-FÜZUNDUR

1. Bir dilbəri-sərvqəddü gülruy,
Sərvi-xoşü gülrüxü səmənbuy.
Şirin ləbi–mənşəi-lətafət,
Rə'na qədi–durduğilə afət.
2. Övsafi-lətafətində söz çox,
Əltafi-məlahətində söz yox.
Şəhla gözü–nərgisi-pürəfsun,
Ziba qaşı–nərgis üzrəki nun.
3. Hüsni gülü–laleyi-şəfəqfam,
Zülfi xəmi–lalə üzrəki lam.
Ağzı sifətin xud etmək olmaz,
Əsrari-nihanə yetmək olmaz.
4. Zülfi sözü–zikri-həlqeyi-raz,
Lə'li-ləbi–abi-çeşmeyi-naz.
Dövri-məhi-ruyi–çeşmeyi-nur,
Xaki-kəfi-payi–sürmeyi-hur.
Bir ğayət ilə şəmaili xub.
5. Kim, Leyli olanda ona mətlub,
Bir güzgüyə gər açıb gözünü,
Güzgudə görəydi öz-özünü;
Öz arizinə olurdu meyli,
Qılmazdı həvayi-hüsni-Leyli.
6. Ol iki səmənbərü səhiqəd
Bir-birinə oldular müqəyyəd.
Ol iki xərabi-badeyi-zövq
Bir camdən içdilər meyi-şövq.
Girdabi-bəlayə oldular ğərq,
Qalmadı aralarında bir fərq.
7. Övzai-müxalif oldu yeksan;
Guya iki təndə idi bir can.
Hər kim sorar olsa Qeysə bir raz,
Leylidən ona yetərdi avaz.
Kim Leyliyə qılsa bir xitabı,
Qeys idi ona verən cəvabı.
8. Eylərlər idi xəti-vəfa məşq,
Artardı dəmadəm onlara eşq.
Leylidə oxumaq iztirabı
Olsa, rüxi-Qeys idi kitabı.
Məşq etməyə Qeys alsa bir xət,
Leyli qaşı idi ona sərxət.

## BU, MƏCNUNUN SİMASIDIR
## VƏ ONUN SONSUZ
## ƏZABININ BAŞLANĞICIDIR

1. Bir sərvboylu, gül üzlü, yasəmən və gül ətirli gözəl! Şirin dodaqları lətafət saçırdı, rə'na görünüşü bəla idi.

2. İncəliyinin təsvirinə söz çox, məlahət və zərifliyini deməyə söz yox idi. Şəhla gözləri füsünkar nərgizi, qəşəng qaşı nərgiz üstündəki "nun"u andırırdı.

3. Hüsnünün gülü şəfəq rəngli laləyə, saçının qıvrımı lalə üzərindəki "lam"a bənzəyirdi. Ağzının təsviri mümkün deyildi, çünki gizli sirləri aşkar etmək olmaz.

4. Zülfündən söz açmaq sirr həlqəsindən danışmaq kimiydi, ləl dodaqları naz çeşməsinin suyuydu. Sifətinin ayının dönməsi nur çeşməsiydi, ayağının altının torpağı hurilərin gözünün sürməsiydi.

5. Görünüşü hədsiz yaxşıydı. Əgər ürəyi Leylini görmək istəyəndə gözünü açıb bir güzgüyə baxsaydı və güzgüdə özünü görsəydi öz yanaqlarına mail olardı və Leylinin gözəlliyini arzulamazdı.

6. Bu iki sərvqamətli və yasəmən görünüşlü bir-birinə bağlandı. O iki zövq badəsindən keflənmiş, bir camdan eşq şərabı içdilər, bəlaya düşdülər, aralarında fərq qalmadı.

7. Ayrılıq söhbəti yox oldu, elə bil ki, iki bədəndə bir can oldular. Kim Qeysdən bir sirr xəbər almaq istəyirdi, cavabı Leylidən gələrdi. Leyliyə müraciət edildikdə cavabını Məcnun verərdi.

8. Sevgi hüsn-xəttini öyrənirdilər, gündəngünə eşqləri artırdı, Leyli oxumaq istəyəndə kitabı Məcnunun sifəti idi. Məcnuna bir xət çəkmək tapşırılsa, Leylinin qaşını çəkirdi.

9. Xətt üzrə qılırdı ol gözəllər
Min naz ilə bəhslər, cədəllər.
Əmma nə cədəl–kəmali-ülfət,
Nə bəhs–nəhayəti-məhəbbət.
10. Çün bir neçə müddət ol iki pak
Övqat keçirdilər tərəbnak.
Eşq olduğu yerdə məxfi olmaz;
Eşq içrə olan qərar bulmaz.
Eşq atəşinə budur əlamət
Kim, baş çəkə şö'leyi-məlamət.
11. Hüsn afəti-eşq olub dəmadəm,
Gəldikcə iradət oldu möhkəm.
Bir ğayətə yetdi nəş'əyi-hal
Kim, oldu həvasü əql pamal,
Qalmadı zəbanə tabi-göftar
Kim, eyləyələr məhəbbət izhar.
12. Keyfiyyəti-halı qılmağa faş
Gəlmişdi təkəllümə gözü qaş.
Eylərdi gözilə bu xitabı,
Qaşilə verərdi ol cavabı.
Qaşü göz ilə olan təkəllüm
Həm qılmadı dəf'i-zənni-mərdüm.
13. Mərdümdən olam, demə, kənarə!
Mərdüm göz içindədir, nə çarə?

14. Həmraz ikən ol iki vəfadar,
Dəmsaz ikən ol iki cigərxar,
Rəf oldu hicabi-şahidi-raz;
Eşq oldu məlamət ilə dəmsaz.
15. Aşiqlərə gizli qalmadı hal,
Mə'lum oldu cəm'i-əhval.
Gərd ayineyi-nişatə düşdü,
Minbə'd iş ehtiyatə düşdü.
Söyləşməyə ol iki yeganə
Qalmadı səbəb məgər bəhanə.
Ta olmaya raz aşikara,
Dövran ilə qıldılar müdara.
16. Bir növ bəhanə ilə hərdəm,
Könlünü qılırdı Qeys xürrəm.
Qəsdən unudurdu dərsin ol zar,
Leyliyə deyirdi: - "Ey vəfadar!
Hifzi-səbəq etdi bağrımı xun,
Məndən, bilirəm, bilirsən əfzun.
Mən bilmədiyim mənə oxutgil,
Dərsim oxuyam qulaq tutgil!"

9. Yazı barədə o gözəllər min naz ilə bəhs edirdilər. Amma necə bəhs–kamil ülfət, nə bəhs–məhəbbətin ən uca zirvəsi.

10. Bir müddət bu iki saf ürək şadlıqla keçindilər. Əgər eşq varsa, gizli qalmaz. Eşqə düşənin səbri olmaz. Eşq atəşinin nişanı budur: danlaq odu alovlanmalıdır.

11. Gözəllik daima eşq atəşi olub, getgedə bağlılıq şiddətləndi və nəş'ə halı elə hədsiz dərəcəyə yetdi ki, əql əldən getdi, dildə danışmağa güc qalmadı və onlar məhəbbətdən danışa bilmədilər.

12. Bir-birinin halını göz-qaşdan duyurdular. Bu, gözü ilə sual verirdi, o, qaşı ilə cavab. Qaş-göz arasında gedən bu söhbət elin gözündən qaçmadı.

13. Insanlardan uzaq olaram demə! Insan bəbək kimi sənin gözünün içindədirsə, nə edə bilərsən?

14. O iki vəfadar bir-birilə sirdaş olarkən, o iki ciyəri yanan bir-birilə həmdəm olarkən sirr pərdəsi aradan götürüldü, eşq danlağa hədəf oldu.

15. Bu hal aşiqlərə də gizli qalmadı və hər şey mə'lum oldu. Şadlıq güzgüsünü toz basdı, hər iş min ehtiyata büründü. O iki yeganənin danışmağa belə bəhanələri qalmadı. Niyyətləri üzə çıxmasın deyə dövran ilə barışmalı oldular.

16. Qeys hərdən bir bəhanə ilə ürəyini şadlandırırdı. Qəsdən dərsini unudub Leyliyə deyərdi: "Ey vəfalım, dərsimi əzbərləmək bağrımı qan eyləyib, bilirəm ki, sən məndən yaxşı bilirsən. Bilmədiyimi mənə öyrət, ya da mən oxuyum, sən dinlə.

17. Çün lövhələr üzrə xət yazardı,
Əmdən xətini ğələt yazardı.
Yə'ni ki, xəta təvəhhüm edə,
Ol gül açılıb təbəssüm edə,
Göftarə gələ ki, - "Bu, ğələtdir!
Tərk et ki, xilafi-rəsmi-xətdir".
18. Ola səbəbi-təkəllümi-yar
Fəhm etməyə müddəayı əğyar.
Ətfal qılanda dövr bünyad,
Vari belə eyləyəndə fəryad,
Ol, yarına ərzi-hal edərdi,
Özgə dövrün xəyal edərdi.
Qılmazlar idi sözünü mə'lum,
Bilməzlər idi sözünə məfhum.
19. Məktəbdən olan zamanlar azad
Vəsl üçün edərdi hiylə bünyad:
Qəsd ilə nihan edib kitabın,
Həddən aşırardı iztirabın,
Leyli yolunu tutub durardı,
"Sən gördün ola?" - deyib sorardı.
Yə'ni bu bəhanə ilə bir dəm,
Yarın görə, ola şadü xürrəm.
20. Elmi-xətə ömrün eyləyib sərf,
Məşq etmiş idi həmin iki hərf:
Bir səfhədə "lam"ü "ya" mükərrər,
Yazardı onu, qılardı əzbər
Kim: "bu iki hərfdir muradım,
Rövşən bular ilədir səvadım".

17. Lövhədə yazı yazanda qəsdən səhv yazırdı ki, o gül gülümsəyib danışsın və desin ki: "bax burası səhvdir, düzəlt, yazı qaydasına görə belə yaramaz".

18. Bu yolla söhbət salmağa çalışırdı ki, istəməyənlər duyuq düşməsin. Uşaqlar bir-birinə qarışıb səs-küy qoparanda, o yarı ilə danışardı. Ötən günləri yada salardı, sözünü heç kəs anlaya bilməz və tuta bilməzdi.

19. Məktəbdən çıxandan sonra görüşmək üçün də bir hiylə qurardı. Qəsdən kitabını gizlədib özünü çox narahat göstərərdi və Leyligilə yol tutardı. "Bəlkə sən görübsən kitabımı" deyib xəbər alardı. Bu bəhanə ilə də bir anlıq sevgilisini görüb şad olub sevinərdi.

20. Ömrünü sərf eyləyib yazıda ikicə hərfi yaxşı öyrənmişdi: "lam"(*) və "ya" (*). Bunları təkrarlayıb Leyli sözünü əzbərləyirdi ki, "Mənim muradım bunlardır və savadımın işığı budur".

## BU, LEYLİYƏ ANASI İTAB ETDİYİDİR VƏ BƏHARİ-VƏSLİNƏ XƏZAN YETDİYİDİR

1. Çün məkr ilə Qeysi-bədsərəncam
Bir neçə zaman keçirdi əyyam.
Tədbir ilə eşq zövq verməz,
Tədbir diyari-eşqə girməz.
Eşq ilə riya deyil müvafiq,
Risvay gərək həmişə aşiq.
2. Dildən-dilə düşdü bu fəsanə,
Faş oldu bu macəra cəhanə
Kim: "Qeys olubam əsiri-Leyli,
Leyli dəxi salmış ona meyli".
3. Tədrici-məbadi ilə nagah
Leylinin anası oldu agah.
Odlara tutuşdu, yasə batdı,
Ol ğönçədəhanə dil uzatdı.
Yanar od olub, çəkib zəbanə,
Ol gülrüxə dedi yanə-yanə:
4. - "Key şux! Nədir bu göftügulər?
Qılmaq sənə tə'nə eybculər?
Nəyçün özünə ziyan edirsən?
Yaxşı adını yaman edirsən?
Nəyçün sənə tə'nə edə bədgu?
Namusuna layiq işmidir bu?
5. Nazik bədən ilə bərgi-gülsən,
Əmma nə deyim, ikən yünülsən!
Lalə kimi səndə lütf çoxdur,
Əmma nə deyim, üzün açıqdur.
6. Təmkini cünunə qılma təbdil!
Qızsan, ucuz olma, qədrini bil!
Hər surətə əks kimi baxma!
Hər gördüyünə su kimi axma!
7. Mey gərçi səfa verər dimağə,
Axdığı üçün düşər əyağə.
Güzgü kimi qatı üzlü olma!
Nərgiz kimi xiyrə gözlü olma!
8. Gözdən gərək olasan nihan sən,
Ta demək ola sənə ki, cansən.
Sən şəm'sən, uymagil həvayə
Kim,. şəm'i həva verər fənayə.

## BU, LEYLİNİ ANASININ DANLAMASIDIR VƏ ONUN BAHAR VƏSLİNƏ XƏZAN YETDİYİDİR

1. Bədbəxt Məcnun bir neçə müddət bu hiyləylə dolandı, ancaq tədbirlə eşq zövq verməz və tədbir eşq diyarına girə bilməz. Eşqlə riya tutmaz. Aşiq həmişə rüsvay olmalıdır.

2. Bu əfsanə dildən-dilə düşdü və əhvalat aləmə yayıldı. Hamı bildi ki, Qeys Leyliyə aşiq olub, Leylinin də meyli onadır.

3. Axırda Leylinin anası da bundan xəbər tutdu. Odlara düşdü, yasa batdı. Yana-yana o gül üzlüyə dedi:

4. "- Ey şux, bu nə dedi-qodudur? Sənə sözbazlar tə'nə edir? Niyə özünə ziyan vurursan? Yaxşı adını yaman edirsən. Niyə sənə pis dillər tə'nə vursun? Bu sənin namusuna layiqdirmi?

5. Nərmənazik gül yanaqlısan, amma nə edim ki, yüngülsən? Lalə kimi sənin gözəlliyin böyükdür, nə fayda, üzün açıqdır!

6. Təmkini dəliliyə dəyişmə, qızsan, ucuz olma, qədrini bil! Hər surətə əks kimi baxma, hər gördüyün tərəfə su kimi axma!

7. Şərab ruha səfa verirsə də, axdığı üçün camın dibinə düşür. Güzgü kimi bərk üzlü, nərgiz kimi süzgün gözlü olma.

8. Sən gərək gözlərdən gizli olasan, sənə onda cansan demək olar. Sən şamsan, havaya uyma, unutma ki, şamı hava söndürər.

9. Lö'bət kimi özünü bezətmə!
Rövzən kimi kuçələr gözətmə!
Sağər kimi gəzməyi həram et!
Nəğmə kimi pərdədə məqam et!
10. Sayə kimi hər yerə üz urma!
Heç kimsə ilə oturma, durma!
Sən sadəsən, özgə əhli-neyrəng,
Cəhd eylə verilməsin sənə rəng!
11. Derlər səni eşqə mübtəlasən,
Biganələr ilə aşinasən.
Sən qandanü eşq zövqü qandan?
Sən qandanü dust şövqü qandan?
12. Oğlan əcəb olmaz olsa aşiq,
Aşiqlik işi qıza nə layiq?
Ey iki gözüm, yaman olur ar!
Namusumuzu itirmə, zinhar!
13. Biz aləm içində niknamız,
Mə'rufi-təmami-xasü amız.
Nə nəng ilə dəxi edəlim laf?
Biz deməyəlim, sən eylə insaf!
14. Tut kim, sənə qıymazam məni-zar,
Məndən ulu bir müdəbbirin var.
Neylərsən əgər atan eşitsə,
Qəhr ilə sənə səyasət etsə?
15. Minbə'd gəl eylə tərki-məktəb.
Bil əbcədini həmin cədü əb.
Etmə qələm ilə məşqdən yad,
Suzən tutü nəqş eylə bünyad.
16. Ətfaldən eylə qət'i-ülfət,
Həmraz yetər yanında lö'bət.
Büt kimi bir evdə eylə mənzil,
Olma dəxi hər yənayə mail,
17. Ənqa kimi üzlət eylə pişə,
Öylə rəviş eylə kim, həmişə
Gərçi adın ola dildə məzkur,
Görmək səni ola ğeyri-məqdur.
Xoş ol ki, qızı həmişə gizlər,
Xud gizli gərək həmişə qızlar.

9. Gəlincik kimi özünü bəzəmə! Pəncərə kimi küçələrə baxma! Piyalə kimi əldən-ələ gəzməyi haram bil. Nəğmə kimi pərdədə qal.

10. Kölgə kimi hər yerə baş vurma, heç kimsəylə oturma, durma! Sən sadəlövhsən, özgələri hiyləgərdir, elə et ki, sənə söz qoşmasınlar.

11. Deyirlər ki, eşq əsiri olubsan, yadlar ilə dostluq edirsən. Sən hara, eşq şövqü hara? Sən hara, dostluq həvəsi hara?

12. Oğlan aşiq olsa, təəccüblü deyil, qıza heç aşiqlik yaraşarmı? Ey iki gözüm, ar yaman olur! Özünü gözlə, namusumuzu itirmə!

13. Aləmdə ad-sanımız var, seçilmişlər və sadə camaat içində məşhuruq. Bu biabırçılıqdan sonra biz necə lovğalanaq? Biz bir söz demiyək, sənin gərək insafın olsun!

14. Tutaq ki, mən bədbəxt sənə qıya bilmirəm, axı məndən də böyük bir tərbiyəçin var. Əgər atan eşidib səni ağır cəzalandırsa, neylərsən?

15. Bundan sonra məktəbi tərk et. Ata-baba məktəbinə keç. Qələm ilə məşqi unut, iynə tut, tikmə ilə məşğul ol.

16. Oğlanlarla aranı kəs, sirdaşın gəlinciklər olsun. Büt kimi mənzilin öz evin olsun, başqa yana meyl eləmə.

17. Simurq kimi təkliyi özünə sənət seç, elə hərəkət et ki, adın dillər əzbəri olsa da, səni görmək mümkün olmasın. O kəslər şaddır ki, qızlarını gizlədirlər, çünki qızlar həmişə gizli olmalıdır.

## BU, İNKAR ILƏ LEYLİ ANASINA CAVAB VERDİYİDİR VƏ MƏKTƏBDƏN ÇIXIB SƏRAYİ-MÖHNƏTƏ GİRDİYİDİR

1. Leyli bu itabı çün eşitdi,
Öz könlündə müqərrər etdi
Kim: "Şö'bədeyi-sipehri-zalim,
Tərh eylədi nəqşi-namülaim.
2. Əyyami-visalə yetdi hicran,
Vəqt oldu cigərlər ola büryan.
Əmma nə desin, nə çarə qılsın,
Tədbir nə olduğun nə bilsin!
3. Naçar tutub təriqi-inkar,
Asari-təcahül etdi izhar;
Gülzari-itabə ab verdi,
Giryan-giryan cəvab verdi:
4. - "Key munisi-ruzigarım ana!
Dürci-düri-şahvarım ana!
Sözlər dersən ki, bilməzəm mən,
Məzmununu fəhm qılmazam mən.
5. Dersən məşuqü eşqü aşiq,
Mən sadəzəmir tifli-sadiq;
Bilmən nədir ol hədisə məzmun?
Söylə! Necə olmayım digərgun?
6. Eşqin qılmazdı kimsə yadın,
Ha səndən eşitdim indi adın.
Billah! Nədir, ana, eşqə məfhum?
Bu sirri-nihanı eylə mə'lum!
7. Hadiyi-rəhi-muradım olğıl!
Bu şivədə ustadım olğıl!
Mən məktəbə rə'yim ilə getmən,
Bir şüğli xilafi-rə'yin etmən.
8. Həm dersən sən ki: "Məktəbə var!"
Həm dersən sən ki: "Getmə, zinhar!"
Qanğı sözə e'tiqadım olsun?
Sənə necə e'timadım olsun?
9. Mən həm deyiləm bu zəcrə qail
Kim, hərdəm olub çirağı-məhfil,
Nacinslər ilə həmdəm olam,
Bir yerdə müqəyyədi-ğəm olam.

## BU, İNKAR İLƏ LEYLİNİN ANASINA CAVAB VERDİYİDİR VƏ MƏKTƏBİ BURAXIB MƏŞƏQQƏT SARAYINA GİRDİYİDİR

1. Leyli bu məzəmməti eşidəndə ürəyində belə qərara gəldi ki, zalım fələk onun tale səhnəsində dəhşətli bir oyun çıxarıb.

2. Vüsal günləri hicrana çevrildi. Ciyərlərin dağlanma vaxtı gəlib çatdı. Ancaq nə desin, nə çarə qılsın, nə bilsin neyləmək lazımdır.

3. Əlacsız qalıb danmaq yolunu tutdu. Özünü bilməzliyə vurub məzəmmət gülşənini sulayaraq ağlaya-ağlaya cavab verdi:

4. - "Ey ömür-günümün munisi ana! Mənim şah incimin sandıqçası ana! Elə sözlər deyirsən ki, başa düşmürəm, məzmununu anlamıram.

5. Mə'şuqə, aşiq, eşq deyirsən! Mən sadədil, sadiq uşağam, onların mə'nasını bilmərəm. Söylə, mən necə məəttəl qalmayım?

6. heç kəsdən aşiqlik sözünü eşitmədim. Bunu təkcə sən dedin. Allah eşqinə, ana de görüm, eşqin mə'nası nədir? Mənə bu sirri aç!

7. Mənim murad yolumda rəhbərim ol, bu işdə ustadım ol. Mən məktəbə özbaşına getmirəm, sənin fikrinə zidd iş tutmuram.

8. Özün deyirsən ki, "məktəbə get!" həm də deyirsən ki, dur, getmə! Hansı sözə inanım? Sənə necə e'tibar edim?

9. Heç insafdırmı ki, mən "hər bir məclisin çırağı olub yadlarla oturub-duram və haradasa, kiminsə qəminə əsir olam".

10. Hər didədən edə-edə pərhiz,
Övqat keçə küdurətamiz.
Peyvəstə müəllim eyləyib cövr,
Gahi səbəq oxuda, gəhi dövr.
11. Billah, mənə həm bu idi məqsud,
Məktəbdə olurmu tifl xoşnud?
Artıq bu sözü mükərrər etmə,
Lütf eylə, məni mükəddər etmə!"
12. Çün ana eşitdi bu cəvabi,
Tərk etdi şikayətü itabi.
Şəksiz ona rövşən oldu kol mah
Aşiqlikdən deyildir agah.
13. Bihudədir ol qamu fəsanə
Kim, aşiqdir filan filanə.
Çün vaqeə şək məhəlli oldu,
Ol vaqeədən təsəlli oldu.
14. Leyli həm oturdu evdə naçar,
Düzdü sədəfinə dürri-şəhvar...
Bir bürcdə sabit oldu əxtər,
Məhbusi-xəzanə oldu gövhər.
15. Lə'l oldu əsiri-sineyi-səng,
Həbs oldu gülabə şişeyi-təng.
Ğəmdən siyəh oldu ruzigarı,
Nomid dili-ümidvarı.
16. Ah eylər idi, vəli nə hasil,
Ol yel açamazdı ğönçeyi-dil.
Göz yaşı tökərdi, leyk nə sud,
Bitməzdi onunla nəxli-məqsud.
17. Zülfi kimi piçü tabə düşdü,
Heyran qalıb, iztirabə düşdü.
Ağzı kimi xülqün etdi ğəm dar;
Çeşmi kimi cismi oldu bimar.
18. Nə dərdini saxlasa qərari,
Nə şərhi-ğəm etsə ğəmgüsarı.
Fanusi-xəyalə döndü ol şəm,
Könlünü qılıb xəyal ilə cəm,
19. Hərdəm çəkib ol ğəm içrə min ah,
Səbr etdi zərurət ilə ol mah.
Dərd ilə düzüb təraneyi-ğəm,
Bu bir ğəzəli oxurdu hər dəm:

10. Hər gözdən qaça-qaça, vaxtımı kədərlə keçirəm. Müəllim həmişə mənə zülm edə: mənə gah dərs oxutdura, gah da dövr elətdirə.

11. Allaha and olsun ki, elə mən də bunu istəyirdim. Hansı uşağın məktəb xoşuna gəlir? Bu sözü bir daha təkrar eləmə, mənə yazığın gəlsin, dərdə salma.

12. Ana bu cavabı eşidib, şikayət və töhmətdən əl çəkdi. O ayüzlünün aşiqlikdən xəbərsizliyi ona aydın oldu.

13. Danışılanların hamısının boş əfsanə, kiminsə kimə aşiqliyinin boş söz olduğuna inandı və təsəlli tapdı.

14. Leyli də əlacsız evdə oturdu, ağladı - şah inciyə bənzər göz yaşları axıtdı, ulduz kimi bir bürcə bağlandı - gövhər xəzinə dustağı oldu.

15. Lə'l daşın, gülabsa dar şişənin əsiri oldu. Qəmdən günü qara, ümid dolu ürəyi ümidsiz oldu.

16. Ah çəkirdi, ancaq nə mə'nası, o yeldən könül qönçəsi açılmazdı. Göz yaşı tökərdi, ancaq nə olsun - bundan bəxt xurması göyərməzdi.

17. Saçları kimi özü də qıvrılıb qovruldu, heyrətdə qalıb əzaba düşdü. Qəm boğazını da ağzı kimi daraltdı, cismi də gözləri kimi dərdlə doldu.

18. Nə dərdini gizlətməyə səbri, nə də qəmini bölməyə qəmxarı olmadı. Şam kimi könlünü xəyala verib xəyal çırağına çevrildi.

19.Hər dəm qəm içində min ah çəkə-çəkə o ayüzlü zərurətə səbrlə qatlaşdı. Dərdlə qəm nəğməsi qoşaraq bu qəzəli oxuyurdu:

## ĞƏZƏLİ-LEYLİ

Fələk ayırdı məni cevr ilə cananımdan,
Həzər etməzmi əcəb nalevü əfğanımdan?

Oda yandırmasa gər şö'lə ilə nöh fələki,
Nə bitər ateşi-ahi-dili-suzanımdan?

Ğəmi-pünhan məni öldürdü, bu həm bir ğəm kim,
Gülrüxüm olmadı agəh ğəmi-pünhanımdan.

Ah idi həmnəfəsim, ah ki, ol həm axır
Çıxdı ikrah qılıb külbeyi-ehzanımdan.

Mən, nə hacət ki, qılam daği-nihanım şərhin?
Aqibət zahir olur çaki-giribanımdan.

Həq bilir, yar deyil canü dilimdən ğaib,
Nola gər ğaib isə dideyi-giryanımdan.

Can əgər çıxsa tənimdən əsəri-mehri ilə,
Əsəri-mehrini sanman ki, çıxar canımdan.

Lütf edib sən məgər, ey bad, bu gündən böylə
Verəsən bir xəbər ol sərvi-xuramanımdan.

Ey Füzuli, ğəmi-hicr ilə pərişandır hal,
Kimsə agah deyil hali-pərişanımdan.

## LEYLİNİN QƏZƏLİ

Fələk zülm ilə məni cananımdan ayırdı.
Əcəba, mənim nalə və əfqanımdan cana
gəlməzmi?

Əgər şö'ləsi ilə göylərin doqquz qatını
yandırmasa,
mənim yanan ürəyimin ahının odundan nə
çıxar?

Gizli qəmim məni öldürdü, bu da bir qəm ki,
gül üzlümün bu gizli qəmdən xəbəri olmadı.

Həmnəfəsim ahım idi, ah ki, axırda o da
bezikib qəm alaçığımdan çıxdı.

Mənə çəkilmiş gizli dağı açıb söyləməyimə bir
ehtiyac vardırmı? Axırda onsuz da o, yırtılmış
yaxamdan özü görünəcək.

Haqq bilir ki, yar mənim canımdan ürəyimdən
ayrılıqda deyil, nə olsun ki, ağlar gözlərimə
görünmür.

Can əgər məhəbbət tə'sirilə bədənimdən,
çıxsa, sanmayın ki, məhəbbət tə'siri
canımdan çıxa bilər.

Lütf edib, ey külək, bu gündən belə,
bəlkə sən bir xəbər verəsən nazlı sərvimdən.

Ey Füzuli, ayrılıq qəmi ilə halım pərişandır,
heç kəsin də mənim pərişan halımdan xəbəri
yoxdur.

**TƏMAMİYİ-SÜXƏN**

1. Saqi, gətir ol meyi-muğani
 Kim, unudalım ğəmi-cahani!
 Rəhm eylə ki, qəsdi-can edər ğəm,
 Bağrım sitəm ilə qan edər ğəm.
2. Qıl əqlimi badə ilə zail,
 Çərxin sitəmindən eylə ğafil.
 Fəryad ki, çərx bivəfadır,
 Daim işi cövr ilə cəfadır.
3. Bir adət ilə mədarı yoxdur,
 Dövranının e'tibarı yoxdur.
 Gər həmnəfəs etsə iki yarı;
 Bir yerə gətirsə iki zarı,
 Əlbəttə, səbəb salar arayə;
 Onları əsir edər bəlayə.
4. Billah, nə yamandır aşinalıq,
 Çün vaqe olur yenə cüdalıq.

**SÖZÜN TAMAMI**

1. Saqi, o muğan şərabını gətir ki, dünya qəmini unudaq. Rəhm elə ki, qəm canımın qəsdinə durub, bağrımı zülm ilə qan eyləyir.

2. Badə ilə ağlımı yox et, çərxin zülmündən mənim xəbərim olmasın. Fəryad ki, çərxin vəfası yoxdur, işi zülm və sitəmdir.

3. Dövrana da e'tibar yoxdur, o da bir qayda ilə dolanmır. Iki yarı həmnəfəs eyləyib, iki ağlayanı bir yerə gətirsə, araya bir səbəb çıxarıb onları bəlaya salır.

4. Billah, səvişmək də çox yamandır, çünki sonu yenə ayrılıqdır.

## GÜZARİŞİ-HALİ-MƏCNUN

1. Gülzari-kəlam bağbanı
Böylə bəzəmiş bu bustanı:
Kim, sərvi-riyazi-möhnətü dərd,
Sövdazədə Qeysi-dərdpərvərd
Hər sübh gedərdi məktəbə şad,
Məktəbdə olurdu ğəmdən azad.

2. Məşqi-xəti-hüsni-yar edərdi,
Dəf'i-ğəmi-ruzigar edərdi.
Zövq ilə tutub təriqi-sabiq
Adət üzərinə sübhi-sadiq,
Gəldi yenə məktəbə fərəhnak,
Ta kim, qıla zövqi-vəsli idrak.

3. Gördü ki, behiştə hur gəlməz,
Gün çıxdı, hənuz nur gəlməz.
Xurşidsiz oldu ruz ta şəb,
Oldu başına qaranqu məktəb.
Bildi ki, sipehri-şö'bədəbaz,
Bir şö'bədə eyləyibdir ağaz.

4. Əlbəttə, cəfayi-tə'ni-əğyar
Ol gül yoluna buraxdı bir xar.
Nomid olub, etdi nalə bünyad,
Dedi: - "Nədir, ey fələk, bu bidad?
Netdim sənə, qəsdi-canım etdin?
Qət'i-rəhi-dilsitanım etdin?

5. Kəsdin tələbi-ğərəzdə rahım,
Bildir mənə kim, nədir günahım?
Əvvəl məni eylədin mükərrəm,
Vəsli sənəm ilə şadü xürrəm,
Döndün, niyə böylə cövr edərsən,
Ol dövrə nəqiz dövr edərsən?

6. Vəhm eyləmədinmi kim, çəkib ah,
Suzi-ciyər ilə bir səhərgah
Yandıram oda doquz rəvaqın,
Suzin sənə bildirəm fəraqın?

7. Tədbir qıl, ey müəllimi-pir,
Et sehr ilə ol pəriyi təsxir!
Ancaq mənə sanma yetdi bu ğəm
Kim, yetdi mənə yetən sənə həm.

8. Düş, ey əlif, istiqamətindən!
Şərm eylə bu qəddü qamətindən
Qəddi həvəsilə dəm urarsan,
Ol getdi, əcəb ki, sən durarsan!

## MƏCNUNUN HALININ BƏYANI

1. Söz gülşəninin bağbanı bu bağçanı belə bəzəmiş: Sevda vurğunu, dərd-qəm gülşəninin sərvi, dərdsevən Qeys hər səhər məktəbə şadlıqla gedərdi və orada qəmdən azad olardı.

2. Sevgilisinin gözəlliyinin hüsn-xəttini məşq edərdi, bununla da dünya qəmini dağıdardı. Adəti üzrə sübhdən yenə də fərəhlə məktəbə gəldi ki, sevgilisinə yetişsin.

3. Gördü ki, gün çıxıb işıq yoxdur, behiştə huri gəlməyib! Günəşsiz gündüz gecəyə çevrildi, məktəb ona qaranlıq göründü, oyunbaz fələyin oyuna başladığını duydu:

4. - Əlbəttə, düşmən tə'nəsi və zülmü o gülün yoluna tikan əkmişdi. Umudunu itirib, nalə çəkib dedi: - "Ey fələk, bu nə zülmdür? Sənə neylədim ki, canımın qəsdinə durdun? Ürəyimi alanın yolunu kəsdin.

5. İstədiyimə çatmaq yolumu bağladın. Bildir mənə, günahım nədir? Əvvəl məni əzizləyib sənəmimin vəsli ilə şadlandırdın, sonra niyə belə döndün və zülmə başladın, bu qayda ilə sən necə dövr eyləyirsən?

6. Ağlına gəlmədimi ki, bir səhər ciyərimin odu ilə bir ah çəkərəm, göyün doqquz qatını yandıraram, ayrılıq odunun nə olduğunu sənə bildirərəm?

7. Tədbir gör, ey qocaman müəllim, o pəriyə bir sehrlə tə'cir göstər, bu zülm tək mənə deyil, sənə də olub.

8. Ey "əlif" yerindən düş, qəddqamətindən utan! Boy-buxunuyla fəxr edirdin, o da getdi, qəribədir ki, sən qaldın!

9. Ey nun! Çü nihandır əbruyi-yar,
Sən dəxi nəzərdə durma, zinhar!
Ey mim! Çü ağzı oldu ğaib,
Oldu sənə həm ədəm münasib!
10. Olsan nola, ey dəvat, diltəng,
Ayineyi-xatirin tutub jəng,
Ol türreyi-mişkbudan ayru,
Hicran qara bağrın eyləmiş su.
11. Ey xamə, sirişkbar olubsan,
Sərgəştəvü biqərar olubsan!
Guya bu gün etməmiş müyəssər,
Dövran sənə dəstbusi-dilbər.
Ey lövh! O xəttin eylə yadın!
Qıl sinədə nəqş ğəm səvadın!
12. Bir neçə gün ol əsiri-hicran,
Məktəbdə gəzib qılırdı əfğan.
Hər ruz fəğanı ilə ta şəb,
Tə'zib çəkərdi əhli-məktəb.
Şəb həm qılıban fəğanü zari,
Eylərdi müxatəb ol nigari:
13. - "Key göz nuri, könül süruri!
Sənsiz gözümün yox oldu nuri.
Əvvəl nə idi bu aşinalıq?
Axır niyə eylədin cüdalıq?
14. Əvvəl niyə eylədin məni məst,
Izhari-məhəbbət ilə pabəst,
Axır nə üçün xumarə saldın,
Bu möhnəti-intizarə saldın?
15. Saldın dili-zarə nari-firqət,
Qıldın gözümü pür abi-həsrət!
Könlüm odu qıldı yanə-yanə,
Ahəng şəfəq tək asimanə.
Yaşım suyu oldu varə-varə,
Bir bəhr ki, yox ona kənarə.
16. Mən istəməzəm bu gündə həmdəm,
Yanımdan elət xəyalını həm!
Olmaya düşüb xəyalın, ey məh,
Oda yana, suya bata nagəh.
17. Sərməsti-şərabi-iştiyaqəm,
Mədhuşi-təhəyyüri-fəraqəm,
Qoyma ğəmini mənimlə həmrah,
Faş eylərəm onu xəlqə nagah.
18. Sərməstdə ixtiyar olmaz,
Mədhuşda e'tibar olmaz.
Can oldu ğəmin yolunda bərbad,
Təşvişi-fənadən oldum azad.

9. Ey "nun" indi ki, yarın qaşları gizləndi, saqın, sən də gözümün qabağında durma. Ey "mim" onun ağzı görünmür, demək ki, sən də heçsən.

10. Ey ürəyi darıxan mürəkkəb, sənin də könlün qubarlanıb, müşk ətirlidən ayrılandan sonra, ayrılıqdan qara bağrın suya dönüb.

11. Ey qələm! Göz yaşı axıdan səbrsız avaraya dönübsən, guya dövran sənə bu gün yarın əlinin öpüşünü qismət eləməyib. Ey lövhə! O xətti yada sal, sinədə qəm qarasını nəqş et".

12. Bir neçə gün o hicran əsiri məktəbdə gəzib nalə çəkirdi, məktəblilərin ürəyini üzürdü, gecə-gündüz fəğan edib ağlayıb sevgilisinə deyərdi:

13. - "Ey gözümün işığı, könlümün yaraşığı, sənsiz kor olmuşam! Əzəldən bu aşinalıq nə idi, sonunda bu ayrılmaq nədir?

14. Niyə əvvəl məhəbbətinlə əl-ayağımı bağlayıb məni məst eylədin? Sonra niyə məni intizar əzabına saldın?

15. Ağlar ürəyimə ayrılıq odu qoydun, gözümü həsrət yaşları ilə doldurdun. Könlümün odu yana-yana göylərə şəfəq tək ucaldı, gözümün suyu sahilsiz bir dənizə çevrildi.

16. Bu günümdə yanımda heç bir dost olmasını istəmirəm. Xəyalını da yanımdan uzaq elə. Ey ayüzlüm, birdən xəyalın odda yanar, suda batar!

17. Eşq şərabının sərməstiyəm, ayrılıq huşumu başımdan alıb, qəmini mənimlə qoyma, özüm də bilmədən onu aləmə açaram.

18. Sərxoşun ixtiyarı əlində olmaz, huşsuza e'tibar eləməzlər. Qəminin yolunda canım bərbad oldu, İndi daha ölümdən qorxum yoxdur.

19. Göstərdi mənə ğəmin məzaqi,
Eyşi-əbədi, nişati-baqi.
Gər gəlsə əcəl, mənim nəm ala,
Can xud yoxdur, məgər ğəm ala.
20. Şəm'i-şəbi-möhnətü bəlayəm,
Aşüfteyi-cünbüşi-həvayəm,
Suzi-dil ilə tökülsə yaşım,
Tiği-ğəm ilə kəsilsə başım,
Candan çıxarıb həvayi-eşqi,
Tərk eyləməzəm bəlayi-eşqi.
21. Bu günləri kim, ğəm içrə zarəm,
Hicran ələmilə biqərarəm,
Gər nameyi-ömrə kilki-təqdir,
Gündür deyibən qılırsa təhrir,
Eylər məni ol hesab məğbun
Kim, surəti-haldır digərgun.
22. Gün şərti demişlər afitabi,
Billah ki, bu nüktədir hesabi.
Hər gün ki, görünməz afitabım,
Mən gün deməzəm, budur hesabım.
23. Yox kimsə bu dərdi-dildən agah,
Bu dərdi dil ilə neyləyim? Ah!
Dərdim sözə gəldiyincə artar,
Oddur, yel ilə zəbanə dartar".
Əyyami-vüsalı eyləyib yad,
Ol xəstə bu şe'ri etdi bünyad:

19. Qəmin əzabı mənə əbədi eşqin və daimi nəş'ənin nə olduğunu göstərdi. Əgər indi əcəl gəlsə mənim qəmdən başqa nəyimi alacaq? Canım ki, yoxdur.

20. Bəla və əzab gecəsinin şamıyam. Eşq havasının pərişanıyam, ürək odu ilə göz yaşı töksəm, qəm xəncəri ilə başım kəsilsə, canımdan eşq havasını çıxarıb eşq bəlasını tərk eyləmərəm.

21. Mənim qan içində ağladığım, hicran qəmindən səbrimi itirdiyim bu günlər, ömür dastanıma gündür deyə yazılsa, mən o hesabda aldanaram, çünki insanın günü-güzəranı onun halındadır.

22. Şərti olaraq günü günəşlə bağlayıblar, Allaha and olsun, ancaq mənim hesabım elə bu ayaqdandır. O gün ki, günəşim mənə görünmədi, mən onu gün saya bilmərəm.

23. Ah, bir kimsə bu ürək dərdimi bilmir. Mən öz ürəyimin dərdiylə neyləyim? Dərdim, danışdıqca artır, oddur, yel vurduqca qızışır". Vüsal vaxtların yada salıb o xəstə bu şe'ri dedi:

## ĞƏZƏLI -MƏCNUN

Ey xoş ol günlər ki, mən həmraz idim canan ilə,
Ne'məti-vəslin görüb, nazın çəkərdim can ilə.

Görməmişdi gülşəni-eyşim xəzani-təfriqə,
Olmamışdı tirə əyyamım şəbi-hicran ilə.

Məhvəşimdən, dustlar, dövran cüda istər məni,
Düşmənimdir, hiç bilmən nətmişəm dövran ilə.

Yetsə gər aşiqlərin əflakə əfğanı, nə sud,
Yetmək olmaz mahvəşlər vəslinə əfğan ilə.

Yaşırıb saxlardım eldən daği-hicranın, əgər
Etmək olsaydı müdara dideyi-giryan ilə.

Zövqdən dibaçə bağlandı kitabi-ömrümə,
Qoymadı dövran keçə övqatım ol ünvan ilə.

Ey Füzuli, əxtəri-bəxtim müsaid olmadı,
Kim, olam bir dəm müqarin ol məhi-taban ilə.

## MƏCNUNUN QƏZƏLI

O günlər xoş idi ki, cananımla sirdaş idim, görüşmək ne'mətinə çatıb, candan nazını çəkərdim.

Keyfimin gülşəni ayrılıq payızını görməmişdi, ayrılıq gecəsi günlərimi qara eyləməmişdi.

Dostlar, dövran məni ayüzlümdən ayrı görmək istəyir, amma heç bilmirəm dövrana neyləmişəm ki, düşmənimdir.

Aşiqlərin əfqanının göylərə yetməsindən nə fayda, ayüzlülərin vəslinə əfqan ilə yetmək olmaz.

Calışıb eldən hicran dağını gizlədərdim, əgər gözümün yaşı ilə yola gedə bilsəydim.

Ömür kitabımın girişi zövqdən yazıldı, dövransa günlərimi bu ünvanla keçməyə qoymadı.

Ey Füzuli, bəxt ulduzum kömək etmədi ki, bir anlığa da o parlaq ayla yaxın olam.

## TAMAMİYİ-SÜXƏN

Söz müxtəsər, ol əsiri-sevda,
Bir növ ilə oldu xəlqə rüsva
Kim, Qeys ikən, oldu adı Məcnun,
Əhvalını etdi ğəm digərgun.

## SÖZÜN SONU

Qısası, o sevda əsiri bir növ xalq içində rüsvay oldu.
Qeys ikən adı Məcnun oldu. Əhvalını qəm alt-üst elədi.

## BU, LEYLİƏ MƏCNUN GÜZƏRDƏ MÜQABİL OLDUĞUDUR VƏ GÜN MÜQABİLİNDİ HİLALİ-MEHRİ BƏDRİ-KAMİL OLDUĞUDUR

1. Bir gün ki, bahari-aləməfruz
Vermişdi cahanə feyzi-novruz,
Salmışdı niqab çöhrədən gül,
Çəkmişdi sürud-nalə bülbül.
Şəbnəm meyi-nabı ilə lalə,
Doldurmuş idi qızıl piyalə.
Olmuşdu gül ilə səbzeyi-tər,
Firuzəfüruz, lə'lpərvər.
2. Bir neçə müsahibi-vəfadar
Məcnuni-şikəstəyi görüb zar.
Hər yan dedilər ki: "Ey bəlakəş!
Gül çağıdır, olmagil müşəvvəş!
Bu fəsldə adəmi gərək şad,
Ənduhü bəlavü ğəmdən azad!
Çün əbr deyilsən, olma giryan!
Çün seyl deyilsən, etmə əfğan!
3. Gül kimi buraxma sinənə çak!
Səbzə kimi etmə bəstərin xak!
Kəmtər özünü əsiri-ğəm qıl,
Lütf eylə, xürama gəl kərəm qıl!
Səhra tutalım, mey içəlim şad,
Ənduh ilə olma böylə mö'tad!
4. Ey ğönçədəhanü sərvqamət,
Gül, oyna, zamani et fərağət!
Pakizə vücudə heyfdir ğəm,
Böylə dəxi qalmaya bu aləm,
Şayəd açıla güli-muradın,
Möhkəm qıl əsasi-e'tiqadın!
Seyr üzrə bu novbahar fəsli,
Şayəd buluna nigar vəsli".
5. Məcnuni-həzin ayağa durdu,
Səhralarə seyr üçün üz urdu.
Giryan-giryan qılırdı seyran,
Heyran-heyran gəzərdi hər yan,
Gəh səbzəyə ərzi-raz edərdi,
Gəh laləyə min niyaz edərdi,
Çeşminə sürərdi lalə dağın,
Aşiq sanuban öpüb ayağın.

## BU, MƏCNUNUN GƏZƏRKƏN LEYLİYƏ RAST GƏLMƏSİ VƏ GÜNÜN QARŞISINDA AYPARASININ BƏDİRLƏNMƏSİDİR

1. Bir gün aləmi işıqlandıran bahar dünyaya novruz feyzi gətirmişdi. Gül üzündən pərdəni götürmüş, bülbül nalə nəğməsini ucaltmışdı. Lalələr şeh meyindən qızıl piyalə doldurmuşdu. Gül ilə təzə yaşıllıq firuzə ilə qızılı andırırdı.

2. Bir neçə vəfalı həmsöhbəti Məcnun yazığı ağlar görüb hər tərəfdən dedilər ki: - ay başı bəlalı, gül çağıdır, pərişan olma! Bu fəsildə gərək adam şad, qəm-qüssədən azad olsun! Bulud deyilsən ki, ağlama! Sel deyilsən ki, fəryad qılma!

3. Gül kimi yaxanı yırtma! Göy ot kimi yatağını torpaq eləmə! Az özünü qəmə əsir eylə, rəhmə gəl, bir az şadlan, kərəm elə! Çəmənə çıxaq, mey içib sevinək, bu qədər qüssəyə batma!

4. Ey qönçədəhan, sərvqamət, oyna, gül bir az rahatlan! Təmiz vücuda bu qədər qəm çəkmək heyfdir. Dünya belə qalmayacaq, bəlkə də muradının gülü açılar. Inamının əsasını möhkəm elə! Bu yaz fəslində bir az gəzməyə çıxsaq, bəlkə yarınla da görüşərsən.

5. Dərdli Məcnun ayağa durdu, gəzmək üçün səhraya üz tutdu. Ağlaya-ağlaya seyr eləyirdi, heyran-heyran hər yanı gəzirdi, gah sirrini yaşıl otlara açırdı, gah laləyə yalvarırdı. Lalənin sinəsinin dağını gözlərinə sürtərdi, onu aşiq bilib ayağından öpərdi.

6. Nergiz gözüne nigah ederdi,
Yarın gözün anub, ah ederdi.
Söylerdi benevşeye ğemi-dil,
Kim, söyleye yare olsa vasil.
Bülbüllere şerh ederdi halın,
Qumrulara möhnetü melalın.

7. Her türfe çiçek görüb, çekib ah,
Menzil-menzil gezerdi, nagah
Bir menzile düşdü rehgüzari
Kim, seyrde idi onda yari,
Bir neçe perirüx ile hemdem,
Mecnuni-şikesteden müqeddem
Leyli güzer etmiş ol fezaye,
Salmış gülü lale üzre saye.

8. Bir sebzeye sebz xergeh urmuş,
Meh sehni-çemende hale qurmuş.
Ğönçe kimi ol letif xergah,
Gül bergi kimi içinde ol mah.
Mecnune müqabil oldu Leyli,
Behri-ğeme yetdi derd seyli:

9. Leyli deme—şem'i-meclisefruz,
Mecnun deme—ateşi-cigersuz.
Leyli deme—cennet içre bir hur,
Mecnun deme—zülmet içre bir nur.
Leyli deme—övci-hüsne bir mah,
Mecnun deme—mülki-eşqe bir şah.
Leyli deme—bir yeganeyi-dehr,
Mecnun deme—bir fesaneyi-şehr.

10. Leyli—çemeni-bela nihalı,
Mecnun—feleki-vefa hilalı.
Leyli—mehi-asimani-heşmet,
Mecnun—şehi-kişveri-melamet.
Leyli—sefi-ehli-hüsn emiri,
Mecnun—seri-kuyi-ğem feqiri.
Leyli işi—işvevü girişme,
Mecnun gözü yaşı—çeşme-çeşme.

11. Leyliyü nişati-hüsn kami,
Mecnunü belayi-eşq damı.
Leyliyü letafeti-dilaray,
Mecnunü melameti-ğemefzay.
Leylide kemali-hüsn ile zövq,
Mecnunda cemali-Leyliye şövq.
Leyli - sedefi-heyaye bir dür,
Mecnuna onunla min tefaxür.
Leylide visali-dust meyli,
Mecnunda hem arizuyi-Leyli.

6. Nergizin gözüne baxarken, yarın gözünü yada salıb ah çekerdi. Üreyinin derdini benövşelere söyleyirdi ki, eger yara rast gelseler, ona yetirsinler. Bülbüllere halını anladırdı, qumrulara derd-qeminden danışardı.

7. Her türfe çiçek gördükce ah çekib menzil-menzil gezirdi. Gözlenilmeden yolu bir yere düşdü ki, orada sevgilisi de bir neçe gülüzlü ile birlikde, Mecnun xesteden ayrı gezib, kölgesini laleliklere salırdı.

8. Bir çemende yaşıl çadır qurmuşdu, ele bil ki, ay yaşıllıqda hale salmışdı. O gözel çadır qönçeye ayüzlü ise onun içinde gül yarpağına benzeyirdi. Leyli-Mecnun üz-üze geldi - derdin seli qem denizine qovuşdu:

9. Leyli deme—meclisin işıqlı şamı,
Mecnun deme—ciyer yandıran ateş,
Leyli deme—cennet içinde huri,
Mecnun deme—zülmet içinde nur.
Leyli deme—gözellik zirvesinde bir ay,
Mecnun deme—eşq mülkünde bir şah,
Leyli deme—zemanenin yeganesi,
Mecnun deme—bir şeherin efsanesi.

10. Leyli—bela çemeninin genc servi
Mecnun—vefa göylerinde bir aypara,
Leyli—heşemetli göylerde bir ay,
Mecnun—mezemmet dünyasının şahı.
Leyli—gözeller cergesinin emiresi,
Mecnun—qem diyarının feqiri.
Leylinin işi—naz ve işve.
Mecnunun göz yaşı—çeşme-çeşme.

11. Leyli—gözellik neş'esinin kamı,
Mecnun—eşq belasının dustağı.
Leyli—könül bezeyen zeriflik,
Mecnun—qem artıran melamet.
Leylide kamil gözellik ve zövq,
Mecnunda—Leyli gözelliyine şövq.
Leyli—heya sedefinin incisi,
Mecnun—onunla sonsuz fexr eden.
Leylide—sevgilisiyle vüsal meyli,
Mecnunda—Leyli arzusu.

12. Ol iki sehiqedü semenber
Bir-birine oldular beraber.
Fulade sataşdı sengi-xare,
Od düşdü qerarü ixtiyare.
Bir saza düzüldü ol iki tar,
Germ oldu revaci-naleyi-zar.
Ol baxdı buna, nişat buldu,
Bu gördü onu, müqeyyed oldu.

13. Mecnunda qerar tutmayıb huş,
Deryayi-teheyyür eyledi cuş.
Bir dem baxa bilmedi ol aye,
Döşendi yer üzre misli-saye.

14. Leyli hem itirdi ixtiyarın,
Bir dem göre bilmedi nigarın,
Heyranlığı ol meqame yetdi
Kim, düşdü ayaqdan, usu getdi.
Gül suyu sepib revan üzüne,
Leylini getirdiler özüne.

15. Her yan dediler ona ki: - "Ey mah!
Nageh olur atan-anan agah
Kim, ğeyr ile aşina olubsan,
Bir dilbere mübtela olubsan.
Vermez bu reviş neticeyi-xub,
Şayeste deyil sene bu üslub!
Yaxşı nezer eylesen yamandır,
Hem bize ve hem sene ziyandır".

16. Ondan götürüb büsatü xergah,
Ol mahliqayi, xahü naxah,
Öz bürcüne qıldılar revane,
Ta olmaya vaqif ate-ane.
Söz demediler bu maceraden,
Ne gencdenü ne ejdehaden.

17. Mecnunu hem etdi çeşmi-xunbar,
Sular saçıban üzüne, bidar.
Gördü ki, nigardan nişan yox,
Bir cismi-füsürde var, can yox.
Divane qalıb, peri gedibdir,
Salıb onu dilberi gedibdir.
Çak eyledi came, çekdi nale,
Halı bedel oldu özge hale.

12. O iki serv qametli ve yasemen boylu bir-birile qarşılaşdı, polad çaxmaq daşına deydi, sebre, qerara od düşdü. Iki sim bir saza çekildi, ağlama ve inleme meydanı qızışdı! O baxdı buna sevindi. Bu onu görüb el-qolu bağlandı!

13. Mecnun huşunu itirdi, heyranlıq deryası coşdu, birce anlığa o aya baxa bilmedi, kölge kimi yere serildi.

14. Leyli de ixtiyarını itirib nigarını bir an bele göre bilmedi. Heyranlığı o yere çatdı ki, yıxıldı, huşu getdi. Üzüne gül suyu sepib Leylini özüne getirdiler.

15. Her yandan ona dediler ki, "ey ayüzlü, birden atan-anan xeber tutar ki, özge ile aşina olubsan, bir gözele esir olubsan, bu hereket yaxşı netice vermez, sene bele hereket layiq deyil. Yaxşı baxsan, bu, yamandır, hem sene, hem de bize ziyandır".

16. Oradan çadır ve xalılarını yığışdırıb o ayüzlünü ister-istemez öz bürcüne (çadırına) apardılar ki, ata-ana xeber tutmasın. Bu maceradan - ne xezineden, ne ejdehadan bir söz açmadılar.

17. Qan-yaşlı gözlerinin suyu üzüne sepilib Mecnunu oyatdı. Gördü ki, nigarından bir nişan yoxdur, solğun bir beden var, cansa yoxdur. Divane qalıb, peri gedibdir. Geyimini yırtıb, nale çekdi, halı özge hala düşdü.



18. Tərk etdi libasi-laləguni,
Rəxt oldu təninə əşki xuni.
Gər matəm üçün misali-xamə,
Sarmışdı başa siyəh əmamə,
Çizgindi başına dudi-ahi,
Yandırdı əmaməyi-siyahi.
İkrah ilə çıxdı pirəhəndən,
Ar etdi şəhidi-ğəm kəfəndən.

19. Nə'leyni buraxdı ol bəlacu
Kim, aşiqə payibənddir bu.
Həmdəmlərə üzr qıldı ağaz:
- "Key bir neçə həmnişinü həmraz!
Seylabi-hücumi əşq yetdi,
Mən şiyftəhalı ğərq etdi.
Olman məni-xəstə ilə həmdəm,
Ta batmayasız bu suya siz həm.

20. Mən rəngi-məlamətə boyandım,
Sövdazədəlik oduna yandım.
Əlbəttə, bu od ki, düşdü canə,
Axır tutuşub çəkər zəbanə.
Düşvar bəlami səhl sanman!
Siz dəxi mənim oduma yanman!
Məndən sizə düşməsin bir əxkər,
Çün dəymədi xeyr, dəyməsin şər.

21. Sövda siyəh etdi ruzigarım,
Eşq aldı inani-ixtiyarım.
Mən bir quşam, uçdum aşiyandan,
Mən qandanü meyli-xanə qandan.
Qılman mənə ev hekayətin çox,
Dəxi mənim onda getməyim yox!

22. Sizdən sorar olsa ata halım,
Keyfiyyəti-möhnətü məlalım,
Söylən ki: "fənayə verdi rəxtin,
Əyyam siyah qıldı bəxtin.
Ey piri-şikəstəhalü naşad!
Tanrıçün əlimdən eyləmə dad.
Demə ki, "nədir bu macəralər?"
Səndən mənə yetdi bu bəlalər!
Mən bilməz idim ğəmi-cəhani,
Təşvişi-zəminü asimani.

18. Lalə rəngli paltarını tulladı. Paltarı qanlı göz yaşları oldu. Başına yüksələn ahının odu, matəm nişanı olaraq qələmin qara ucu tək, başına bağladığı qara əmmaməni yandırdı. Köynəyindən çiyrənərək əynindən çıxardı, qəm şəhidi kəfənindən utandı.

19. Aşiqə ayaqqabı da buxovdur, deyə onları da tulladı, o bəlakeş həmdərdlərindən üzr istədi: "Ey mənim dostlarım, sirdaşlarım! Göz yaşlarımın seli üstümə hücum etdi və mən yazığı qərq elədi. Mən xəstəylə durub-oturmayın ki, bu suda siz də batmayasınız.

20. Mən məlamət rənginə boyandım, sevda vurğunluğu odunda yandım. Bu od ki, cana düşdü, əlbəttə alışıb yüksələcəkdir. Çətin bəlamı asan sanmayın! Siz də mənim oduma yanmayın! Məndən sizə bir qığılcım düşməsin; xeyir dəymədi, barı şərim də dəyməsin!

21. Sevda günümü qara etdi, eşq irədəmin cilovunu əlimdən aldı. Mən bir quşam, yuvamdan uçub getdim. Mən hara, ev meyli hara. Mənə evdən çox da danışmayın. Mən daha ora getmərəm.

22. Atam sizdən halımı, dərdimi, məlalımı sorsa, deyin ki: "Əyin-başını yox elədi, zaman onun bəxtini qaraltdı. Ey şadlıq bilməyən əzilmiş bükülmüş qocaman, mənim ucumdan tanrıdan dad eləmə, demə ki, nədir bu macəralar?" Səndən yetişdi mənə bu bəlalar! Mən dünya qəmini, yerin, göyün təşvişini bilməz idim.

23. Asudə səraçeyi-ədəmdə
Nə ğüssədə idimü nə ğəmdə.
Bilməzlik ilə xoş idi halım,
Nə hüsn, nə eşq idi xəyalım.
Sən vasitəyi-vücudim oldun!
Sən manei-feyzi-cudim oldun!
Umdun ki, mənimlə olasan şad,
Dərda ki, ümidin oldu bərbad.
24. Mən yox olubam, sən indi var ol!
Özgə xələfə ümidvar ol!
Mə'zur tut, ey əziz, mə'zur!
Mən qəsd ilə səndən olmadım dur.
Çox sidq ilə eylədim ona əzm
Kim, dövləti-vəslinə edəm cəzm,
Su saldı yoluma əşki-həsrət,
Damanımı tutdu xari-möhnət".
Təhrir qılıb münasibi-hal.
Bu şe'ri həm etdi ona irsal:

23. Heçlik sarayında asudə idim, nə qüssəm, nə də qəmim var idi, bilməzliyimlə halım xoş idi, xəyalımda nə gözəllik, nə də eşq var idi. Sən mənim yaranmağımın vasitəsi oldun! Yoxluq nəş'əsindən məni ayırdın. Istədin ki, mənimlə şad olasan, nə böyük dərd ki, ümidin bərbad oldu.

24. Mən yox olmuşam, indi sən var ol! Umudunu özgə oğula bağla. Məni üzürlü say, ey əzizim, üzürlü! Mən qəsd ilə səndən ayrılmadım. Mən çalışdım ki, səni xoşbəxtliyə çatdıram, ətəyimə möhnət, həsrət tikanları ilişdi, göz yaşları yolumu sel kimi basdı. Bu hala münasib bir şe'r də yazıb göndərdi:

## ĞƏZƏL

Fəzayi-eşqi çün gördüm, səlahi-əqldən durəm,
Məni rüsva görüb, eyb etmə, ey naseh ki, mə'zurəm!

Əgər çaki-giriban eyləsəm, mən' eyləmən, çün mən
Mətai-nəngdən ari, libasi-ardən urəm.

Mənü səhrayi-vəhşət, mənzil etməm afiyət küncün,
Əsiri-dami-zülmət olmazam, çün talibi-nurəm.

Təmərrüd, əql fərmanından etsəm, dustlar, billah,
Məni rə'yimlə sanmın, eşq sultaninə mə'murəm.

Mənə kim tə'nə eylər, kim nəsihət əhli-aləmdən,
Xoşam kim, e'tibari-eşq ilə hər dildə məzkurəm.

Bəlayi-eşqü dərdi-dust tərkin qılmazam, zahid,
Nə müştaqi-bəhiştəm sən kimi, nə talibi-hurəm.

Xəyali-çini-zülfü taqi-əbrusilə zövqüm gör,
Sanasan həşmət ilə kəsriyəm, qədr ilə fəğfurəm.

Ğərəz bir ad imiş aləmdə, mən həm eylərəm bir ad,
Bihəmdillah, Füzuli, rindü rüsvalıqda məşhurəm.

## QƏZƏL

Eşq fezasını gördüyümçün düzgün ağıldan uzağam,
meni rüsvay görüb, ey nesihet veren, eyb tutma, üzürlüyem!

Əger yaxamı yırtsam, fikrimden daşındırmayın, çünki men
utanmaqdan temizlenmişem, ar libasımı çıxarmışam.

Menim yerim vehşet sehrasıdır, salamatlıq küncünü menzil elemerem,
qaranlıq telesinin esiri olmaram, çünki işıq isteyirem.

Əqlin emrinden çıxsam, dostlar, vallah, ele bilmeyin ki,
öz razılığımladır, men eşq sultanının quluyam.

Mene dünya ehlinden kimi te'ne eder, kimi nesihet,
xoşdur ki, eşqe e'tibarım ile dillere düşmüşem.

Eşq belasından ve dost derdinden el çekmerem, zahid,
ne senin kimi behişt aşiqiyem, ne de huri isteyirem.

Seadetim yarın qıvrım saçlarının ve çatma
qaşının xeyali iledir, ele bil ki, ucalıqda kesrayam,* qiymet vermekde feğfuram.*

Meqsed dünyada bir ad imiş, men de bir ad çıxarmışam
Allaha şükür, Füzuli, rindlik ve rüsvaylıqda meşhuram.

## TƏMAMİYİ SÜXƏN

1. Ol şiveyi-eşq içinde mahir
   Qıldıqda vesiyyetini axir,
   Qıldı gözedib teriqi-vəhşət,
   Əshabdən inqitai-ülfet.
   Səhraye düşüb, güneş misali,
   Tenha yürür oldu laübali.
2. Her daşe ki, yetdi, tökdü yaşın,
   Le'l eylədi kuhü deşt daşın.
   Göz yaşını bes ki, tökdü hər su,
   Hər merheleden axıtdı min cu.
   Bir ebri-bəla idi, güvahi;
   Baran–sirişki, bərq–ahi.
3. Baran ile bərqi cismü candan,
   Bir mertebede ki, mundan, ondan
   Deryalere yetse lem'əyi-tab,
   Sehralere düşse qetrəyi-ab,
   Deryalar olurdu cümle səhra,
   Səhraler olurdu cümle derya.
4. Feryad ile doldurub bu deyri,
   Feryade getirdi vehşü teyri,
   Əfğanı yetirdi asimane,
   Ateş salıb ah ile cahane.

## SÖZÜN SONU

1. O eşq senetinin mahir ustası vesiyyetini sona yetirdikdən sonra dostlarla aranı kesib, vəhşiler kimi yoluna düzeldi, sehralara düşüb güneş kimi tək ve qayğısız gezdi.

2. Göz yaşını tökdüyü hər sehra daşı le'le çevrildi. Gözünün yaşını hansı terefe axıtdısa min çay çağladı. Şahidi bir bela buludu, göz yaşları - yağış, ahı-şimşək idi.

3. Cisminde ve canında qalan yağış ve şimşekden bir ğılıcım deryaya düşseydi ve bir damcı səhraya düşseydi, deryalar hamısı səhraya çevrilerdi, sehralar deryaya dönerdi.

4. Bu yeri feryadı ile doldurub vehşileri ve quşları da inlədirdi. Əfqanını göylere ucaldıb, ahı ile dünyaya od salırdı.

## BU, MƏCNUN ATASI VAQİFİ-HAL OLDUĞUDUR VƏ ONU BİYABANİ-MEHNƏTDƏ BULDUĞUDUR

1. Gencinegüşayi-gencgöftar
Olmuş bu eda ile güherbar:
Kol bir neçe biqerarü mehzun
Naçar qılıb vidai-Mecnun,
Nomid dönüb şikestevü xar,
Qıldılar atasını xeberdar.
2. Ol pir çü vaqif oldu hale,
Mecnun kimi etdi ahü nale.
Sehralara tutdu seyl tek üz,
Vadilere açdı çeşme tek göz,
Çox aradı, gezdi her mekanı,
Bulunmadı oğlunun nişanı.
3. Ta aqibet ol şikestehali,
Bir guşede gördü laübali
Düşmüş yere, xakisarü ğemnak,
Əhvalı xerabü sinesi çak.
Dönmüş güli-sürxi ze'ferane,
Şimşadi-letifi xizerane.
4. Ayinesini ğübar tutmuş;
Jengi-ğemi-ruzigar tutmuş;
Etmiş elifin sitem yükü dal,
Qılmış qelemin felek ğemi nal.
5. Hemsöhbeti murü hemdemi mar,
Tekyegehi xakü besteri xar.
Xar üzre ona delik-delik ten,
Açmış ğem evine dürlü rövzen.
6. Ol pir çü gördü sureti-hal,
Suret kimi qaldı bir zaman lal.
Bir lehze onu teheyyür aldı,
Heyret gözü ile baxa qaldı.
Sonra yaxa yırtıb etdi feryad;
7. - "Key bülbüli-bustani-bidad!
Hali-dilini mene beyan et,
Əsrari-nihanini eyan et.
Kim aldı elinden ixtiyarın?
Kim eyledi tire ruzigarın?
Billah, nete biqerar olubsan,
Aşüfteyi-ruzigar olubsan!

## BU, MƏCNUNUN ATASININ VƏZİYYƏTDƏN XƏBƏRDAR OLMASIDIR VƏ ONU MÖHNƏT SƏHRASINDA TAPDIĞIDIR

1. Söz xezinesinin xezine sözlü xezinedarı belə gövhər saçıb: Bir neçə səbrini itirmiş dərdli ümidsiz qalıb Məcnunla vidalaşıb, üzgün-əzgin dönüb Məcnunun atasına xəbər gətirdi.

2. Bu haldan xəbər tutan o pirani qoca Məcnun kimi ah-nalə elədi, sel tək səhralara üz tutdu, çeşmə tək vadilərə yönəldi, çox yerləri aradı, gəzdi, oğlundan bir nişan tapmadı.

3. Nəhayət, o bədbəxti bir guşədə üzgün, özündən xəbərsiz yerə sərilmiş, başı torpaqlı, dərdli, sinəsi yaralanmış, gül üzü ze'fərana, şümşad boyu qarğıya dönmüş;

4. Üzünün aynasını toz basmış, taleyin qəmindən paslanmış halda, elif qəddi əzab yükündən bükülüb dala dönmüş, fələyin qəmindən qələm qamətini nal kimi əyilmiş halda gördü.

5. Həmsöhbəti qarışqalar, dostları ilanlar idi. Sığınacağı torpaq, yatağı tikan idi. Tikan üstündə delik-dəlik olmuş bədən qəm evinə açılmış pəncərəyə bənzəyirdi.

6. O qoca bu vəziyyəti görüb, bir anlığa şəkil kimi təəccüblə dondu, heyrət içində baxa-baxa qaldı. Sonra yaxasını cırıb fəryad qopardı:

7. - "Ey bu zülm bağçasının bülbülü! Ürəyinin halını mənə anlat, gizli sirrini aç. Əlindən ixtiyarını kim aldı, kim gününü qara elədi? Vallah, nə yaman səbrini itiribsən və zəmanənin ən bədbəxti olmusan.

8. Nə seyrdesən, sene teleb ne?
Bu naleyi-zarine sebeb ne?
Dəryade isə sene düri-kam,
Sən söylə, mən eyleyim serencam.
Zülmatdə ise şem'i-meqsud,
Rövşən qılü mənden iste mövcud".

9. Məcnun dedi: "Ey mene veren pend!
Danayi-süxənvərü xiredmend!
Kimsən, nedurur bu göftgulər,
Bifaide batil arizulər?
Get, dərdime sən deva deyilsən!
Biganesən, aşina deyilsən!
Mən böyle kelame tutmazam guş,
Leyli sözü söylə, yoxsa xamuş!"

10. Dedi: "Mənəm, atan, ey belakeş,
Mən sengi-melametem, sən ateş!"
Dedi: - "Nədir ate, yoxsa ane?
Leyli gerək, özgedir fesane".

11. Çün gördü itaetinde ehmal,
Bildi ki, feqir özgedir hal,
Verdi bu firib ile teselli,
Kim: "Dur gedelim, çağırdı Leyli!
Leyli bize gəldi, mihmandır,
Le'li telebinde dürfeşandır",

12. Məcnun ki, eşitdi Leyli adın,
Sandı ki, felek verer muradın,
"Ləbbeyk" deyib, ayağa durdu,
Ol ke'beyi-meqsede üz urdu.

13. Pir ile cavani-dilşikəste,
Gəldi eve dilfikarü xeste,
Başında hevayi-vesli-Leyli,
Nə ata ğemi, ne ana meyli.
Gah ata nesihet etdi ağaz,
Gah anası oldu pendpərdaz.

8. Nə gezirsən, axtardığın nədir? Bu nalə və ağlamanın səbəbi nədir? Əgər sənin kamının incisi dəryalardadırsa, de, mən, onu tapdırım. Arzunun şamı zülmətdədirsə, anlat məndən, istə, tapım.

9. Məcnun dedi: - "Ey mənə öyüd verən gözəl sözlü və ağıllı! Kimsən, bu söhbət və mə'nasız, faydasız arzular nə deməkdir? Get, sən dərdimə dərman deyilsən, yadsan, dost deyilsən! Mən belə sözlərə qulaq asmaram. Ya "Leyli" sözünü söylə, ya sus!"

10. Qoca dedi: - "Mən sənin atanam, ay başı bəlalı, mən məzəmmət daşıyam, sən ateşsən". Məcnun cavabında: - "Ata nədir, ana nədir, mənə Leyli gərəkdir, özgə nə varsa, əfsanədir"- dedi.

11. Itaətdə ləngidiyini görüb, yazıq qoca halı duydu və hiyləyə əl atıb, əhməkcə təsəlli verib dedi: - "Dur gedək, Leyli çağırır, o bizə gəlib, qonağımızdır, və dodaqları səni deyib inci saçır".

12. Məcnun Leyli adını eşidib elə bildi ki, fələk onu muradına yetirib. "Ləbbeyk" (başüstə, buyurun) deyib ayağa durdu və öz arzusunun kə'bəsinə tərəf üz tutdu.

13. Qoca ilə ürəyi üzgün cavan evə gəldilər. Başında Leyli vəslinin havası idi, nə ata qəmi, nə ana meyli var idi. Gah atası nəsihət eləyirdi, gah anası öyüd verirdi.

## BU, MƏCNUNA ANASI PƏND VERDİYİDİR VƏ BUSTANİ-MƏLAMƏTDƏN XARİ-NƏDAMƏT DƏRDİYİDİR

1. -"Key raheti-canü nuri-dide!
Fərzendi-yeganeyi-güzide!
Şə'nində reyaseti-ərəb var!
Mirasi-şücaətü ədəb var!
Ətvari-müluki tut həmişə,
Ayini-şücaət eylə pişə!
2. Əbruyi-xəm isə gör muradın,
Süst etmə kəmanə e'tiqadın!
Müjgani-siyahdən götür dil,
Ol navüki-cansitanə mail!
Olsan nigərani-qəddü qamət,
Qıl nizəyi-xunfəşanə rəğbət!
Gər zülf ilə görmək istəsən xal,
Gör hey'əti-nöqtə, peykəri-dal!
3. Könlün gözü qaşa olsa məftun,
Gör dideyi-eynü əbruyi-nun!
Sən sərvsən, olmagil giranbar!
Azad ola gör, nə kim giriftar!
Sən lə'lsən, olmagil səbüksəng,
Döndərmə günəş görüb rəvan rəng!
4. Etmə özünü hübabmanənd,
Başında olan həvaya xürsənd!
Kim, yoxdurur ol həvayə bünyad,
Başın olur ol həvadə bərbad.
Sərgərmlik etmə şəm' nisbət,
Suzi-ğəmi-eşq ilə mürüvvət,
Gör şəm'i necə düşər bəlayə,
Başına gedən, gedər fənayə.
5. Zövqi-dilü didə qılma adət!
Salma meyü şahidə iradət!
Məhbubü mey ilə bəsləyən can,
Sanma olur əhli-əqlü iman!
Əqlimi olur müdam məstin?
İmanı olurmu bütpərəstin?
Şe'rə həvəs etmə kim, yamandır,
Yaxşı desələr onu, yalandır!

## BU, MƏCNUNA ANASININ ÖYÜD VERDİYİDİR VƏ MƏZƏMMƏT BUSTANINDAN PEŞİMANÇILIQ TİKANI DƏRDİYİDİR

1. Ey canımın rahatlığı, gözümün işığı! Yeganə seçilmiş oğlum! Sən ərəb başçısı adını daşıyırsan, ədəb və şücaət varisisən! Maldan, mülkdən yapış, şücaət göstərməyi sənət seç!

2. Əgər istəyin əyri qaşlıdırsa, inamını bir kamana bağla! Qara kipriklərdən ürəyini ayır, can alan oxdan yapış! Qədd-qamət istəyirsənsə, qan tökən nizədən yapış! Qıvrım zülf və xal görmək istəyirsənsə, nöqtənin duruşunu və "dal"ın şəklini gör!

3. Könlün gözə-qaşa aşiqdirsə "eyn"-in gözünü və "nun"un qaşını gör. Sən sərvsən; ağır yük daşıma, azad ol, giriftar olma, sən lə'lsən yüngül daş olma, günəş görən kimi rəngini itirmə.

4. Köpüyə bənzəmə, başının havasıyla qürrələnmə, çünki o havanın bünövrəsi yoxdur, o havadan başın da bərbad olar. İnsaf elə, eşq qəminin odundan şam kimi başı odlu olma. Gör şam necə bəlaya düşür. Başından yanan heçə dönər.

5. Gözünün və ürəyinin zövqünə adət eləmə, şəraba və gözələ meyl eləmə! Sanma ki, meyə və gözələ canın verən əql və iman sahibi olur. Daim məst olanın əqli olarmı? Bütpərəstin imanı olarmı? Şe'rə həvəs göstərmə ki, yamandır, ona yaxşıdır desələr , yalandır!

6. Hala qıla gör kemal hasil,
Fövt etme məcal, gezmə ğafil!
Ey bağı-ümidimiz nihali,
Qılma bizi nəng payimali!
Məhbub həm istəsən, kəm olmaz,
Biz kim, səniniz, sənə ğəm olmaz.
7. Vardır bu heşəmdə min qəbilə,
Hər taifə içrə min cəmilə.
Bir-bir qılalım qamu sənə ərz,
Yetsin yerinə bizə olan fərz,
Bir sərvi-səhiqədü səmənbər,
Təzvicini edəlim müqərrər,
Tə'yin edəlim sənə məhü sal,
Sərf eyləyə bildiyincə əmval,
Sən tutma həmin təriqi-vəhşət,
Qət'i-nəsəb eyləmə əmanət!
8. Bizdən bu nəsihəti qəbul et!
Hər ləhzə bizi, yetər, məlul et!
Üşşaq səfahətin qılıb yad,
Bu şe'ri nə xoş demiş bir ustad:

6. Hələ ağıllanmaq mümkündür, fürsəti əldən vermə, qafil olma! Ey ümid bağımızın cavan sərvi, bizi biabırçılıq ayağı altında tapdalama! Sevgili istəsən, az deyil, biz ki səninik, qəmin ola bilməz.

7. Bu eldə min qəbilə var, hər tayfanın min gözəli var. Bir-bir hamısını sənə sayaq və borcumuzu yerinə yetirək, səni bir sərvboylu yasəmən sifətlə nişanlayaq, toyun ayını, ilini sənə deyək və istədiyincə mal-dövlət verək. Sən vəhşilik yolunu tutma. Əslin-nəsəbinlə aranı kəsmə!

8. Bizdən bu nəsihəti qəbul et! Bəsdir bizə hər an dərd verdiyin! Aşiqlərin axmaqlığını yad eyləyərək ustad bu şe'ri çox gözəl deyib:

## QƏZƏLİ-USTAD

Can verme ğəmi-eşqə ki, eşq afəti-candır,
Eşq afəti-can olduğu məşhuri-cahandır!

Sud istəmə sevdayi-ğəmi-eşqdə hərgiz
Kim, hasili-sövdayi-ğəmi eşq ziyandır!

Hər əbruyi-xəm qətlinə bir xəncəri-xunriz,
Hər zülfi-siyəh qəsdinə bir əf'i ilandır!

Yaxşı görünür surəti məhvəşlərin, əmma
Yaxşı nəzər etdikdə sərəncamı yamandır!

Eşq içrə əzab olduğun ondan bilirəm kim,
Hər kimsə ki, aşiqdir, işi ahü fəğandır!

Yad etmə qara gözlülərin mərdümi-çeşmin,
Mərdüm deyib aldanma kim, içdikləri qandır!

Gər dersə Füzuli ki, "gözəllərdə vəfa var",
Aldanma ki, şair sözü, əlbəttə, yalandır.

## USTAD QƏZƏLİ

Eşq qəminə can vermə, o, canın bəlasıdır,
eşqin can bəlası olduğu aləmdə məşhurdur!

Eşq qəminin sevdasında heç vaxt fayda axtarma,
çünki, eşq qəminin sevdasının nəticəsi ziyandı

Hər əyri qaş səni öldürəcək qanlı xəncər,
hər qara saç sənə qəsd edəcək əfi ilandır!

Yaxşı görünür ayüzlülərin üzləri, amma
yaxşı baxsan, son nəticəsi yamandır.

Eşq içində əzab olduğunu ondan bilirəm ki,
kim ki aşiqdir, işi ahı-fəğandır!

Qara gözlülərin göz bəbəyini yada salma,
insan deyib aldanma ki, içdikləri qandır.

Əgər Füzuli deyirsə ki, "gözəllərdə vəfa var",
aldanma ki, şair sözü, əlbəttə, yalandır.

## BU, MƏCNUNUN NƏSİHƏT QƏBUL ETMƏDİYİDİR VƏ ATASININ DƏRDİ DƏRMANA YETMƏDİYİDİR

1. Məcnun ki, eşitdi bu xitabı,
Verdi bu ədа ilə cəvabı:
- "Key ruhi-rəvanım ata, ana!
Kami-dilü canım ata, ana!
Təhqiq edübəm işim xətadır,
Hər nə desəniz mənə rəvadır.

2. Aludeyi-rəngi-dudi-ahəm,
Zülli-günəh ilə rusiyahəm.
Mən həm olubam bu işdən agah,
Əmma nə deyim, nə söyləyim? Ah!
Yoxdur bu işimdə ixtiyarım,
Zəbtimdə inani-iqtidarım!

3. Əql oldu zəifü eşq ğalib,
Xatir, nigəran, nigar cazib.
Tutdu tənü canımı ğəmi-yar,
Ğeyrəl-məhbub leysə fiddar.

4. Məndə dəxi necə mənlik olsun,
Məndən məni istəyən nə bulsun?
Təqdir çü böylədir, nə tədbir,
Təqdiri edərmi kimsə təğyir?
Olsaydı mənə nişat ruzi,
İstərmi idim bu dərdü suzi?
Gər səhhətə qadir olsa bimar,
Dərdə özün eyləməz giriftar.

5. Əl versə gədayə padişalıq,
Sanman ki, qılır dəxi gədalıq,
Fitrətdə nə halət olsa məqsum,
Rəf olmadığıdır əmri-mə'lum.
İslahıma eyləmən təəmmül
Kim, gül tikan olmaz, tikan gül,
Keyfiyyəti-abü cövhəri-xak,
Dönmək olamı qəbuli-idrak.
Su süfləliyindən ayrılırmı?
Od yandıra bilməyə bilirmi?

BU, MƏCNUNUN NƏSİHƏT QƏBUL ETMƏDİYİDİR VƏ ATASININ DƏRDİ DƏRMANA YETMƏDİYİDİR

1. Məcnun bu müraciəti eşidib cavab verdi: - "Ey mənim ruhi-rəvanım atam və anam! Ey mənim ürəyimin kamı, canım atam, anam! İşimin səhv olduğunu anlamışam və mənə hər nə desəniz, haqdır.

2. Ah tüstüsünün rənginə boyanmışam, günahımın kölgəsində üzü qarayam. Bu işdən mən də xəbərdaram, amma nə deyim, nə eyləyim, ah! Bu işdə əlimdə ixtiyarım, öz cilovumu saxlamağa gücüm yoxdur.

3. Əqlim zəif, eşqim güclü çıxdı. Xatirim nigaran, nigarım cazibədardır. Canımı, bədənimi yarımın dərdi tutub, dünyamda sevgilimdən başqası yoxdur.

4. Məndə necə mənlik ola bilər? Məndən məni istəyən nə ala bilər? Qismət belədirsə, neyləmək olar, kim taleyini dəyişdirə bilib. Əgər şadlıq mənim qidam olsaydı, heç bu yanğı və dərdi istərdimmi? Xəstənin sağalma imkanı olsa, özünü dərdə salmaz.

5. Dilənçiyə padşahlıq qismət olsaydı, elə bilməyin ki, o yenə də dilənçilik edərdi. İnsanın anadangəlmə qisməti nədirsə, onun dəyişilmədiyi, mə'lum işdir. Mən özümü düzəltmək haqqında düşünən deyiləm, çünki gül tikana, tikan gülə çevrilə bilməz. Suyun və torpağın təbiətini dəyişməsini ağıl qəbul edərmi, su axarlığından ayrılarmı? Od yandırmaya bilərmi?

6. Ol gün ki, rəhimdə kilki-qüdrət,
Icadıma verdi ziybi-surət,
Doldurdu heva ilə dimağım,
Sevda ilə bağladı ayağım,
Doldu bədənimdəki rəgü-pust,
Başdan-ayağa məhəbbəti-dust.
Mülk eylədi könlümü bəlayə,
Vəqf eylədi canımı cəfayə.
7. Yox məndə bu hökmdən təxəllüf,
Ol maliki-vəqfədir təsərrüf.
Dərdi-əzəli dəva bulurmu?
Mehri-əbədi fəna bulurmu?
Mən şəm'i-səraçeyi-fəraqəm,
Suzi-cigər ilə xoşməzaqəm.
Məndən diləyən bu suzi zail,
Bidadıma olmuş ola mail.
8. Şəm'in ki, həyatı oldu ateş,
Halı onun ateşilədir xoş.
Oddan diləyən onun nicatın,
Fani diləmiş ola həyatın.
Düşmənliyə dustluq qılıb ad,
Tədbiri-nəcatım eyləmən yad!
Mən ğərqeyi-bəhri-şövqi-yarəm,
Bərhəmzədeyi-ğəmi-nigarəm.
9. Ancaq səbəbi-qərarım oldur,
Arami-dili-figarım oldur.
Onunla edin bu dərdə mərhəm,
Urman dəxi özgə kimsədən dəm.
10. Dersiz mənə var dilrübalər,
Leyli kimi çox pəriliqalər...
Billah, deməniz bu hərfi zinhar,
Aləmdə bir ondan özgə kim var?
Bülbül gül üçün qılanda nalə,
Dərdinə dəva olurmu lalə?
11. Xosrov deyiləm ki, mənə dilbər
Şirin ola gah, gah Şəkkər?
Mən yekcəhətəm təriqətimdə,
Təğyir işi yox cibillətimdə.
Üzrünü bəyan edib həm ol dəm,
Təqrirə gətirdi bir ğəzəl həm:

6. Ana bətnində qüdrətin qələmi mənim varlığıma ziynət və surət verərək, başımı həvəslə doldurdu, ayaqlarımı sevdayla bağladı. Bədənimin dərisi və damarlarım başdan ayağa məhəbbətlə doldu. Könlümü bəlaya mülk eylədi, canım cəfaya bağışlandı.

7. Mən bu hökmə qarşı çıxmamışam, bu vəqf sahibinin işidir. Əzəli dərdin dərmanı ola bilərmi? Əbədi məhəbbət puç olarmı? Mən ayrılıq daxmasının şamıyam, ciyərimin yanmasından ləzzət alıram. Mənim bu odumu söndürmək istəyən mənə zülm edər.

8. Şamın həyatı oddadır və halı atəşlə xoş keçir. Onu yanmasından xilas etmək istəyən onun ölümünə bais olar. Düşmənliyin adını dostluq qoyub qurtuluşum üçün tədbir görməyin. Mən sevgilimin eşq dənizində batmışam, nigarımın dərdi ilə qovuşmuşam.

9. Təsəllimin səbəbi də, yaralı ürəyimin aramı da odur. Onunla dərdimə dərman edin, mənə başqa bir kimsədən söz açmayın.

10. Deyirsiz ki, başqa dilrübalar, Leyli kimi çox pərisifətlər var. Allah eşqinə, saqının, deməyin, axı dünyada ondan başqa kim var ki? Bülbül güldən ötrü nalə çəkəndə lalədən onun dərdinə dərman olarmı?

11. Xosrov deyiləm ki, mənim sevgilim gah Şəkər olsun, gah da Şirin? Mən yolumda tək bir cəhəti seçənlərdənəm və bu təbiətimdə dəyişmək qabiliyyəti yoxdur. Elə bu anda üzr istəyib qurtaran kimi bir qəzəl də yaratdı:

## BU ĞƏZƏL MƏCNUNİ-DİLPƏZİRİNDİR

Eşq dərdi, ey müalic, qabili-dərman deyil!
Cövhərindən eyləmək cismi cüda asan deyil!

Dövr cövründən şikayət edənə aşiq demən,
Eşq məsti vaqifi-keyfiyyəti-dövran deyil!

Şəhrdən səhraya bir fərq olduğun hər kim bilir,
Bilmiş ol kim, eşq səhrasında sərgərdan deyil!

Hər kim idrak eylər öz keyfiyyəti-halın, hənuz
Dust rüxsarinə eyni-şövq ilə heyran deyil!

Canı canan ittihadi fariğ eylər cismdən,
Cismdən agah olan can vasili-canan deyil!

Der imiş düşmən ki, həmdəmdir Füzuli yar ilə,
Hər sözü böhtan isə, həqqa, bu söz böhtan deyil!

## BU QƏZƏL MƏCNUN DİLPƏZİRİNDİR

Eşq dərdi, ey həkim, dərmanla sağalan deyil!
Cismi cövhərindən ayırmaq asan deyil!

Dövr zülmündən şikayət edənə eşiq deməyin,
eşqdən məst olan dövranın keyfiyyətini dərk edən deyil!

Şəhərnən səhranın fərqi olduğunu kim bilirsə,
bilin ki, o eşq səhrasında sərgərdan deyil!

Kim ki, öz halının keyfiyyətini anlayırsa,
o heç vaxt sevgilisinin üzünə şövq gözü ilə heyran deyil!

Canana birləşmək canı cismindən ayırar,
canından xəbəri olan can cananına qovuşan deyil!

Düşmən deyirmiş ki, Füzuli yarı ilə həmdəmdir,
hər sözü böhtansa da, vallah, bu sözü böhtan deyil!

## BU, MƏCNUNUN ATAŞI LEYLİYƏ XASTARLIĞIDIR VƏ LEYLİ ATASININ MƏCNUNDAN BİZARLIĞIDIR

1. Saqi, gətir ol şərabi-nabi
Kim, yetdi nisabə ğəm hesabi.
Ğəm düşməni-cani-mübtəladır,
Dəf eyləyə gör ki, bir bəladır!
Söz cövhərinə olan xiridar
Bu növ ilə qıldı gərm bazar
2. Kim, aciz olub ğəm içrə ol pir,
Məcnununa qıldı fikri-zəncir.
Bildi ki, gər olmaz olsa Leyli,
Mümkün deyil olmağı təsəlli.
Qıldı tələbin özünə lazim,
Cəm etdi əaliyü əazim.
Ümmid ilə bağladı umub kam,
Ol kə'beyi-arizuyə ehram.
3. Çün Leyli atası bildi hali,
Uydurdu əkabirü əali.
Qarşılarına olub rəvanə,
Qıldı olar ilə əzmi-xanə.
- "Əhlən və səhlən!" - deyib dəmadəm,
Min gəz dedi: - "Ola xeyr məqdəm!"
4. Çün şəm sifət olar oturdu,
Ol sərv kimi ayağə durdu,
Ortaya buraxdı türfə xanlar,
Ta kami-dil ala mehmanlar.
Olmuşdu dolub kəbab ilə xan,
Cədyü Həməl ilə asiman san.
Əmma əcəb, ər qıla xirədmənd,
Ol xanları asimanə manənd.
Hər kim ğərəzin bulurdu xandan,
Bu mümkün olurmu asimandan?
5. Xanlar götürüldüyündə, ol pir
Təqrib ilə dərdin etdi təqrir:
- "Key qədrlə qibleyi-qəbail!
Səndən qamunun muradı hasil.
Əslü nəsəbim sənə əyandır,
Hökmüm neçə min evə rəvandır.
Məşhuri-qəbailəm səxadə,
Mə'rufi-təvaifəm ətadə.
6. Həm var məhəbbətimdə tə'sir,
Həm var ədavətimdə təşvir.
Sərdəftəri-əhli-ruzigarəm,
Hər necə desəm, yüz onca varəm.

## BU, MƏCNUNUN ATASININ LEYLİYƏ ELÇİLİYİDİR VƏ LEYLİNİN ATASININ MƏCNUNDAN BİZARLIĞIDIR

1. Saqi, o saf şərabı gətir ki, qəmim hesabı son həddə yetibdir! Qəm bəlalı canımın düşmənidir, onu dəf etməyə çalış və gör ki, necə bəladır! Söz cövhərinin alıcısı bazarı belə qızışdırdı: -

2. O qoca qəm içində aciz qalıb Məcnunun zəncirlənməsi fikrinə düşdü və bildi ki, əgər Leyli olmasa, onu sakitləşdirmək mümkün deyil. Onu istəməyi lazım bildi, başına ali və böyük şəxsləri toplayıb, o kam ümidiylə arzusunun Kə'bəsinə üz tutdu.

3. Leylinin atası xəbər tutan kimi uca rütbəliləri və böyükləri topladı, onları qarşılamağa yola düşdülər və birlikdə evə gəldilər. Dəfələrlə "əhlən və səhlən"dən sonra min kərə "gəlişiniz xeyir olsun!" dedi.

4. Hamı şam kimi oturdu, o özü isə sərv kimi ayaq üstə qaldı. Qonaqlarını ürək arzularına çatdırmaq üçün min cür süfrələr açdı; süfrələr kababla, elə dolmuşdu ki, elə bil göylər oğlaq və öküzlə dolmuşdu. Müdriklər o süfrələri göylərə bənzədirdi, çünki süfrədən hamı istədiyini ala bilərdi, göylərdən istədiyini almaq mümkündürmü?

5. Süfrə yığışdırıldıqdan sonra o qoca dərdini tədriclə açdı: - "Ey qüdrəti ilə qəbilələr qibləsi! Hamı sənin vasitənlə öz arzusuna yetir. Əslim, nəslim sənə mə'lumdur. Hökmümə minlərlə ev tabedir. Səxavətdə qəbilələr içində məşhuram, bağışlamaqda da tayfalar içində tanınmışam.

6. Məhəbbətim qüdrətlidir, düşmənçiliyim də qorxuludur. Zəmanənin birincilərindənəm, dediyimdən də yüz qat artığam. Əməlimin xurma ağacı bar verib - tanrı mənə bir gövhər

Nəxli-əməlim səmər veribdir,
Iyzəd mənə bir gühər veribdir.
Hala diləröm bu türfə lö'lu,
Bir lə'l ilə ola həmtərazu.
Ta lö'lö olanda lə'lə vasil
Tərkib qılam müfərrihi-dil.
7. Çox kanlara tişəvəş üz urdum,
Çox lə'l həqiqətini sordum.
Hər kanda əgərçi lə'l çoxdur,
Bir lə'l ki, layiq ola yoxdur.
Bir lə'lin eşitmişəm sənin var
Kim, lö'löümə odur səzavar.
Lütf eylə, inayətü kərəm qıl!
Ol lə'l ilə dürrü möhtərəm qıl!
Qılsın gülü sərv sayəpərvər,
Olsun gülə sərv sayəgüstər.
8. Fəhm et sözümü, təğafül etmə!
Bir xeyr işidir, təəllül etmə!
Gər hasil olur bu kam səndən,
Hər nə ki, dilərsən, istə məndən!
Onca qılayın sənə rəvan gənc
Kim, yer üzün eyləyə nəhan gənc.
Onca gühər eyləyim rəvanə
Kim, bulmayasan ona xəzanə".
9. Ol sərvi-səmənbərin atası,
Ol gənci-nihanın əjdəhası
Lütf ilə dedi ki: "Ey xirədmənd!
Mən kimi əsiri-dami-fərzənd!
Sən xoş gəldin, səfa gətirdin!
Topraqlardan bizi götürdün!
Müşkülcə xitabdır xitabın,
Bilmən necə vereyin cavabın?
10. Qürbün bilirəm mənə şərəfdir,
Əmma xələfin əcəb xələfdir.
"Məcnun - deyə tə'n edər xəlayiq,
Məcnuna mənim qızım nə layiq?
Leyli deməyim ki, nazənindir,
Bir tirə kənizi-kəmtərindir.
Olmazmı kəniz cinsi-mərdüm?
Yoxdurmu kənizə həm tərəhhüm
11. Div ilə pəri olurmu həmdəm?
Olmaz, sözü açma, əbsəm, əbsəm!
Divanəyə zaye eyləmə rənc,
Viranə gərək ona, nədir gənc?
Tədbir ilə döndərib məzacın,
Sevdasının eyləsən əlacın,
Leyli onun olsun, eylədim əhd,
Vav indi, sən et əlacına cəhd!

veribdir. Bu nadir incimi bir lə'l ilə qarşılaşdırmaq istəyirəm ki, onları bir-birinə qovuşdurub ürək sevincinə nail olum.

7. Külüng kimi çox mə'dənlərə üz vurdum, çox lə'llərdən xəbər tutdum. Mə'dənlərdə lə'l çoxdur, amma layiqlisini tapmadım. Eşitmişəm, sənin də mənim incimə yaraşan bir lə'lin var. Lütf eylə, kərəm və yardım göstər! Öz lə'linə mənim incimi əzizləndir! Sərv gülü öz kölgəsində bəsləsin və gül sərvin sayəsində olsun.

8. Sözümü anla, qəflətdə də qalma, bu xeyir işdir, gecikmə. Əgər bu arzum səndən yerinə yetsə, məndən nə diləsən istə, sənə o qədər xəzinə göndərim ki, yerin üzü xəzinə içində itsin. O qədər gövhər yollayım ki, yığmağa yer tapa bilməyəsən.

9. O sərvboylunun atası gizli xəzinənin əjdəhası lütf ilə cavab verdi: - "Ey müdrik və mənim kimi övlad tələsinin əsiri. Xoş gəlib, səfa gətirmisən, bizi yerlərdən götürmüsən. Amma xitabın çox çətindir, heç bilmirəm cavabını necə verim?

10. Sənin qohumluğun bilirəm mənə şərəfdir. Ancaq oğlun qəribə oğuldur. Xalq ona "Məcnun" deyə tə'nə edir. Mənim qızım niyə "məcnuna" layiq olsun? Demirəm ki, Leyli nazənindir, o sənin adicə bir kənizindir. Kəniz də insan cinsindən deyilmi? Ona da rəhm yoxdurmu?

11. Div ilə pəri dost ola bilərmi? Olmaz, söz açma, sus, sus! Divaşə üçün əziyyət çəkmə, ona viranə gərəkdir, xəzinə nədir? Bir tədbir ilə xasiyyətini dəyişib sevdasına əlac eyləyəsən, əhd edirəm. Leyli onun olsun. İndi, get, əlacına çalış!

## BU, MƏCNUN ATASININ HİRMANIDIR VƏ QEYRİ BABDAN TƏDBİRİ-DƏRMANIDIR

1. Ol sahibi-nengü namü namus
Döndü eve geldi xarü me'yus.
Mecnuna dedi ki: - "Ey cefakeş!
Hacet biter, olmağıl müşevveş!
Əql ile açılır ol müemma,
Leyliyi sene vererler, emma
Şerti bu ki, olasan xiredmend,
Ərbabi-xiredden alasan pend!
Ref ola elameti-cünunin,
Əql ola hemişe rehnümunin".
2. Mecnun dedi: - "Ey edibi-kamil!
Divaneyi-eşq olurmu aqil?
Ger mende bir ixtiyar olaydı,
Tedbirime e'tibar olaydı,
Əvvelden edeb şüar ederdim.
Temkinimi üstüvar ederdim.
Olmazdı bu hale ehtiyacım
Kim, ola ezab ile elacım.
3. Mende bu elace yox müdara,
Min gez ğemim etmen aşikara.
Yoxdur revişimde inqilabım,
Əvvelki cevabdır cevabım.
Sen ehli-xiredsen, eyle tedbir,
Tedbirin ede meger ki, te'sir;
Leyliyi dexi men etmeyim yad,
Men aqili-veqt olam, sen azad".
4. Ol piri-şikestehal heyran,
Tedbiri-elac edib firavan,
Her qanda eşitdi bir tebibi,
Gülzarının oldu endelibi;
izhar edib ona ehtiyacın,
Bimarının istedi elacın.
Bimarına min tebibi-haziq
Bir şerbet içirmedi müvafiq.

## BU, MƏCNUNUN ATASININ PEŞİMANLIQDIR VƏ ÇARƏSİZ QALIB BAŞQA QAPIDAN DƏRMAN AXTARMASIDIR

1. O heya sahibi, adlı-sanlı namuslu qoca xar, me'yus evine döndü, Mecnuna dedi ki: - Ey cefakeş! Darıxma, elac tapılar! Bu müemma eql ile açılacaqdır. Leylini sene verecekler, amma şerti budur ki, ağlını başına yığasan, ağıllıların sözüne qulaq asıb onlardan nesihet alasan. Delilik elametleri senden uzaqlaşa, yol gösterenin eql ola".

2. Mecnun dedi: "Ey kamil edib! Eşq divaneşi ağıllanarmı? Ixtiyar mende olsaydı, elacıma inansaydım, evvelceden edebi özüme şüar ederdim, temkinim möhkem olardı. Əlacımın bele ezablı olmasına ehtiyac olmazdı.

3. Men bu müaliceye döze bilmerem. Min defe öz derdimi demeyeceyem. Reftarım deyişecek deyil, cavabım evvelki cavabdır. Sen müdriksen, ele bir tedbir gör ki, te'siri olsun, men Leylini yad elemeyim, zemanenin ağıllısına çevrilim, sen de azad olasan".

4. O üzgün qoca heyrete daldı, elac üçün tedbir axtarmağa başladı. Harda bir hekim eşitdise, onun gülzarının bülbülü olub dile geldi, derdini açdı, xestesine derman istedi. Minlerle mahir hekim xesteye xeyirli bir elac şerbeti içire bilmedi.

5. Hər yerdə ki, bildi bir nəzirgah,
Varıb ona oldu xaki-dərgah.
Çox əl götürüb dualər etdi,
Çox nəzr verib ətalər etdi,
Rə'yilə məlulun etməyə şad
Min pirdən almadı bir irşad.
Çox sehr olunub yazıldı tə'vid,
Çox məkrlərə tutuldu ümmid,
Edilmədi heç birilə çarə,
Nə çarə qəzayi-kirdigarə.
6. Bir gün dedilər ona ki: - "Ey pir!
Aləmdə sənə bu qaldı tədbir
Kim, Kə'bəyə iltəsən əsirin,
Ola ki, həq ola dəstgirin.
Tövfi-hərəm olsa ona hasil,
Sərgeştəlik ondan ola zail.
Ursa həcəri-mübarəkə baş,
Yumşaya, əgər ola qara daş".

5. Harada bir nəzir yeri varlığını eşitdi, gedib oranın qapısının tozu oldu. Çox əl açıb dua elədi, nəzir verdi, bəxşiş payladı. Dərdlisini onun ürəyincə şadlandıracaq və düz yola qoyacaq bir yer tapmadı. Çox sehr yazılıb, dua oxundu, çox hiyləyə ümid bağladı, heç birindən bir çarə olmadı - Allahın qəzasına nə çarə!

6. Bir gün ona dedilər: "Ey pir! Dünyada bircə yolun qaldı ki, xəstəni Kə'bəyə aparasan. Bəlkə haqq sənin əlindən tutsun, müqəddəs torpağı dolanmaq ona qismət olsa, bəlkə başından bəla yox ola. Mübarək qara daşa–həcərə baş vursa, əgər o adi qara daş olsa da, yumşalar".

## BU, MƏCNUNİ-BİÇARƏNİN KƏ'BƏYƏ ÜZ URDUĞUDUR VƏ MÜNACATLA SEVDASI ARTDIĞIDIR

1. Ol pir bu xeyr işə qılıb cəhd,
Məcnuna mürəttəb etdi bir məhd;
Aldı onu əzmi-rah qıldı,
Əzmi-hərəmi-ilah qıldı.
Çün Kə'bəyə irdi ol nikuxu,
2. Məcnuna dedi ki: - "Ey bəlacu!
Tut Kə'bəyə ruy, taət eylə!
Təmkinü ədəb riayət eylə!
Tə'zim şəraitin əda qıl!
Ixlası dürüst edib, dua qıl!
Ola ki, qəbul ola niyazın,
Həq şəfqəti ola çarəsazın.
3. Bu yerdə qəbul olur dualər,
Bu büq'ədə bəxş olur ətalər.
Qıl tövbə ki, əhsəni-əməldir,
Cəhd eylə nəcatə kim, məhəldir".
4. Məcnun bulub ol məqamdən zövq,
Saldı ünü çərxə nəş'əyi-şövq.
Suz ilə çəkib ciyərdən avaz,
Ərz etdi binayi-Kə'bəyə raz:
5. - "Key səqfi büləndü qədri ali!
Mehrabi-əazimü əali!
Ey qibleyi-əhli-izzü iqbal!
Rüxsari-zəminə ənbərin xal!
Ey məğzi-vəfayə kisvətin pust,
Həmrəngi-pəlasi-xaneyi-dust!
Ey gülbüni-ğönçeyi-ibadət,
Sənduqi-cəvahiri-səadət!
Ey daim olan mənimlə həmdərd,
Əmma nə mənim kimi cahangərd!
6. Köysünə uran həcər kimi daş,
Zəmzəm kimi gözdən axıdan yaş!
Peyvəstə siyah qılan libasın,
Könlündə nihan tutan həvasın!
Billah, kiməsən bu yerdə aşiq?
Söylə ki, ənisinəm müvafiq.
Olmuş sənə eşq feyzi hasil,
Qılmış səni qibleyi-qəbail.

## BU, BİÇARƏ MƏCNUNUN KƏ'BƏYƏ ÜZ TUTDUĞUDUR VƏ ORADA SEVDASININ MÜNACATLA ARTMASIDIR

1. O pir bu xeyir işə çalışıb Məcnun üçün bir kəcavə düzəltdi, onu da götürüb yola çıxdı, Allahın müqəddəs guşəsinə yönəldi. O xoş təbiət şəxs Kə'bəyə çatanda Məcnuna dedi ki:

2. "Ey bəlalı" Kə'bəyə üz tut, ibadət elə! Təmkini, ədəbi, tə'zim qaydalarını gözlə. Könlünü təmizləyib dua elə ki, yalvarışın qəbul olunsun, haqqın mərhəməti çarəni eləsin.

3. Bu yerdə dualar qəbul olunur, bu torpaqda bəxşişlər verilir. Tövbə qıl, tövbə əməllərin ən yaxşısıdır. Cəhd elə, nicata çatmaq yeridir.

4. Məcnun bu məqamdan zövq alaraq nəş'ə şövqünün əfqanını uca göylərə saldı. Yanğıyla ürəkdən səsini ucaldıb Kə'bə sarayına sirrini belə açdı:

5. "Ey tavanı uca, böyüklərin və ucaların səcdəgahı! İzzət və iqbal əhlinin qibləsi! Yer üzünün ətirli xalı*. Ey örtüsü səadət cövhərinin qabığı olan, dost sarayının xalısının* həmrəngi. Ey ibadət kolu qönçəsinin gül-budağı, səadət gövhərinin sandığı! Ey daim mənə həmdərd olan, amma mən kimi dünyanı gəzməyən!

6. Sinəsinə həcər kimi daş vuran, zəmzəm kimi gözündən yaş axıdan! Həmişə qara geyinib, sevgisini könlündə gizlədən! Sən Allah, bu yerdə kimə aşiqsən? Söylə, sənə yaraşan dostunam. Sənə eşqin bərəkəti çatmışdır, qəbilələrin qibləsi olubsan.

7. Ya rəb, bu hərəmsəra həqiçün!
Bu mə'bədi-pürsəfa həqiçün!
Qıl məndə binayi-eşqi daim,
Manəndi-əsasi-Kə'bə qaim!
Sal könlümə dərdi-eşqdən ğəm,
Hər ləhzəvü hər zəmanü hər dəm!
Eşq içrə müdam şövqüm artır,
Şövq ilə həmişə zövqüm artır!

7. Ya rəb, bu müqəddəs saray haqqına! Bu səfalı mə'bəd haqqına! Məndə eşq binasını bu Kə'bə kimi həmişəlik və möhkəm elə! Ürəyimə hər an, hər ləhzə, hər zaman eşq dərdini-qəmini sal! Eşqdə daima şövqümü və şövq içində zövqümü artır!

8. Hər qanda ki, aləm içrə ğəm var,
Qıl könlümü ol ğəmə giriftar!
Əndişeyi-əqldən cüda qıl,
Eşq ilə həmişə aşina qıl!
Artır mənə zövqü şövqi-Leyli,
Daim mənə onda qıl təcəlli!

8. Dünyada harada qəm varsa, könlümü ora sal! Ağıl əzabından məni ayır, həmişəlik eşqlə dost elə! Məndə Leylinin şövq və zövqünü artır. Daim mənə onun donunda özünü göstər!

9. Çoxdur bəni-adəm içrə bidad,
Et könlümü vəhşət ilə mö'tad!
Bir mülkdə ver mənə qərarı
Kim, yetməyə adəmi ğübarı!"

9. İnsanlar içərisində zülm çoxdur. Mənim ürəyimi qorxuya öyrət. Elə bir mülkdə mənə yer ver ki, ora insan tozu yetişməsin".

10. Ol zairi-Kə'bəyi-inabət,
İstərdi dua qılıb icabət!
Tüğyani-bəladan etməyib fikr,
Bu şe'r idi hər dəm etdiyi zikr:

10. Kə'bəsinin tövbə ziyarətçisi belə dua eləyərək haqdan qəbul istədi. Bəlanın tüğyanına fikir verməyərək daima bu şe'ri təkrarlayırdı:

## ĞƏZƏL MƏCNUN DİLPƏZİRİNDİR

Ya rəb, bəlayi-eşq ilə qıl aşina məni!
Bir dəm bəlayi-eşqdən etmə cüda məni!

Az eyləmə inayətini əhli-dərddən,
Ye'ni ki, çox bəlalərə qıl mübtəla məni!

Olduqca mən götürmə bəladən iradətim,
Mən istərəm bəlanı, çü istər bəla məni!

Təmkinimi bəlayi-məhəbbətdə qılma süst,
Ta dust tə'n edib deməyə bivəfa məni!

Getdikcə hüsnün eylə ziyadə nigarımın,
Gəldikcə dərdinə betər et mübtəla məni!

Mən qandanü mülaziməti-e'tibarü cah,
Qıl qabili-səadəti-fəqrü fəna məni!

Öylə zəif qıl tənimi firqətində kim,
Vəslinə mümkün ola yetirmək səba məni!

Nəxvət qılıb nəsib Füzuli kimi mənə,
Ya rəb, müqəyyəd eyləmə mütləq mana məni!

## QƏZƏL MƏCNUN DİLPƏZİRİNDİR

Allahım! Məni eşq bəlası ilə dost elə! Bir anlığa da eşq bəlasından ayırma!

Mən dərdliyə köməyini əsirgəmə, ye'ni məni daha artıq bəlalara sal!

Necə ki, mən varam, bəlaya bağlılığımı məndən alma, çünki mən bəlanı istəyirəm, bəla da məni!

Məhəbbət bəlasında təmkinimi zəiflətmə ki, dost tə'nəylə mənə vəfasız deməsin!

Nigarımın gözəlliyini getdikcə artır, məni isə daha betər dərdə sal!

Mən hara, dünyanın şan-şöhrətinə qulluq hara, məni fəqirlik və fəna səadətinə qabil eylə!

Ayrılığından canımı elə zəiflət ki, səhər yeli də məni onun vəslinə yetirə bilsin!

Mənə Füzuli kimi məğrurluq nəsib etmə ya rəbb, qəti məni mənim özümə bağlama!

## BU, KƏ'BƏDƏN MƏCNUNUN MÜRACİƏTİDİR VƏ VÜHUŞ İLƏ MÜSAHİBƏTİDİR

1. Bir-bir eşidib sözün atası,
Bildi ki, qəbul olur duası.
Əfsun olur ol ğəmü məlamət,
Mümkün deyil oğluna səlamət.
Çox qıldı fəğanü naləvü zar,
Oğlundan ümidi kəsdi naçar.
2. Ol pir qalıb orada heyran,
Məcnun tutuban rəhi-biyaban,
Tənha səfər ixtiyar qıldı,
Əzmi-səri-kuyi-yar qıldı.
Gündüz gözü yaşı hadiyi-rah,
Gecə yolu şəm'i şö'leyi-ah.
Gərdi-rəhi-yari yad edərdi.
Gəh otura, gəh dura gedərdi.

## BU, KƏ'BƏDƏN MƏCNUNUN QAYITMAĞIDIR VƏ VƏHŞİLƏRƏ QOŞULMAĞIDIR

1. Atası Məcnunun sözlərini bir-bir eşidib bildi ki, duası qəbul olacaqdır, onun əzabı, məzəmməti daha da artacaq və oğlunun sağalma imkanı yoxdur. Çox ağladı, nalə-fəğan çəkdi və əlacsız qalıb oğlundan ümidini kəsdi.

2. O pir orada heyrətdə qaldı, Məcnunsa səhraların yolunu tutdu və tək-tənha səfərə çıxdı, yar ayağının torpağına tərəf yönəldi. Gündüz yol göstərəni göz yaşı, gecələr yolunun şamı ahının işığı oldu. Gah yar ayağının tozunu yada salardı, gah oturardı, gah durub gedərdi.

**BU, MƏCNUNUN DAĞ İLƏ MÜSAHİBƏTİDİR VƏ CARI OLAN ÇEŞMƏ İLƏ MÜNASİBƏTİDİR**

1. Bir dağə irişdi yolda nagah.
Qəddinə libasi-vəhm kutah.
Tiğində üqabi-çərx qanı,
Müzmər kəmərində lə'l kanı.
Mün'im sifəti, libası faxir,
Cibü bəğəli dolu cəvahir.
2. Dərya qılıban ona təzərrö,
Eylərdi zəxirəsin təvəqqö.
Səhra edibən ona təvəlla,
Eylərdi məişətin təmənna.
Ol çeşmələr eyləyib rəvanə,
Olmuşdu olara atə-anə.
Tə'zim ilə qılmış onu həq yad,
Qur'anda - "əlcibalü ovtad".
3. Məcnun ona eyləyib tamaşa,
Bir odlu sürud qıldı inşa.
Olduqda sürud ilə nəvasaz,
Ondan həm eşitdi əksi-avaz.
Sandı ki, özilə həmnəfəsdir,
Dedi: - "Mənə bir rəfiq bəsdir,
Yüz şükr ki, yari-ğar buldum,
Gəzdim bu cahanı yar buldum".
4. Eşq odun ona həm etdi rövşən:
- "Key guşənişin pakdamən!
Suzi-cigərimdən oldun agah,
Əhsənt-əhsənt, barəkallah!
Bir aşiqi-mübtəla imişsən,
Dərd əhlinə aşina imişsən.
Sənsən mənə həmdəmi-müvafiq,
Dağ ilə olur həmişə aşiq.
Bidad ilə köysünə urub daş,
Dərd ilə gözündən axıdıb yaş,
Noldu sənə, böylə məst olubsan,
Ğəm daminə paybəst olubsan.

**BU, MƏCNUNUN DAĞ İLƏ MÜSAHİBƏTİDİR VƏ CARI OLAN ÇEŞMƏ İLƏ MÜNASİBƏTİDİR**

1. Gözlənilmədən yolda bir dağa rast gəldi ki, xəyalın donu da ona gödək gələrdi, zirvəsində ·çərxin qartalının qanı, örtülü kəmərində yaqut mə'dəni vardı. Xeyirxah sifəti və qiymətli libası var idi, qoynundakı cibi cəvahirlə doluydu.

2. Dəniz ona yalvarıb ondan pay umurdu, səhra ona dostluq göstərib dolanışığını istəyirdi. O isə çeşmələr axıdaraq onlara ata-ana olmuşdu. Həq də onu hörmətlə yad edib Quranda "dirək dağlar" adlandırmışdı.

3. Məcnun ona tamaşa edib bir odlu nəğmə oxudu; nəğmə oxuduqca dağdan əks-səda gəldi. Elə bildi ki, dağ da onun həmnəfəsidir. Dedi ki: "Mənə bir yoldaş bəsdir. Çox şükür ki, özümə bir köməkçi tapdım, dünyanı dolaşdım özümə sınanmış bir dost tapdım.

4. Eşqinin odunu ona aydınlatdı: "Ey pak ətəkli guşənişinim, bərəkəllah, əhsənlər, əhsənlər, ciyərimin odunu bildin! Bir bəlalı aşiqmişsən və dərd əhlinə dost imişsən. Sən mənə uyğun dostsan - aşiqlər həmişə dağla birlikdə olur. Zülm ilə sinənə daş vurub dərdilə gözündən yaş axıdıb, Sənə nə olub ki, belə məst olub, qəm toruna dustaq olmusan.

5. Qan ilə dolubdurur kənarın,
Nə güldən ola bu lalezarın?
Bağrın görürəm olubdurur su,
Nə sərvqədin həvasıdır bu?
Gəl, ağlayalım bu macəraye,
Bir dəm qoşalım səda-sədayə!"

6. Çün bir dəm onunla ağladı zar;
Dərdi-dili-zarın etdi izhar,
Əzm eylədi xaki-kuyi-yarə,
Leylinin evi olan diyarə.

5. Ətrafın qanla doludur, bu laləzarın hansı güldəndir? Görürəm, bağrın yanıqdır, hansı sərv boylunun havasıdır bu? Gəl bir anlığa səs-səsə verib, bu macəraya ağlayaq!"

6. Onunla bir az ağladı, ağlar ürəyinin dərdini dedi və yar torpağına üz çevirib Leylinin evi olan diyara tərəf yol tutdu.

## BU, MƏCNUNUN ĞƏZAL İLƏ MƏQALATIDIR VƏ EŞQ BABINDA ONUNLA OLAN HALATIDIR

1. Gördü ki, bir ovçu dam qurmuş,
Damine ğezaller üz urmuş.
Ol dame cefayi-çerxi-ğeddar
Bir ahunu eylemiş giriftar.
Boynu burulu, ayağı bağlı,
Şehla gözü nemli, canı dağlı.
Əhvalına rehm qıldı Mecnun,
Baxdı ona, tökdü eşki-gülgun.
Könlüne qatı gelib bu bidad,
Yumşaq-yumşaq dedi ki: "Seyyad!
2. Rəhm eyle bu mişkbu ğezale!
Rəhm etmezmi kişi bu hale?
Səyyad, bu natevane qıyma!
Qıl canına rehm, cane qıyma!
Səyyad, saqın, cefa yamandır!
Bilmezsenmi ki, qana qandır?
Səyyad, mene bağışla qanın!
Yandırma cefa oduna canın!"
3. Səyyad dedi: "Budur meaşım!
Açman ayağın gederse başım.
Qətlinde bu seydin etsem ehmal,
Ətfalü eyalıma nolur hal?"
4. Mecnun ona verdi cümle rextin,
Pak eyledi bergden dirextin.
Ol türfe ğezalın açdı bendin,
Şad eyledi cani-derdmendin.
Üz urdu üzüne, qıldı efğan,
Göz sürdü gözüne, oldu giryan:
5. - "Key badiyegerdü badnaverd!
Nazik bedenile nazperverd!
Sen ziyneti-her gili-zeminsen,
Gül kimi letifü nazeninsen.
Ey sebzeyi-cuybari-vehşet!
Re'na semeni-behari-vehşet!
Tenha qoyma meni-zebuni,
Olğıl mene deşt rehnümuni!
Gez bir neçe gün menimle hemrah,
İnsan deyib etme menden ikrah

## BU, MƏCNUNUN CEYRAN İLƏ SÖHBƏTİDİR VƏ EŞQ HAQQINDA ONUNLA OLAN ƏHVALATIDIR

1. Gördü ki, bir ovçu tele qurub, ceyranlar da oraya sarı gelibler. Feleyin qeddar çerxi o teleye bir ceyran balası salıb. Boynu burulu, ayağı bağlı, şehla gözleri nemli, canı dağlı. Mecnun onun halına yandı, baxıb qanlı göz yaşı tökdü. Bu zülm ona ağır geldi. Yumşaqcasına dedi ki:

2. - "Ovçu! Bu müşk etirli ahuya rehm ele - bele hala rehm etmemek olarmı? Ovçu, bu gücsüze qıyma! Rehm ele, canını alma! Seyyad, el saxla, zülm yamandır! Bilmirsenmi ki, qana qandır? Ovçu, onun canını mene bağışla, canını cefa oduna yaxma!"

3. Ovçu dedi: - "Menim dolanacağım bundadır! Başım elden getse de, onun ayağını açmaram. Men bu ovun başını kesmeye telesmesem, bes oğul-uşağımın halı ne olsun?

4. Mecnun bütün libasını ovçuya verib can ağacını yarpaqsız qoydu, o gözel ceyranın ayaqlarını açdı, derdli canını şad eledi. Üzüne üzünü sürtdü, feğan eyledi, gözüne gözünü sürtdü, ağladı:

5. - "Ey çöllerde yox tek gezen çöllerle elleşen, nazlı, nazik beden! Sen bütün torpaqların bezeyisen, gül kimi ince, nazeninsen. Ey sehra çayının zerif otu, bahar gülşeninin re'nası! Men yazığı tek qoyma, mene sehralarda yol gösteren ol! Bir neçe gün mene yol yoldaşı ol, dolan. İnsan deyib menden qaçma.

6. Yaşım kimi getmə çeşmi-tərdən,
Kesmə ayağın bu rəhgüzərdən!
Sərçeşmeyi-çeşmim eylə mənzil,
Sərmənzilimizdən olma ğafil!
Olsun bəbəgim qərargahın,
Əşkü müjə ab ilə giyahın,
Ey çeşmi-nigar yadigarı!
Səhl eylə mənə ğəmi-nigarı!
Qıldıqda xəyali-çeşmi-Leyli,
Sən ver məni-xəstəyə təsəlli!"

6. Yaş kimi gözümdən axma, ayağını bu yerlərdən kəsmə. Gözümün çeşməsini özünə yurd elə, qafil olma, bəbəyim duracağın, kipriklərim otun, göz yaşım suyun olsun. Ey gözləri sevgilimin yadigarı! Nigarımdan çəkdiyim dərdi yüngülləşdir! Leylinin gözləri yadıma düşəndə sən mən xəstəyə təsəlli ver!

7. Çün ol, bəşəriyyətin unutdu,
Ahu həm onunla üns tutdu.
Onun səbəbilə həm çox ahu
Səhradə onunla tutdular xu.

7. O, bəşər olduğunu unutduğu üçün ceyran da ona üns bağladı. Bu səbəbdən də çox ceyranlar bu səhrada ona alışdılar.

## BU MƏCNUNUN KƏBUTƏRƏ ŞƏRHİ-HALIDIR VƏ ONDAN İLTİMASİ-TODARÜKİ-MAFİLBALIDIR

1. Bir mənzilə yetdi zarü müztər,
Bir damdə gördü bir kəbutər.
Hər rövzəni-dami bir dərdi-ğəm,
Min ğəm mütəvecceh ona hər dəm.
Məcnun ona baxdı, yandı canı,
Yaşı kimi coşə gəldi qanı.
Səyyadına eylədi təzərrö,
Qurtarmağın eylədi təvəqqö.
2. Səyyad dedi ki: "Mən fəqirəm,
Fəqrə bu həmamə tək əsirəm.
Haşa ki, bu mürği-tizrəftar
Azad ola, mən qalam giriftar.
Gər var isə qiymətin əda qıl,
Ondan bunu damdən rəha qıl!
Əvvəl məni eylə ğüssədən şad,
Ondan bunu dami-ğəmdən azad".
3. Variydi qolunda bir düri-tər,
Şəffaf çü dideyi-kəbutər,
Verdi onu, aldı ol əsiri,
Üftadənin oldu dəstgiri.
Sürtdü qədəminə çeşmi-pürxun,
Onca ki, ayağın etdi gülgun.
Hər dəm ona ərzi-raz edərdi,
Min nəğmeyi-şövq saz edərdi;
4. - "Key tiz pərü büland pərvaz!
Ərbabi-vəfayə məhrəmi-raz!
Bu rəngi-libasi-nilfamın,
Ənduhü məlaməti-müdamın
İzhar qılır nişaneyi-ğəm,
Kim qıldı səni əsiri-matəm?
Gər aşiq isən sən, ey cahangərd,
Qaçma ki, mənəm səninlə həmdərd.
5. Bir ləhzə mənimlə həmnişin ol,
Gəncineyi-razimə əmin ol!
Başım tükün aşiyanə qılğıl.
Göz yaşımı abü danə qılğıl!
Sən qasid imişsən, ey həmamə,
Məndən həm elət nigarə namə!
Gör hicri-rüxündə iztirabım,
Peyğamım ilət, gətir cavabım.

## BU, MƏCNUNUN GÖYƏRÇİNƏ ÖZ HALINI DANIŞMASIDIR VƏ ONDAN ÜRƏK ARZULARININ YERİNƏ YETİRMƏSİNİ XAHİŞ ETMƏSİDİR

1. Məcnun ağlar və çarəsiz halda bir mənzilə yetişdi və tələdə bir göyərçin gördü. Torun pəncərəsinin hər gözü bir dərd qapısı idi və hər an min dərd ora üz tuturdu. Məcnun ona baxıb canı yandı, gözünün yaşı kimi qanı da coşdu. Ovçuya yalvardı-yapışdı ki, onu buraxsın.

2. Ovçu dedi: "Mən kasıbam, özüm də bir göyərçin kimi kasıblığın əsiriyəm. Allah eləməsin, uçan quşu azad eləsəm, mən çətinə düşərəm. Əgər varındır dəyərini ver və onu tordan azad elə! Əvvəl məni qüssədən qurtar, sonra isə quşu qəm torundan xilas elə, şadlandır".

3. Məcnununun qolunda bir təzə, göyərçin gözü kimi şəffaf inci var idi. İncini verib o əsiri aldı - yıxılana əl tutdu. Qanlı gözlərini ayağına sürtdü və al rəngə boyadı. Hər dəm ona ürək sirrini açdı - şövqlə min nəğmə oxudu:

4. - "Ey iti qanadlı, ucalıqlarda uçan! Vəfa əhlinin məhrəm sirdaşı! Bu göy rəngli libasın daimi dərdin, nalən, qəmindən xəbər verir. Kim səni matəmin əsiri elədi? Əgər aşiqsənsə, ey dünyanı uçub dolanan, məndən qaçma, mən sənin həmdərdinəm.

5. Bir anlığa mənimlə dur-otur, sirrimin xəzinəsinə əmin ol! Başımın tükündə yuva qur, gözümün yaşı sənin suyun və dənin olsun! Sən qasidimişsən, ey göyərçin. Məndən yarıma bir məktub apar! Onun üzündən ayrı çəkdiyim əzabı gör, xəbərimi çatdır, cavabını gətir.

6. Billah, səri-kuyinə gedəndə,
Hər çizginibən təvaf edəndə,
Yad eylə məni səvabıma gir,
Bir tövf səvabını mənə ver.
Qon xaki-dərinə, istə danə,
Qıl özünə danəni bəhanə,
Olduqca məcalın etmə namus,
Məndən yetir ol yerə zəminbus!"

6. Allah eşqinə, onun ayağının dəydiyi yerə gedəndə, ətrafında dolananda, məni də yada sal, səvab elə və məni də səvaba yetir. Onun qapısının önündə yerə qon, dən istə və bunu özünə bəhanə elə. Imkanın olsa, utanma, mənim əvəzimdən yeri öp".

7. Onca dedi ona həm ğəmi-dil
Kim, qıldı onu həm ünsə mail.
Başında olub şəb aşiyanı,
Gündüz olur oldu pasibanı.
Zatında görüb nişaneyi-xeyr,
Həm vəhş müt'i oldu, həm teyr.
Ram oldu bahaim ol fikarə,
Bir fövc yığıldı varə-varə.

7. Quşa ürək dərdini dedi və onu özünə munis elədi. O, gecələr Məcnunun başında yuva salırdı, gündüz ona keşik çəkirdi. Məcnunun təbiətində xeyirxahlıq görüb vəhşilər də, quşlar da ona tabe oldular. Heyvanlar əzabkeşə ram olub, get-gedə bir bölük oldular.

8. Ol zar idi mülki-dərd şahi,
Xeyli-dədü dam onun sipahi.
Olmuşdu bəşərdən öylə bizar
Kim, öz əksin sanırdı əğyar.
Dartıb göyə dudi-şö'leyi-ah,
Öz sayəsin istəməzdi həmrah.

8. Ağlar Məcnun dərd mülkünün şahı, vəhşilər isə onun əsgəri idi. İnsanlardan elə cana gəlmişdi ki, öz şəklini belə yad sayırdı. Ahının tüstüsü göyə ucalırdı, öz kölgəsinə belə yaxın olmaq istəmirdi.

## BU, LEYLİ ƏHVALATINDAN BİR XƏBƏRDİR VƏ MƏ'ŞUQÜ AŞİQ ƏTVARINDAN BİR ƏSƏRDİR

1. Saqi, müteəllimi-xumarəm!
Müştaqi-şərabi-xoşgüvarəm!
Üftadəliyim gör, etmə ehmal!
Rəhm et, bir əyağ ilə əlim al!
İzhar qılıb səfayi-məşrəb,
Bu bəzmi çü eylədin mürəttəb,
Bəzm əhlinə növbət ilə ver cam,
Həm xas riayət eylə, həm am!
Məcnuna həmin şərab tutma,
Leyliyi ki, əsldir, unutma!
2. Dəhqani-fəsihi-farsizad,
Bu gülşənə böylə dikdi şümşad
Kim, ol çəməni-vəfa bəhari,
Daği-ğəmi-eşq laləzari,
Yə'ni rəvişi-vəfadə möhkəm,
Leyli, sədəfi-cövahiri-ğəm
Girmişdi həsarə genc manənd,
Urmuşdu ayağə pənddən bənd.
Nə bir fərəhi, nə bir nişati,
Nə kimsə ilə bir ixtilati.
3. Bizar atadənü anadən,
Biganə cəmii-aşinadən.
Yanına olurdu xublər cəm,
Pərvanəsifət həvaliyi-şəm,
Şad olmağa xatiri-həzini,
Əylənməyə təb'i-nazənini,
Min türfəcə-türfəcə fəsanə,
Şirin söz ilə çəkib bəyanə,
Eylərlər idi zaman-zaman yad,
Təqrib ilə, ləhzə-ləhzə bünyad.
4. Ol tərk qılıb nişatü rahət,
Bir üzvünü eyləyib cərahət,
Eylərdi bəhanə ilə nalə,
Düşməzdi olar düşən xəyalə.
5. Qızlar qaşa vərsə vəsmədən rəng,
Can güzgüsünə salardı ol jəng.
Qızlar üzə qoysa nildən xal,
Ol nilə çəkərdi rəxt filhal.
Qızlarda xəyali-nəqşi-diba,
Ol nəqşi-xəyal ilə şəkiba.

## BU, LEYLİ ƏHVALATINDAN BİR XƏBƏRDİR VƏ MƏ'ŞUQÜ AŞİQ MÜNASİBƏTİNDƏN BİR ƏSƏRDİR

1. Saqi, xumarlıq əzabkeşiyəm! Dadlı şərab arzusundayam! Yıxıldığımı gör, asta olma, rəhmin gəlsin, bir qədəhlə əlimdən tut! Öz təbiətinin saflığını göstərib, indi ki, bu məclisi qurmusan, məclis əhlinə cam gətir. Həm seçilmişləri və həm də adiləri gör! Məcnuna həmin şərabdan vermə. Leyli ki, əsldir, onu unutma!

2. Gözəl nitqli farsizad bağban gülşəndə şümşadı belə əkdi ki, bu vəfa çəməninin baharı, eşq dərdi dağının laləzarı, yə'ni sədaqətdə möhkəm, qəm cövhəri Leyli - qəm sədəfinin cəvahiri xəzinə kimi hasara girmişdi, ayağına nəsihət buxovu vurmuşdu. Nə bir fərəhi, nə bir şadlığı, nə bir kimsə ilə qarışıb qaynamağı var idi.

3. Ata-anadan bizar idi, dosta-aşnaya biganə idi. Şam ətrafında pərvanələr yığılan kimi gözəllər onun dövrəsində toplaşmışdılar. Onun kədərli xatirini, dərdli ürəyini şadlandırmaq, nazənin təbiətini əyləndirmək üçün şirin dillə minlərcə türfə əfsanələr söyləyirdilər.

4. Leyli rahatlığı, şadlığı tərk edib, bir üzvünü yaralayıb, bu bəhanəylə nalə salardı, qızlar düşən xəyala düşməzdi.

5. Qızlar qaşlarına vəsmə çəkəndə Leyli can güzgüsünə pas salardı. Qızlar üzlərinə mavi xal düzəndə o dərhal üzünü örtərdi. Qızlar naxışlı ipək xəyalında idilər. O isə öz xəyalının nəqşilə ovunurdu.

6. Qızların əli hənadə gülgün,
Onun əli əşki ilə pürxun.
Nə iynədə, nə ipəkdə meyli,
Müjganə tökərdi əşk seyli.
7. Qızlar qılıb arizuyi-ziyvər,
Gər riştəyə çəksələrdi gövhər,
Ol dəxi çəkərdi eyləyib rəşk,
Tari-bədəninə gövhəri əşk.
Məcnundan idi cünuni əfzun,
"Leyli" deyənə deyərdi "Məcnun!".
8. Dünlər ki, gedib yanından ol cəm,
Bir guşədə ol qalırdı vü şəm,
Şəm'ə ğəmi-dil bəyan edərdi,
Suzi-cigərin əyan edərdi.

6. Qızların əlləri hənadan gül kimi qızararkən onun əlləri qanlı göz yaşlarına boyanırdı. Nə iynədə, nə ipəkdəydi Leylinin meyli. Kipriklərinə göz yaşı seli axıdardı.

7. Qızlar ziynət arzusu ilə sapa gövhər düzəndə o da qibtə edər, can siminə göz yaşlarının gövhərini düzərdi. Axı, o, Məcnundan daha artıq məcnun idi. Leyli deyənə "Məcnun!" deyərdi.

8. Axşamlar, yanındakılar dağılışandan sonra şam ilə bir küncə qısılıb ürək dərdini şama deyərdi. Ciyərinin odunu göstərərdi.

## BU, LEYLİNİN ÇİRAĞLA MACƏRASIDIR VƏ ONDAN ÇAREYİ-DƏRDİ-DİL TƏMƏNNASIDIR

1. - "Key didəsi bağlı, bağrı dağlı!
Başı qaralı, ayağı bağlı!
Gəl, olalı həmnəfəs mənü sən,
Razi-dili-zarin eylə rövşən!
Nə dərd səni nizar edibdir,
Alüftəvü zərdü zar edibdir?
Başdan ayağa nədir bu yanmaq?
Dudi-dilə dəmbədəm boyanmaq?
Nə cinsdir, əslin, ey bəlakəş
Kim, abi-həyatın oldu atəş?

2. Şərhi-dili-gərmü çeşmi-tər ver!
Sərrişteyi-razdən xəbər ver!
Hər ləhzə düşərsən iztirabə,
Həm atəşə ğərqsən, həm abə!
Nə sehr qılırsan, ey səhərxiz
Kim, atəşin abdən olur tiz?
Mən suxtədən həm olma ğafil,
Məndə dəxi var bir ğəmi-dil.
Mən həm sənə bənzərəm vəfadə,
Bəlkə neçə mərtəbə ziyadə.

3. Sən gecə həmin yanarsan, ey zar!
Mən gecəvü gündüzəm giriftar,
Səndə əsəri-həva ziyandır,
Nisbət mənə rahəti-rəvandır.
Xoşdur sənə sirrini, tökub yaş,
Məclislər içində eyləmək faş.
Könlün çü deyil vəfadə ğaim,
Könlündəkidir dilində daim,
Mən sabiti-ərseyi-bəlayəm,
Ney kimi xəzaneyi-həvayəm.

4. Olmam olur-olmaz ilə dəmsaz,
Başım kəsilirsə söyləmən raz.
Derdim sənə söyləyəm ğəmi-dil,
Səndə dəxi tab yox, nə hasil.
Doymaz ciyərim bu şərhi-razə,
Ahım gətirər səni güdazə

## BU, LEYLİNİN ÇIRAQLA MACƏRASIDIR VƏ ONDAN ÜRƏYİNİN DƏRDİNƏ ƏLAC TƏMƏNNASIDIR

1. Ey gözləri bağlı, bağrı dağlı! Başı qaralı, ayağı bağlı! Gəl mənlə sən həmnəfəs olaq, ağlar ürəyinin sirrini aç! Hansı dərd səni əldən salıb, pərişan, solğun və ağlar edibdir? Bu başdan-ayağa yanmağın, ürək tüstüsünə daima boyanmağın nədir? Əslin nədəndir, ay bəlakeş, niyə dirilik suyun od olub?

2. Ürəyinin yanığınını, gözünün yaşını izah elə! Sirrinin səbəbindən xəbər ver! Həmişə əzab içindəsən, həm odda qərqsən, həm suda! Ey sübhdən oyanan, nə sehrlə sənin atəşin sudan daha da qızışır! Mən oda yanmışı unutma. Axı, mənim də ürək dərdim var! Mən vəfada sənə bənzərəm, səndən də bəlkə ucayam.

3. Ey ağlar, sən təkcə gecələr yanırsan, mənsə gecəli-gündüzlü yanıram! Hava tə'siri sənə ziyandır, mənim isə ürəyimi rahatlandırır. Gözünün yaşını töküb məclislərdə dərdini açmaq sənə xoşdur, çünki könlünün vəfada dözümü yoxdur. Ürəyindəki həmişə dilindədir. Mən bəla meydanında dözümlüyəm. Ney kimi hava xəzinəsiyəm.

4. Hər yetənə dəmsaz olmuram, başım da kəsilsə, sirrimi söyləmirəm. Deyirdim ürəyimin dərdini sənə açım, nə fayda, sənin də tabın yoxdur. Mənim ciyərim bu sirrimi açmaqdan doymaz, ahım səni də güdaza verər.

5. Bir yarə bu dərdi eylədim faş,
Olmadı mənə bu yolda yoldaş.
Səbr eyləmədi bu dərdü dağə,
Qatlanmadı, düşdü daşə-dağə.
Yanında sənin həm urmayam dəm,
Ta qaçmayasan irağə sən həm.

6. Şəm'in çü görərdi yox zəbanı,
Dəm urmağa yox yanında canı,
Pərvanəyə şərh edərdi razın,
Ərz eylər idi olan niyazın.

5. Bu dərdimi təkcə yarıma açdım, o da mənə bu yolda yoldaş olmadı. Bu dağın dərdinə və əzaba səbr eləmədi, qatlanmadı, dağa-daşa düşdü. Sənin yanında danışmayacağam ki, sən də məndən irağa qaçmayasan.

6. Görərdi ki, şamın nə dili, nə də danışmağa canı var, pərvanəyə sirrini açardı, arzusunu ona deyərdi.

## BU, LEYLİNİN PƏRVANƏYƏ KƏŞFİ-RAZIDIR VƏ ONUNLA FİLCÜMLƏ İZHARİ-NİYAZIDIR

1. - "Key tairi-aşiyaneyi-eşq!
Sərgeşteyi-abü daneyi-eşq!
Sənsən rəhi-eşq içində sadiq,
Aşiqsən, əmma tamam aşiq.
Bir görməyə yarı can verərsən,
Bir zövqə iki cahan verərsən.
2. Xoşdur tələbi-vəfadə halın,
Guya ki, fənadədir vüsalın.
Hər necə ki, şöhreyi-cahansan,
Eşq içrə səramədi-zamansan.
Müşkül ki, mənim kimi olub zar,
Məncə ola səndə şövqi-didar.
3. Sən seyrdəsən həmişə sərməst,
Mən dami-bəladə dərdə pabəst.
Dünlər sənə dust həmnişindir,
Hicran mənə müttəsil qərindir.
Bir şö'ləyə sən nisar edib can,
Dişvar ğəmin qılırsan asan.
Mən can ilə istərəm çəkəm ğəm,
Min can dilərəm ğəm içrə hər dəm,
4. Məncə sənə yox ğəmi-nihani;
Gər var desən, qanı nişani?
Qanı nəmi-çeşmi-əşkrizin,
Qanı dəmi-sərdü gərmxizin?
Qanı sitəmü bəlayə durmaq?
Eşqə duruşub cəfayə durmaq!"
Pərvanədə həm görərdi nöqsan,
Bulmazdı onunla dərdə dərman.
Naçar qılıb təhəmmülü səbr,
Ol kəsrə dilərdi ğeybdən cəbr.
5. Yarı gecələr ki, çeşmeyi-xab,
Gözlər çəmənin qılırdı sirab.
Zülmatə düşərdi nuri-biniş,
Aram bulurdu afəriniş,
Yuxuya gedərdi yarü əğyar,
Dərd əhli həmin qalırdı bidar,
Səhraya çıxardı evdən ol mah,
Kamınca qılardı naləvü ah.
Fəryadın edib büləndpayə,
Razi-dilini açardı ayə.

## BU, LEYLİNİN PƏRVANƏYƏ SİRRİNİ AÇMAĞI VƏ ONA QISACA İSTƏKLƏRİNİ BİLDİRMƏYİDİR

1. Ey eşq yuvasının quşu! Ey eşqin dəni və suyu üçün didərgin! Sən eşq yolunda sadiqsən, aşiqsən, özü də tamam aşiq. Yarını bircə dəfə görmək üçün canından, bircə zövq yolunda iki dünyadan keçənsən!

2. Vəfada xoşdur halın, xoşdur,guya ki, vüsalın yox olmağındadır. Eşq yolunda başdan keçməyə daim hazırlığın dünya şöhrətindir. Çətin odur ki, mənim kimi ağlar olub, mən kimi yarını görmək üçün yanasan.

3. Sən həmişə sərxoş dolanmaqdasan, mənim bəla tələsində ayağım dərdlə bağlıdır. Axşamlar sənin dostun, həmdərdindir, mənimsə həmişəlik munisim ayrılıqdır. Canını bir şö'ləyə şabaş verib çətin dərdini asan edirsən. Mən can ilə qəm çəkmək istəyirəm, qəm içində hər dəmdə min can diləyirəm.

4. Məncə sənin gizli dərdin yoxdur - vardırsa, nişanını göstər? Hanı eşqinin göz yaşı? Odla oynayan bəlalı başın hanı? Eşq yolunda bəla, zülm dərdinə dözməyin hanı?" Pərvanənin də qüsurunu görüb, onunla dərdinə dərman tapmaz idi. Əlacsız qalıb səbr edərdi, qeybdən o qədər cəfa dilərdi.

5. Gecə yarısı yuxu gözlərin çəmənliyini suvaranda, görmək nuru zülmətə düşəndə, dost, düşmən yuxuya gedərdi, təkcə dərd əhli oyaq qalardı, o ayüzlü evdən səhraya çıxardı, ürəyincə ah-nalə edərdi, fəryadını ucaldıb, ürək sirrini aya açardı.

## BU, LEYLİNİN AY İLƏ MÜNAZİRƏ QILIĞIDIR VƏ XURŞİD KİMİ ŞÖVQ ODUNA YAXILDIĞIDIR

1. - "Key, gah qədim kimi xəmidə!
Gahi pür olan misali-didə!
Gəh zahir olan mənə ğəmim tək!
Gah ğaib ənisü həmdəmim tək!
Şahiddir ona bu inqilabın
Kim, aşiqisən bir afitabın!
Hicranı ilə nizar olubsan,
Sərgəşteyi-ruzigar olubsan!
Ey möhnəti-eşqdən xəbərdar,
Gör tanrı üçün nə möhnətim var!
2. Qıl şö'beyi-ahimə nəzarə;
Gər var isə rəhmin, eylə çarə!
Seyr eylə fəzayi-hər diyarı!
Gəz cümleyi-dəştü kuhsarı!
Gör qandadır ol mənim pənahım!
Şahım, mahım, ümidgahım!
Hali-dilim ona ərz eylə!
Billah, necə gördün isə söylə!"
3. Ta vəqti-səhər bu idi hali,
Təşvişdən olmaz idi xali.
Mürği-səhəri çəkəndə avaz,
Eylərdi bir özgə növhə ağaz.
- "Key vay, tükəndi mayeyi-ömr!
Xurşidə irişdi sayeyi-ömr!
Dəmdir dəri-firsət ola məsdud,
Müşkül görünə bəyani-məqsud.
Dəmdir oyana yuxudan əğyar,
Şərhi-ğəmi-dərdim ola dişvar.
4. Mən əxtəri-bürci-iştiyaqəm,
Mən şəm'i-səraçeyi-fəraqəm.
Gündüz həbsim, gecə nəcatim,
Gündüz movtim, gecə həyatim.
Olmuş dünümə günüm mütabiq,
Gün görməz imiş bəlalı aşiq".

## BU, LEYLİNİN AY İLƏ DEYİŞMƏSİDİR VƏ GÜNƏŞ KİMİ ŞÖVQ ODUNA YANDIĞIDIR

1. "Ey bə'zən qəddim kimi əyri, gah da gözüm kimi dolu! Gah qəmim kimi mənə aydın, gah munis həmdəmim kimi gizli! Bu dəyişmələrin günəşə vurulduğunun şahididir! Onun hicranı ilə nazilibsən, ruzigarın avarası olubsan! Ey eşq dərdindən xəbərdar, Allah xatirinə gör bir nə dərdim var!

2. Ahımın oduna bax! Rəhmin varsa, çarə qıl! Göyləri-yerləri seyr elə, bütün dağları-dərələri, səhraları gəz! Gör mənim ayüzlüm, şahım, pənahım, ümidgahım hardadır! Ürəyimin halını ona çatdır! Allah eşqinə, necə görürsənsə, eləcə də söylə".

3. Səhər açılanacan halı bu idi! Təşvişdən bir an ayrılmazdı. Elə ki, sübh quşları oxumağa başladı, başqa bir növhə oxuyardı: "Ey vay, ömrümün mayası tükəndi! Ömrümün kölgəsi günəşə yetişib yox oldu. Fürsət qapısının bağlandığı vaxtdır, daha dərd-qəmimi də deyə bilməyəcəyəm. Düşmənlərim yuxudan oyanan vaxtdır. Dərd-qəmimi söyləmək çətin olacaq.

4. Mən şövq bürcünün ulduzuyam, mən ayrılıq sarayının şamıyam. Gündüz məhbus, gecələr azadam. Gündüzlər ölümüm, gecə həyatımdır. Gecəm gündüzümə uyğun olub, bəlalı aşiq heç gün görməz imiş!

## BU, LEYLİNİN SƏBAYƏ PƏYAMİ-ƏHVALIDIR VƏ ÜMİD İLƏ DƏF'İ-MƏLALIDIR

1. Eylərdi səbayə dərdin izhar:
- "Key badi-səba, dur indi, zinhar!
El ğafil ikən bu macəradən,
Sultanə sənə yetir gədadən.
Gör munisü ğəmgüsarı kimdir,
Bizdən ki, usandı, yarı kimdir,
Könlü kimin ilədir təsəlli,
Yadına gəlirmi hiç Leyli?
2. Ərz eylə ki: "Ey gözəl şəhinşah!
Haqdır sənə bəndədən bu ikrah...
Əvvəl ki, bu dilfigarı gördün,
Bir tazəvü tər bəharı gördün,
Hala ki, əsiri-dami-dərdəm,
Manəndi-xəzan, zəifü zərdəm.
Meyl eyləmisən məni-nizarə.
Döndisə iradətin, nə çarə?
3. Mən bərgi-xəzanəm, olmuşam xar,
Sən tazə bəharəsən tələbkar.
Hər necə ki, xarü xakisarəm,
Həm şəfqətinə ümidvarəm.
Tərk etmə əvatifi-əmimi,
Yad eylə məvəddəti-qədimi!"
4. Şəb ta səhər ol büti-səmənbər,
Bidar qalıb misali-əxtər,
Eylərdi bu suziş ilə şiyvən,
Ol dəm ki, olurdu ruz rövşən,
Nəğmə kimi pərdədar olurdu,
Bir pərdə içində zar olurdu.
Daim keçirərdi ol cigərsuz
Övqati bu rəsm ilə şəbü ruz.
Peyvəstə çəkərdi ol güləndam
Əndişəyi-sübhü möhnəti-şam.

## BU, LEYLİNİN SƏHƏR YELİNƏ ƏHVALINI SÖYLƏMƏSİ VƏ ÜMİD İLƏ DƏRDİNİ DAĞITMASIDIR

1. Dərdini səbaya açardı: - "Ey səba yeli, dayan, indi amandır! El bu macəradan xəbərsiz ikən, gədadan sultana dua yetir. Gör munisi, qəmküsarı kimdir, bizdən usandısa yarı kimdir, kiminlə könlü təsəlli tapır, heç Leylini yada salırmı?

2. Söylə ki: "Ey gözəl şahənşah! Sən bu bəndəndən üz çevirməkdə haqlısan. Əvvəlcə bu qəlbi yaralını gördün, elə bil təzə baharı gördün. İndisə dərd dustağıyam, xəzan təki sarı və zəifəm. Mən zəifə meyl eləmisən, indi fikrin dönübsə, nə çarə?

3. Mən xəzan yarpağıyam, xar olmuşam, sən isə təzə bahar istəyirsən. İndiki, xaram və torpaqlara düşmüşəm, ümidim sənin mərhəmətindir. Mərhəmət elə, qədim sevgini yada sal, əvvəlki meylini tərk eləmə!

4. O yasəmən boylu sənəm gecə səhərə qədər ulduzlar kimi oyaq qalıb, ürək yanğısıyla nalə qılardı. Elə ki, gün işıqlandı, nəğmə kimi pərdəyə çəkilirdi, pərdə arxasında ağlayırdı. Gecə-gündüz o ciyəri yananın halı belə keçərdi. Həmişə o güləndam gündüzlərin əzabını, gecələrin qəmini çəkərdi.

## BU, LEYLİNİN BAHAR ƏYYAMİ SEYRİ-GÜLZAR ETDİYİDİR və GÜLZARDA MURADINA YETDİYİDİR

1. Bir gün ki, bahari-aləmaray
Zövq əhlinə oldu rahətəfzay;
Ayineyi-dövrdən gedib jəng,
Dövr etdi zəmini asimanrəng;
Feyzi-şəbi-kimiya əsərdən,
Tə'siri-şəmameyi-səhərdən,
Açıldı xəmi-bənəfşədən tab,
Şəbnəm gülə saçdı lö'löi-nab;
Gülzarə həva əbir tökdü,
Səhrayə ğübari-mişk çökdü;
2. Yağdırdı səhab jalə daşın,
Ol daş ilə yardı ğönçə başın;
Zəxminə urub şükufə mərhəm,
Pambıq yenilər ona dəmadəm;
Səbzə gülə verdi mişk bacın,
Gül səbzəyə mülkünün xəracın;
Xoş rəng ilə yığdılar təcəmmül,
Firuzəvü lə'lü səbzəvü gül.
Dərk eylədi ğönçə rəmzü iyma,
Gül adına açdı min müəmma.
3. Məzmuni-rübaiyi-ənasir,
Feyz olduğu xəlqə oldu zahir.
Susən vərəqi uçub həvayə,
Hər səbzəyə kim, salardı sayə,
Ol səbzəyə uğrayıb axan cu,
Fuladə əgər verəydi bir su;
Fulad dəmində can bulurdu,
Şəmşirsifət zəban bulurdu.
Arayişi-səbzdən zəmanə
Bənzətdi zəmini asimanə.
4. Xurşid, çirağï-çeşmi-aləm
Göydən yerə düşdüyündə hər dəm,
Təhqiq ediben çıxıb gümandan,
Bilməzdi zəmini asimandan.
Gülzarlar oldu işrətabad,
Hər yerdə olundu bəzm bünyad.
Hər guşədə hər kim aldı bir kam,
Hər büq'ədə hər kim içdi bir cam;

## BU, LEYLİNİN BAHAR ÇAĞİ GÜLZARDA SEYRƏ ÇIXDIĞIDIR və GÜLZARDA MURADINA YETDİYİDİR

1. Aləmi bəzəyən bir bahar günü zövq əhlinin rahatlığını artıraraq zamanın aynasından pası sildi, yerlər göylərin rəngini aldı. Axşam şehinin kimyasının, səhər mehinin tə'sirindən boynu bükük bənövşə dirçəldi. Şeh gülləri inci suyuna çəkdi. Havadan gülzara ətir çiləndi, çöllərə müşk tozu yayıldı.

2. Buludlar jalə daşları yağdırdı, o daşlardan qönçələrin başı yarıldı, bu yaralara çiçəklər pambıq kürəciklərilə daim məlhəm qoyurdu. Göyərti gülə müşk bacı, güllər çəmənə mülk xəracı verdi. Otlar, güllər xoş rənglərə bəzəndilər-firuzə və lə'l rənginə boyandılar. Qönçə rəmz və işarələr anlayıb gülün eşqinə min müəmma açdı.

3. Dörd ünsürün feyzi xalqa açıldı. Süsənlərin ləçəyi havaya uçub yaşıllığa kölgə saldı, çəmənə su axırdı, həmin su polada veriləydi, polad da canlanardı, qılınc kimi dil açardı. Zəmanə çəməni elə bəzədi ki, yerlər göylərə bənzədi.

4. Dünyanın gözünün işığı günəş nurunu səpələyərkən, hər bir şübhədən çıxıb, yeri-göydən seçmirdi. Gülzarlar eyş-işrət diyarı oldu. Hər guşədə bir kam alınır, hər əldə bir cam gəzirdi.

5. Leylinin anası gördü mütləq,
Yox Leyliyi-natəvanda rövnəq,
Meyli-gülü sərvü səbzə qılmaz,
Min qönçə açıldı, ol açılmaz.
Sərf etdi şükufə tək dirəmlər,
Cəm eylədi nazənin sənəmlər,
Səhrayə çıxardı ol nigarı,
Qıldı gülə ərz növbaharı,
Ta ğüssəvü ğəmdən ola azad,
Bir dəm gülə, oynaya, ola şad.

5. Leylinin anası gördü ki, Leyli natavanda heç bir rövnəq yoxdur, şadlıq duymur. O gül sərvə, çəmənə, heç bir meyl göstərmir, min qönçə açılıb o açılmır. Çiçək kimi dirhəm səpdi, nazənin sənəmlər topladı. Gülüb, oynayıb şad olmaq, qüssədən azad olmaq üçün o nigarı çəmənə çıxardı, gülü gülzara tapşırdı.

6. Ol bir neçə bikri-pakdaman,
Həmrah olub, oldular xüraman.
Üzdən götürüb ədəb niqabın,
Rəf eylədilər həya hicabın.
Hər kim nə bilirsə lə'b, ya ləhv,
İzharə gətirdi etməyib səhv.
Gah eyləyibən sürudlər saz,
Bülbüllərə oldular həmavaz.
Gah göstərib oynamaqda halət,
Şümşadə yetirdilər xəcalət.

6. O mə'sum qızlar birlikdə şadlanmaq yolunu tutdular. Ədəb niqabını və həya örtüyünü üzdən açdılar. Kimin nə xoş sözü, gözəl oyunu var idi, qoydu araya. Gah nəğmələri ilə bülbüllərə həmavaz oldular, gah rəqsləri ilə şümşadı utandırdılar.

7. Lakin həvəs eyləməzdi Leyli,
Olmazdı bu ləhvü lə'bə meyli.
Artırmış idi bahar dərdin,
Gül zövqi rüxi-nigar zərdin.
İstərdi fərağət ilə bir dəm
Tənha tuta bir bucaqda matəm.
Ayrılmayıb ol pəriliqalər,
Artırdı bəlasına bəlalər.

7. Lakin Leyli oyun-əyləncəyə məhəl qoymadı. Bahar onun dərdini artırmış, gül zövqü üzünün sarılığını artırmışdır.Bir küncdə rahatca öz matəmini tutmaqdan başqa istəyi yox idi. Pərilər ondan əl çəkməyib dərdinin üstünə dərd gətirirdilər.

8. Çün eylədi kəsrət onu diltəng,
Neyrəng ilə verdi onlara rəng:
- "Key sərvlər, eyləmən iqamət,
Ta evdə çəkilməyə nədamət!
Durun, qılalım tərəf-tərəf gəşt,
Seyr eyləyəlim həvaliyi-dəşt.
Sancıb belə nazənin ətəklər,
Cəm eyləyəlim gözəl çiçəklər!
Çox dərməyə hər kim olsa qadir,
Oldur bu sənəmlər içrə nadir!"

8. Bu çoxluq onu darıxdırdığı üçün belə bir hiyləyə əl atdı. "Ey sərvlər, evimizdə peşman olmamaq üçün hamınız bu yerdə dayanmayın. Durun dağılışıb gəzək, çəməni, səhranı seyr edək. Belə yaraşıqlı ətəklər taxaq, gözəl çiçəklər yığaq. Kim çox çiçək dərə bilsə, gözəllər içində ən nadiri odur!

9. Bir yaniya getdi hər pərivəş,
Dağıldı şərər, tutuşdu ateş.
Tənha qalıb etdi naləvü zar,
Qıldı gözün əbrvəş gühərbar.

9. Qığılcımlar dağıldı, od isə alovlandı. Hər gözəl bir yana yönəldi. Leyli tək qaldı, nalə çəkib ağladı, bulud kimi gözlərindən incilər yaşı axıtdı.

## BU, LEYLİNİN ƏBR İLƏ İZHARİ-NİYAZİDİR VƏ EŞQ BABINDA KƏŞFİ-RAZIDIR

1. Əbr ilə təkəllüm etdi ağaz:
- "Key ahım ilə həmişə həmraz!
Göz yaşın ilə göyə yetərsən,
Sanma məni-zardan betərsən!
Ərz eyləmə rə'dü bərqü baran,
Bəhs etmə mənimlə ruzi-hicran!
Fəryad qılıb dəmi-səhərgah,
Əflakə çəkəndə şö'leyi-ah,
Seylabi-sirişk edəndə cari,
Gəl gör məni - zari-biqərari!
2. Ey əbr, hər əksiləndə suyin,
Dəryalara tökmə abi-ruyin!
Al suyu bu çeşmi-xunfəşandan,
Dəryalara həm bağışla ondan!
Ey əbr, mənə dəmi vəfa qıl,
Düşdü sənə hacətim, rəva qıl!
Var ol üzü gül nigarə məndən:
Zar ağla və söylə yarə məndən;
3. Key türfə nigari-nazəninim!
Vey arizuyi-dili-həzinim!
Gəl gör ki, ğəmində necə zarəm,
Sənsiz necə zarü biqərarəm!
Gəl gör ki, nədir ğəmində halım,
Rəngi-rüxi-zərdü əşki-alım!
Can bari-bədən götürməz oldu,
Göz rəngi-vücudu görməz oldu.
Canım canı, gözümün çirağı,
Rəhm eylə ki, gəldi rəhm çağı!
Mən bilməz idim bəla imiş eşq,
Bir dərdli macəra imiş eşq.
4. Derdin ki: bəla yolunda fərdəm,
Eşq içrə sənə şəriki-dərdəm.
Saldın məni-xəstəyi bu halə,
Dərdə məni eylədin həvalə!
Hər dərd ki var, Leyli aldı,
Mə'lumdurur, sənə nə qaldı?

## BU, LEYLİNİN BULUDA ÖZ DƏRDİNİ DANIŞMASIDIR VƏ EŞQİNİN SİRRİNİ AÇMASIDIR

1. O buludla danışmağa başladı: "Ey həmişə ahımın sirdaşı! Göz yaşınla göylərə yetərsən. Elə bilmə ki, mən ağlardan betərsən! Göylərin gurultusu, şimşəyi, yağışından danışma, ayrılıq günündə mənimlə bəhsə girmə! Səhər tezdən fəryad edəndə, ahımın şö'ləsi göylərə yüksələndə gözümün yaşı sel tək axanda gəl, mən ağlar biqərarı gör!

2. Ey bulud! Hər suyun əksiləndə, üzünün suyunu dəryaya tökmə! Suyu qan-yaş tökən gözlərimdən götür, dəryalara bağışla! Ey bulud, bir anlığa mənə vəfa qıl, sənə işim düşüb, onu yoluna qoy! Get ağla və o gül üzlü yarıma mənim adımdan de ki::

3. Ey türfə nazənin, nigarım, ey ürəyimin həzin arzusu. Gəl gör qəminlə necə ağlayıram, sənsiz necə ağlar biqəraram. Gəl gör ki, qəmində halım necədir, rəngimin saralığını, göz yaşımın qırmızılığını gör! Canım bədənimin ağırlığına dözmür. Gözlərim öz rəngimi seçmir. Canımın canı, gözümün çırağı - rəhm elə, rəhm çağı gəldi! Mən bilməz idim bəla imiş eşq, dərdli bir macəra imiş eşq!

4. Deyirdin bəla yolunda təkəm, eşq yolunda sənin dərdinə şərikəm. Mən xəstəni bu hala salıb, dərdə tapşırdın! Bütün olan dərdləri Leyli aldı, mə'lumdurmu sənə nə qaldı?

5. Ey mərd mənəm, - deyə uran laf,
İnsafmıdır bu? Qanı insaf?
Tut kim, xəsü xari-rəhgüzarəm,
Topraq kimi yolunda xarəm.
Xurşidi-cəmalın, ey məhi-növ,
Torpağa nola buraxsa pərtöv?
Barani-vüsalın, ey düri-nab,
Qılsa xəsü xarı nola sirab?

6. Olma meyi-qəflət ilə mədhuş;
Həmsöhbətin eyləmə fəramuş!
Ey yari-müvafiqü vəfadar!
Ey mən kimivü mənə səzavar!
Gəl yanıma, kəsmə aşinalıq,
Yaxşımı olur bu bivəfalıq?

7. Derlər səni aşiq, ey nikuru!
Aşiqlərə böyləmi olur xu?
Hər kim gərək öz işində kamil,
Aşiq nə rəva ki, ola kahil?
Aşiq gərək olmayıb qərari,
Tövf edə müdam kuyi-yari.

8. Düşməz bu yana sənin güzarın,
Var ola məgər bir özgə yarın?
Yarın mən isəm? Mənə nəzər qıl!
Gahi bu yanaya bir güzar qıl!
Gər səndə olan fərağəti-dil
Bir dəm mənə olsa idi hasil,

9. Geysuyi-müsəlsəlü girəhgir,
Boynumda gər olmasaydı zəncir,
Və bağlamayaydı bəndi-xəlxal
Qeyd ilə ayağımı məhü sal,
Eyb ilə çəkilməsəydi adım,
Billah, bu idi həmin muradım.
Kim, sayə misalı səndən, ey nur,
Olduqca vücudum olmayam dur!

10. Əmma nə edim? Əsiri-qeydəm,
Bir boynu, ayağı bağlı seydəm.
Bildirməyə möhnətü məlalım
Bu şe'r yetər bəyani-halım:

5. Ey mərdəm deyərək, lovğalanan, insafdırmı bu? Hanı insaf? Tutaq ki, yolunun torpağı, tozu, çör-çöpüyəm. Ey günəş camallım, ey ayüzlüm, nə olar bu torpağa da bir işıq salsan, vüsal yağışın, ey saf dürr, çör-çöpü də sudan doydursan?

6. Qəflət meyindən sərxoş olma, həmsöhbətini unutma! Ey vəfalı həmdərdim, yarım, ey mənim kimisi, mənə layiq! Yanıma gəl, dostluğu kəsmə! Bu vəfasızlıqmı yaxşıdır?

7. Ey gözəl sifətli, sənə aşiq deyirlər, aşiqlərin xasiyyəti beləmi olur? Hərə öz işində kamil olmalıdır, rəvadırmı aşiq key ola. Aşiq gərək səbrini itirib həmişə yarının diyarında dolansın.

8. Buralara sənin yolun düşmür, bəlkə başqa yarın var? Yarın mən isəm, mənə nəzər sal! Hərdən bu yana da güzar sal! Səndə olan rahat ürək nolaydı - məndə də olaydı.

9. Boynumda qıvrım saçlarım kimi zəncir olmasaydı, ayağımı xal-xal toy ayında bağlamasaydı, adım eyb ilə çəkilməsəydi, Allaha and olsun ki, bircə arzum bu olardı ki, ey nurum, bir kölgə kimi mən var ikən səndən uzaq olmayam!

10. Amma nə edim, bağlı əsirəm, boynu və ayağı bağlı bir ovam. Əzabımı və dərdimi anlatmaq, halımı təsvir etməyə bu şe'r yetər:

## BU ĞƏZƏL LEYLİYİ-DİLPƏZİRİNDİR

Eşq daminə giriftar olalı zar olubam,
Nə bəladır ki, ona böylə giriftar olubam?

Dil deməkdən kəsilib, tən hərəkətdən, vəh kim,
Künci-ğəmxanəyə bir surəti-divar olubam.

Qüdrətim yox ki, qılam kimsəyə şərhi-ğəmi-dil,
Öylə kim, arizeyi-hicr ilə bimar olubam.

Həzərim tə'nədən ol ğayətə yetmişdir kim,
Yarə əğyar olub, əğyarım ilə yar olubam.

Deməzəm dəxi: "Sənə aşiqəm", ey gül! Zira
Sənə aşiqliyim izhar edəli xar olubam.

Əqlü səbrü dilü din getdi bihəmdillah kim,
Səfəri-sahili-dəryayə səbükbar olubam,

Yox, Füzuli, xəbərim mütləq özümdən, bəs kim,
Valehi-nəqşi-xəyali-rüxi-dildar olubam.

## BU QƏZƏL LEYLİ DİLPƏZİRİNDİR

Eşq toruna düşəli ağlar olmuşam,
bu nə bəladır ki, belə düçar olmuşam?

Dilim söz tutmur, canım hərəkətdən qalıb,
elə bil, qəm evinin küncünün divarına bəzək olmuşam.

Ürəyimin dərdini bir kimsəyə açmağa gücüm qalmayıb,
çünki, ayrılıq dərdinə düşüb xəstə olmuşam.

Tə'nədən bezarlığım o həddə çatıb ki, .
Yarıma yad, yadlara həmdəm olmuşam.

Daha "sənə aşiqəm" demərəm, ey gül!
Çünki sənə aşiqliyimi açdığım gündən xar olmuşam.

Əqlim, səbrim, ürəyim, dilim, dinim gedibdir,
Allaha şükr ki, dəniz sahilinə atılmaq üçün yüngül olmuşam.

Ey Füzuli, özümdən heç bir xəbərim yoxdur,
Ona görə ki, sevgilimin üzünün naxışının xəyalına valeh olmuşam.

## BU, LEYLİNİN KÜNCÜ-ĞƏMDƏ GİRYANLIĞIDIR VƏ MƏCNUNUN VADİYİ-EŞQDƏ SƏRGƏRDANLIĞIDIR

1. Zar ağlar ikən bu rəsmə ol mah,
Bir türfə səda eşitdi nagah.
Bir kimsə oxurdu şe'ri-Məcnun,
Bu nüktə ibarətində məzmun:
- "Key nəş'əyi-eşqdən uran dəm!
Məcnuni sağınma Leylidən kəm!
Məcnun ilə Leylini bərabər
Gər kimsə deyərsə, qılma bavər!
Leylidə əgərçi dərd çoxdur,
Məcnuni-həzincə dərdi yoxdur.
2. Leyli əli ignədəndir əfgar,
Məcnuna qılınclar eyləməz kar.
Leyli istər ki, əksilə ğəm,
Məcnun ğəmin artırar dəmadəm.
Leylini edər hərir dilgir,
Məcnuna verər nəşat zəncir.
Məcnundur olan ğəmə giriftar,
Leyli kimə olmuş ola ğəmxar?
Məcnuna yetər şikənceyi-təb,
Leyli kimədir təbib, ya rəbb?
Məcnundur əsiri-dami-Leyli,
Leyli kimə salmış ola meyli?"
3. Leyli tutub ol təranəyə guş,
Öz nəğməsin eylədi fəramuş.
Təhqiq ilə bildi bu hesabı
Kim, yox şərərində şö'lə tabı.
Əlbəttə, bəlavü dərdi gərdün
Məcnuna veribdir ondan əfzun.

## BU, LEYLİNİN QƏM KÜNCÜNDƏ AĞLAMAĞIDIR VƏ MƏCNUNUN EŞQ VADİSİNDƏ SƏRGƏRDANLIĞIDIR

1. O ayüzlü öz gününə ağlarkən birdən qəribə bir səs eşitdi - kimsə Məcnunun şe'rini oxuyurdu. Məzmunu beləydi: - Ey eşq nəş'əsindən dəm vuran! Məcnunu Leylidən kəm tutma! Kim desə ki, Məcnunla Leyli bərabərdir, inanma! Hərçənd Leylinin dərdi çoxdur, amma yazıq Məcnununku qədər deyil.

2. Leylinin əlinə iynə batıb yaralar, Məcnuna qılınc da kar eləmir. Leyli qəminin azalmasını istəyir, Məcnun isə dərdini daima artırır. Leylinin ürəyini ipək darıxdırır, Məcnuna isə zəncir şadlıq verir. Qəmə mübtəla olan Məcnundur, Leyli görən kimin dərdini çəkir? Məcnun qızdırma içində işkəncədədir. Leyli görəsən kimin həkimidir, ay Allah? Məcnun Leyli dərdinin torunun əsiridir, Leylinin bəs kimədir meyli?

3. Leyli bu nəğməyə qulaq asıb, öz nəğməsini unutdu və dəqiq bildi ki, onun qığılcımının işığı yox imiş. Əlbəttə, fələk bəla və dərdi Məcnuna ondan çox veribmiş.

## BU, LEYLİNİN İBNİ SƏLAMA GİRİFTAR OLDUĞUDUR VƏ YARDAN MƏHRUM VƏ MÜQƏYYƏDİ-ƏĞYAR OLDUĞUDUR

1. Me'mari-səraçeyi-ibarət
Böylə bu evi qılır imarət:
Kim, seyrdən almayıb təsəlli
Öz mənzilinə dönəndə Leyli,
Vermişdi özünə dürlü ziyvər,
Hər ziyvərə bir nəticə müzmər.
Ta məhv ola gözdən axıdan xun,
Həm kömləyi, həm donuydi gülgun.
Ta kim, ola dudi-ahə manənd,
Bağlanmış idi bənəfşə sərbənd.
2. Ta kim, ola sövti-nalə pamal,
Qullanmış idi sədalı xəlxal.
Ta olmaya əşk üzdə mə'lum,
Rüxsarına lö'lö idi mənzum.
Rə'na başa sərpübən ləçəklər,
Nazik belə sancuban ətəklər,
Pərvanəsiz eyləməzdi şəm'in,
Eylərdi düri-sirişk cəm'in.
Rə'na-rə'na yürürdü ol mah,
Bir şəkl ilə kim, təbarəkallah.
3. Ol əsrdə var idi ərəbdə
Bir mö'təbər əsldə, nəsəbdə,
Mənzuri-əazimü əali,
Məqbuli-əkabiri-əhali.
İdraki büləndü hüsni dilkəş,
Ətvari xücəstə, siyrəti xoş.
Vermiş həq onun olan muradın
Bəxt ibn Səlam qılmış adın.
4. Ol türfə hümayi-övci-iqbal,
Asudəzəmirü fariğülbal,
Ov qəsdinə eyləmişdi pərvaz,
Altında üqab, əlində şəhbaz.
5. Bir rahgüzərdə ol nigarə
Uğraşdı və qıldı bir nəzarə.
Canü cigərində qalmadı tab,
Məhv oldu, necə kim, odda simab.
Tərk etdi əziməti-şikarı,
Gəldi evə, getdi ixtiyarı.

## BU LEYLİNİN İBNİ SƏLAMA GİRİFTAR OLDUĞUDUR VƏ YARDAN MƏHRUM VƏ BAŞQASINA ƏSİR OLDUĞUDUR

1. Söz sarayının me'marı bu evi belə qurur: seyrdən təsəlli almayan Leyli öz mənzilinə dönəndə özünə rəngarəng ziynət vermişdi. Hər bəzəyin gizli bir mə'nası var idi. Gözündən axan qanı gizlətmək üçün köynəyi də, donu da gül rəngli idi. Ahının tüstüsü görünməsin deyə başına bənövşə rəngli örtük salmışdı.

2. Naləsi eşidilməz olsun deyə ayağına səsli xal-xal taxmışdı, göz yaşını gizlətmək üçün üzünə incilər düzmüşdü. Rə'na başına ləçək taxıb, ətəklərini nazik belinə sancmışdı, şamını pərvanəsiz eyləməzdi, göz yaşı incilərini toplayırdı. Nazlı-nazlı yeriyirdi, elə bir yerişlə gedirdi ki, bərəkallah!

3. O zamanlar ərəbdə bir hörmətli, əsilli, nəsilli tamam əhali başçılarının sevimlisi, ali və əzəmətlilərin seçilmişi, ağlı uca, hüsnü ürəyə yatan, mülayim və xoş xasiyyətli birisi var idi. Allah onun bütün arzularını yerinə yetirmişdi, bəxt onun adını ibn Səlam qoymuşdu.

4. O, səadət zirvəsinin quşuydu, könlü asudə, başı rahat, altında qartal misallı bir at, əlində tərlan ova çıxmışdı.

5. Bir keçiddə o bir sənəmə rast gəldi və baxdı, can-ciyərində tab qalmadı. Civə odda yanan kimi o da yandı, ovdan əl çəkib evə döndü, ixtiyarını itirdi.

6. Tərh etdi binayi-rəsmi-peyvənd,
Tədbir ilə buldu bir xirədmənd.
Kim, lütf ilə söz ğılanda təqrir,
Təqriri verərdi daşa təğyir.
İn'am edibən ona bəsi mal,
Leyli tələbinə qıldı irsal.
7. Şərt eylədi ol bülənd əxtər
Kim, olsa bu kami dil müyəssər.
Sərf eyləyə gəncü mali-aləm,
Canane yolunda, bəlkə can həm.
8. Çün gəldi bu razi-dil bəyanə,
Oldu ona razı atə-anə.
Ol müştəriyə verildi Zöhrə,
Şayəstə görüldü Mah Mehrə.
Çün ibn Sələmə yetdi peyğam,
Tənbihi-nişatü müjdeyi-kam,
Dəryayi-nişati gəldi mövcə,
Baş çəkdi nihali-bəxti övcə.
9. Məxzən-məxzən cəvahir açdı,
Xərmən-xərmən nisar saçdı.
Açdı dəri-gənci-gövhərü zər,
Fəqr əhlini eylədi təvangər.
Ol sərvin ayağı bağlı oldu,
Azadə ikən adağlı oldu.

6. Evlənmə binası qurmaq məqsədilə lütf ilə danışanda sözü daşdan keçən bir müdrik seçdi, çoxlu var-dövlət bağışlayıb Leyliyə elçi göndərdi.

7. O uca ulduz şərt qoydu ki, əgər muradı hasil olarsa, canan yolunda varından-yoxundan, xəzinəsindən, hətta canından belə keçəcəkdir.

8. Bu ürək arzusu açılanda Leylinin ata-anası razı oldu. Zöhrəni o Müştəriyə verdilər, ay günəşə layiq görüldü. Elə ki, ibn Səlama bu kama yetmək xəbəri çatdı, nəş'ə dənizi cuşa gəldi, bəxtinin budağı göylərə yüksəldi.

9. Qızıl və gövhər xəzinələrini açıb şabaş xırmanını qurdu, kasıbları mal-dövlətlə dövlətləndirdi. Sərvinsə ayağı bağlandı, azadə ikən, adaxlı oldu.

## BU, NOVFƏLİN MƏCNUNLA MÜQƏDDİMEYİ-İXTİLATIDIR VƏ OL CƏVAHİRİ-PAKDƏN İNBİSATIDIR

1. Saqi, yenə qəsdi-can edər ğəm,
Ver cam ləbaləbü dəmadəm!
Bikəs qalıbam məni-səbükray,
Sən eyləməsən mənə mədəd, vay!
Mən şiftənin pənahı olğıl!
Bikəslər ümidgahı olğıl!
Cəhd eyləvü qılma bir işə əhd,
Vər əhd eləsən vəfayə qıl cəhd.

2. Şəmşiri-mübarizi-fəsanə,
Bu rəzmdə böylə batdı qanə.
Kim, var idi bir xücəstəfərcam,
Ol əsrdə adilü nikunam;
Tiğilə müsaf müşküli həll,
Mə'rufi-zəmanə, adı Novfəl.

3. Həm eşq yolunda çox yügürmüş,
Həm çox sitəmi-zəmanə görmüş.
Bəzmində misali-dürri-məknun,
Bir gün oxunurdu şe'ri-Məcnun,
Ğayətdə bəyəndi tərzi-pakın,
Məzmuni-kəlami-suznakın,

4. Sordu sifətin, dedilər: - "Ey şah!
Aşiftə ğılıbdır onu bir mah.
Rüsvalıq edib özünə pişə,
Damü dəd ilə gəzər həmişə".
Novfəl qılıb arizuyi-Məcnun,
Əshab ilə qıldı əzmi-hamun.

5. Bir guşədə gördü zarü məhcur,
Halı nəsəqi-səlahdən dur,
Ətrafını teyrü vəhşi almış,
Vəhşət onu bir həsarə salmış,
Çün daireyi-sibaü hail,
Qət etdi, süpəh görüb səlasil,

6. Məcnuna yetişdi ol vəfadar,
Asari-tələttüf etdi izhar:
- "Key xəstə, nədir bu çəkdiyin rənc,
Viranədə zaye etdiyin gənc?!
Vəhşi nə bilir sənin məqamın?
Həmcinslərindən istə kamın!
Hal əhlisən, istə əhli-hali,
Səhralərə düşmə, laübali

## BU, NOVFƏLİN MƏCNUNLA İLKİN GÖRÜŞÜDÜR VƏ PAK CƏVAHİRƏ ÜRƏYİ YANMASIDIR

1. Saqi, yenə qəm canımın qəsdinə durub, daim ağzına qədər dolu cam ver! Mən iradəsizin bir kəsi yoxdur. Sən mənə kömək olmasan, vay halıma! Mən heyranın, kimsəsizin pənahı, ümidgahı ol! Bir işdə əhd eləmə, əhd elədinsə, çalış vəfalı ol!

2. Əfsanə mübarizinin qılıncı bu vuruşda qana belə batdı ki: O vaxt bir xoşbəxt, ədalətli, adlı-sanlı qılıncı ilə çox çətinliklərin düyününü aça bilən Novfəl adlı bir zəmanə məşhuru var idi.

3. Həm eşq yolunda çox yürümüşdü, həm də çox zəmanə zülmü görmüşdü. Bir gün məclisində Məcnunun qiymətli dürrə bənzər şe'ri oxunurdu. Onun səlis, üslubunu, odlu sözlərinin məzmununu çox bəyəndi.

4. O kimdir deyə soruşdu, dedilər: "Ey şah! Onu bir ay özünə vurğun edibdir, rüsvaylığı özünə peşə edib heyvan və vəhşilərlə bir yerdə həmişə gəzir". Novfəl Məcnunu görmək istədi, yoldaşları ilə səhraya yollandı.

5. Onu bir küncdə atılmış və ağlar tapdı. Halını yaman gündə gördü. Ətrafını quşlar və vəhşilər bürümüşdü. Yırtıcı heyvanlar onu dövrəyə almışdılar. Vəhşilər qoşunu görüb öz sıralarını dağıtdılar.

6. O vəfadar Məcnuna çatıb mehribanlıqla dedi: "Ey yazıq, bu nə əzabdır çəkirsən, niyə xəzinəni zay etmisən?! Vəhşilər sənin qədrini nə bilərlər. Həmcinslərindən kamını dilə! Hal əhlisən, hal əhlini istə. Sərgərdan səhralara düşmə!

7. Dövlət diləsən, hümadən istə,
Gənc istəsən, əjdəhadən istə!
Ğəm çəkmə ki, mən olunca ğəmxar,
Yarın sənə ənqərib olur yar.
Gər olsa zər ilə iş sərəncam,
Yük-yük tökəlim zər, alalım kam,
Vər olsa ğərəz müsafə möhtac,
Biz qan tökəlim, sən eylə tarac.
Ancaq ola gör mənimlə həmdəm,
Mən kim səninəm, sənindir ol həm".

7. Dövləti huma quşundan, xəzinəni əjdahadan istə. Neçə ki, qəmxarın mənəm, qəm çəkmə, sabah yarın sənə yar olar. İşin qızılla ötsə, yük-yük qızıl tökərik, kam alarıq. Əgər vuruşa ehtiyac qalsa, biz qan tökərik, qənimət sənə çatar. Mənimlə dost ol və bil ki, mən səninəmsə, demək o da sənindir".

## BU, MƏCNUNUN NOVFƏL İLƏ DƏRDİ-DİL ƏDASIDIR VƏ ŞƏRHİ-TƏFSİLİ-MACƏRASIDIR

1. Məcnun dedi: - "Ey yeganeyi-əhd!
Tədbirimə çoxlar etdilər cəhd.
Çox əhli-əzaim etdi tədbir,
Olmadı pəri bu divə təsxir.
Topraqlərə töküldü çox zər,
Olmadı bu kimiya müyəssər.
2. Səndə, bilirəm ki, lütf çoxdur,
Nə sud, çü məndə bəxt yoxdur.
Sürmə, bilirəm ki, artırır nur,
Nə faidə, göz əgər ola kur?
iqbalıma yoxdur e'timadım,
Müşkül görünür mənim muradım.
3. Ah, ər qılasan bu şüğlə iqdam,
Rə'yincə iş olmaya sərəncam,
Həm dustum olmaya mənə yar;
Həm düşmən ola nə dust kim var.
4. Bəxtim, bilirəm, mənim yamandır,
Sud istədiyin mənə ziyandır,
Bəxtim sifətində bir ğəzəl var
Daim qılıram mən onu təkrar:

## BU, MƏCNUNUN NOVFƏLƏ ÜRƏYİNİN DƏRDİNİ AÇMASIDIR VƏ MACƏRASINI ƏTRAFLI SÖYLƏMƏSİDİR

1. Məcnun dedi: "Ey zəmanənin yeganəsi! Çox dua-tədbirlə cəhd etdilər, mənə yardım göstərmək istədilər, lakin pəri divə tabe olmadı. Torpağa çox qızıl töküldü, bir fayda olmadı.

2. Səndə, bilirəm, lütf çoxdur, nə fayda, məndə bəxt yoxdur. Bilirəm ki, sürmə göz işığını artırır. Göz kordursa, nə fayda. Bəxtimə inamım yoxdur, murada çatmağım çətin görünür.

3. Ah, qorxuram bu işə başlayasan və iş də sən istədiyin kimi bitməyə, həm sevgilim mənə yar olmaya və həm də bütün dostlarım dönüb düşmənim ola.

4. Bilirəm ki, bəxtim yamandır, sənin vermək istədiyin fayda mənə ziyandır. Bəxtim sifətində bir qəzəl var, daim mən onu deyirəm:

## BU ĞƏZƏL MƏCNUNİ-ZARINDIR

Vəfa hər kimsədən kim istədim, ondan cəfa gördüm,
Kimi kim bivəfa dünyada gördüm, bivəfa gördüm.

Kimə kim dərdimi izhar qıldım istəyib dərman,
Özümdən həm betər bir dərdə onu mübtəla gördüm.

Mükəddər xatirimdən qılmadı bir kimsə ğəm dəf'in,
Səfadən dəm uran həmdəmləri əhli-riya gördüm.

Əgər su damənin tutdum, rəvan döndərdi üz məndən
Və gor güzgudən umdum sidq, əksi-müddəa gördüm.

Ayaq basdım dəri-ümmidə, sərgərdanlıq əl verdi,
Hünər sərriştəsin tutdum, əlimdə əjdəha gördüm.

Mənə göstərdi gərdun, tirə bəxtim kövkəbin yüz gəz,
Məni-bədbəxt ona hərgah kim baxdım, qara gördüm.

Füzuli, əyb qılma, üz çevirsəm əhli-aləmdən,
Nədən kim, hər kimə üz tutdum, ondan yüz bəla gördüm.

## BU QƏZƏL AĞLAR MƏCNUNUNDUR

Kimdən ki, vəfa istədim, ondan cəfa gördüm.
Vəfasız dünyada kimi gördümsə, vəfasız gördüm.

Kimə ki, dərdimi söyləyib dərman istədim,
onu özümdən də betər bir dərdə düşmüş gördüm.

Kədərli könlümdən heç kəs qəmi yox etmədi.
Səfadan dəm vuran dostları riya əhli gördüm.

Suyun ətəyindən yapışdım, axarı məndən üz döndərdi.
Güzgüdən sədaqət umdum, orada da gözlədiyimin əksini gördüm.

Ümid qapısına ayaq basdım, sərgərdanlıq qismətim oldu,
Hünər ipinin ucundan yapışdım, əlimdə əjdəha gördüm.

Göylər qara baxtımın ulduzunu yüz dəfə mənə göstərdi.
Nə vaxt baxdımsa, mən bədbəxt onu qara gördüm.

Füzuli, dünya əhlindən üz çevirsəm, əyb tutma,
Ona görə ki, hər kimə üz tutdumsa, ondan yüz bəla gördüm.

## BU, NOVFƏLİN MƏCNUNA ÜMİDVARLIQ VERDİYİDİR VƏ HÜSNİ-MÜSAHİBƏTLƏ RİZASINA GİRDİYİDİR

1. Novfəl dedi: - "Ey ədibi-kamil!
Feyzi-nəzərimdən olma ğafil!
Lillahilhəmd ğeyrətim var,
Ğeyrət qədərincə qüdrətim var.
Sən cəhd elə ki, yar ola əhl,
Çün yardır əhl, kardır səhl",
2. Məcnun həm ümid ilə olub şad,
Tərk etdi təriqi-təb'i-mö'tad.
Həm sildi ğübari-fərqi-geysu,
Həm eylədi qət, naxunu mu.
Həm cisminə verdi ziybi-camə,
Həm başına ziyvəri-əmamə.
3. Bəzmi-tərəbi məqam tutdu,
Meyli-tərəb etdi, cam tutdu.
Novfəl həm olub mülazimi-əhd,
İmdadına qıldı can ilə cəhd.
Aldı ələ müşkbar xamə,
Leyli həşəminə yazdı namə:
4. - "Key taifeyi-büləndpayə!
Biganəlik etmin aşinayə!
Edib məni iltifatə məmnun,
Leylini ədin rəfiqi-Məcnun!
Ol lalə isə, bu nəstərəndir,
Şimşad isə ol, bu narvəndir.
5. Ol buna, bu onadır səzavar,
Ey əhli-ğərəz, nədir bu azar?!
Kam olsa niza'sız müyəssər,
Ha, gənci-dürü xəzaneyi-zər!
Vər olsa bu xeyr işdə tə'xir,
Ha, tə'ni-sinanü zərbi-şəmşir!"
6. Ol qövmə çü rövşən oldu əhval,
Oldu bu cəvab olardan irsal
Kim: - "Bizdə cünun əlacı yoxdur!
Divanələr ehtiyacı yoxdur.
Gəncü dürə eyləmə təfaxür!
Bəsdir bizə gəncimizdəki dür!
Laf ilə qılıncdan urmağıl dəm.
Kim, var qılıncımız bizim həm!"

## BU, NOVFƏLİN MƏCNUNA ÜMİDVARLIQ VERDİYİDİR VƏ GÖZƏL SÖHBƏTLƏ RAZI SALDIĞIDIR

1. Novfəl dedi: "Ey kamil ədib! Sənə xeyirxahlıq meylimdən xəbərsiz olma! Allaha şükr ki, qeyrətim var və qeyrətim qədər də qüdrətim var. Sən cəhd elə, yarın sənə yar olsun. Yarın sənə yar olsa, iş düzələndir".

2. Məcnun ümidlə şad olub, adət etdiyi yolundan döndü. Dırnaqlarını tutdu və saçını qaydaya saldı. Əyninə bəzəkli paltar geydi, ziynətli çalma bağladı.

3. Şadlıq məclisinə getdi, keyfi durulsun deyə ələ cam aldı. Novfəl əhdinə vəfa edərək, - candan ona köməyə çalışdı, əlinə müşk ətirli qələm aldı, Leylinin ailəsinə məktub yazdı:

4. "Ey ulu ailə! Dosta biganə olmayın! Mənə iltifat göstərin, Leylini Məcnuna yoldaş edin! O lalədirsə, bu nəstərəndir. O şümşaddırsa, bu da narvənddir kölgəli ağacdır.

5. O buna, bu ona yaraşır. Ey qərəz əhli, bəs bu nə əzabdır?! Qovğasız istəyimizə əməl olsa, budur dürr və qızıl xəzinələri! Yox, bu xeyir iş baş tutmasa, budur, bu nizə, bu da qılınc zərbəsi".

6. Tayfaya məsələ aydın olunca belə bir cavab göndərildi: "Bizdə dəliyə dərman yoxdur. Divanələrə ehtiyac da yoxdur! Dürr və xəzinə ilə qürrələnmə! Xəzinəmizdəki dürrümüz bizə bəsdir. Lovğalanıb qılıncdan dəm vurma, bizim də qılıncımız var!"

## BU, NOVFƏLİN LEYLİ HƏŞƏMİLƏ RƏZM ETDİYİDİR VƏ RƏZMDƏ ĞALIB OLMAYIB, SÜLHƏ ƏZM ETDİYİDİR

1. Novfəl ki, eşitdi bu cəvabı,
Tərk eylədi şahidü şərabı.
Cəm etdi sipahi-binihayət,
Çaldırdı nəfirü çəkdi rə'yət.
Ol qövm həm oldular xəbərdar,
Cəm eylədilər sipahi-xunxar.
2. Rəf oldu iki tərəfdən azərm,
Həngaməyi-rəzmi etdilər gərm.
Bir sübh ki, qıldı xosrövi-Rum,
Şam əhlinə hind fəthini şum;
3. Səyyarədən aldı məhr meydan,
Çaldı qılıcın, götürdü qalxan.
Gün xəncəri oldu aşikarə,
Gərdun zirehini etdi parə.
Şətrəncsifət ol iki ləşkər
Bir-birinə durdular bərabər.
Gəh nizə qılırdı cansitanlıq,
Gah navək edərdi xunfeşanlıq.
4. Ol bənzər idi qədi-nigarə,
Bu ğəmzəyi-dilfiribi-yarə.
Eylərdi zəbani-tə'ni-şəmşir
Əhvali-ədəm vücuda təqrir.
Əhvalına xalqın ağlayıb zar,
Çeşmi-zireh olmuş idi xunbar.
5. Gürz ilə olurdu xürd hər su,
Cövşənlərü üstüxani-pəhlu.
Rəzm oldu bəla yağışlı bir miğ,
Rə'dü bərqi tüfəng ilə tiğ.
Göstərdi güzar gürzü peykan,
Qalxanda zireh, zirehdə qalxan.
6. Məcnun olara qılıb nəzarə,
Çəkmişdi özünü bir kənarə,
Durmuşdu ələmmisal bibak,
Bir ərsədə şərmsarü ğəmnak.
Çəkmişdi bu ləşkər içrə rə'yət,
Ol ləşkər üçün dilərdi nüsrət.
7. Bunlar ilə hay-huy edərdi,
Fəth onlara cüstcuy edərdi,
Bu ləşkər ona müinü ğəmxar,
Ol talibi-fəthi-ləşkəri-yar

## BU NOVFƏLİN LEYLİ QƏBİLƏSİYLƏ VURUŞMASIDIR VƏ VURUŞDA QALİB OLMAYIB, SÜLHƏ MEYL ETMƏSİDİR

1. Novfəl bu cavabı eşidən kimi şərabdan əl çəkdi, sonsuz qoşun topladı, şeypurlar çaldırdı, bayraq ucaltdı. O tayfa da xəbər tutdu. Qan içən qoşun yığdılar.

2. Hər iki tərəf dincliyi atıb, davanı qızışdırdılar. Sübhdən Rum Xosrovu, - yə'ni günəş, Şam əhlinə səhəri açdı, hind əhlini fəth elədi (səhər açıldı).

3. Günəş ulduzların meydanını əllərindən alıb qalxan götürüb, qılınc çaldı, göylərin zirehini yardı. Şahmat taxtasındakı kimi iki ordu üz-üzə dayandı. Gah nizələr can qəsdinə durdu, gah oxlar qan tökdülər.

4. Nizələr yarın qəddinə, oxlar yarın könül aldadan qəmzəsinə bənzəyirdi. Qılıncın tiyəsi varlığın yoxluğa keçməsinə qərar verirdi. Xalqın əhvalına ağlayıb zirehin gözü qan-yaş tökürdü.

5. Gürz hər yanı xurd-xəşil eləyirdi, dəbilqələri də, sümükələri də oxlayırdı. Bəla yağışı bir bulud yaratmışdı, onun ildırımı və şimşəyi tüfəng ilə qılınc olmuşdu. Gürzlərdə oxların, zirehdə qalxanın və qalxanda zirehin əksi görünürdü.

6. Məcnun bir kənara çəkilib bir guşədə dərdli və xəcalətli onlara baxırdı, bayraq kimi qorxusuz dik durmuşdu. Bu ordunun içində bayraq qaldırmışdı, o biri orduya qələbə diləyirdi.

7. Burada hay-küy salırdı, oranın üstünlüyünü istəyirdi. Bu ləşkər onun köməyi və arxası olsa da, o sevgilisinin qoşununun qələbəsini arzulayırdı.

8. Gər öz sipəhində görsə məqtul,
Şükr eyləməyə olurdu məşğul,
Vər görsə qətili-qövmi-dildar,
Dərd ilə qılırdı naləvü zar.
9. Səbzə kimi, olsa gər müyəssər,
Öz ləşkərinə urardı xəncər.
Bir kimsə dedi ki: - "Ey siyəhruz!
Xəsmini dilərmi kimsə firuz?
Biz can qılırız yolunda pamal,
Sən düşmən üçün dilərsən iqbal?
10. Əqlə bu iş eyləməz dəlalət,
Gər aqil isən, nədir bu halət?"
Məcnun dedi: - "Mən fədayi-yarəm,
Vəslinə onun ümidvarəm.
Çün ləşkəri-yardır qılan rəzm,
Ol rəzmə nə layiq eyləmək əzm?
11. Çün dust sipahidir edən cəng,
Düşmənliyə xoş deyildir ahəng,
Xoşdur ki, bulam vüsalə fürsət,
Yarım tərəfində ola nüsrət,
Canım ola dust dilpəziri,
Ya küştəsi ola, ya əsiri.
12. Bu mə'rəkədə nişatməndəm,
Ol silsilədə əsiri-bəndəm.
Müşkül işə olmuşam giriftar,
Əğyarım yarü yarım əğyar
Gər qətlimə dust çəksə şəmşir,
Yox məndə rizadan özgə tədbir.
Xoşnud deyilmiyəm bu halə,
Kim canı verəm, yetəm visalə".
13. Çün böylə cavab eşitdi sail,
Ol fəzlü kəmalə oldu qail
Gəldikcə olub ziyadə aşub,
Az qaldı ki, Novfəl ola məğlub,
Əlqissə, müyəssər olmayıb kam,
Ol gün cədəl oldu sübh ta şam.
14. Çün oldu əyan təliəyi-şəb,
Meydani-sipehri tutdu kövkəb,
Asayişə hasil oldu fürsət,
Can almağa verdi mərg möhlət,
Hər səf bir arada tutdu mənzil,
Bir-birinə qondular müqabil

8. Öz qoşunundan öldürülmüş görəndə şükr eyləyirdi, yar qəbiləsindən ölmüş görəndə dərd ilə nalə çəkirdi.

9. Əgər əlindən gəlsəydi, öz qoşununu göy kimi xəncərlə biçərdi. Kimsə dedi ki: - "Ey qaragün! Heç insan da düşməninə qələbə diləyərmi? Biz sənin yolunda canımızdan keçirik, sən düşmənə bəxt diləyirsən.

10. Ağlını hardan görək? Aqilsənsə nədir bu hal?" Məcnun dedi: "Mən yarın qurbanıyam, onun vəslinə ümidim var.

11. Vuruşan yar ordusudur. Bu vuruşa mən nə deyim? Vuruşanlar dost döyüşçüləridir, bu düşmənliklə uyuşmur. Qələbənin yar tərəfində olması və onunla görüşmək fürsəti axtarıram. Qoy canım dostun əlinə keçsin ya ölü, ya əsir kimi.

12. Bir tərəfin zəncirində əsirəm, buxovluyam, bir tərəfin vuruşundan isə şadlanıram. Çox çətinə düşmüşəm, yarım mənə yad olub, yadlar yar. Əgər dostum mənə qılınc çəkib öldürsə, razılıqdan başqa işim yoxdur. Canımdan keçib vəslə yetməkdən necə xoşhal olmayım".

13. Xəbər alan bu cavabı eşidəndən sonra onun fəzlinə və kamalına qiymət verdi. Get-gedə Novfəlin qoşununda narazılıq artdı və az qaldı ki, Novfəl məğlub ola. Qısası öz istəyinə çatmayacağı göründü. O gün səhərdən axşamacan vuruş davam elədi.

14. Gecənin ön dəstəsi axşam görsəndi, göyün meydanını ulduzlar tutdu, rahatlıq fürsəti tapıldı. Ölüm can almağa möhlət verdi. Hər cərgə bir yerdə bir-birinə qarşı yerləşdi.

15. Həmdəmlərə razın açdı Novfəl,
Kim: - "Müşküli-halımı qılın həl!
Mən əşcə'i-əhli-ruzigarəm,
Xurşidi-sipehri-karzarəm.
Yox kimsədə təbi-tiği-tizim,
Əndişeyi-taqəti-sitizim.
16. Bu rəzmdə bilməzəm nədir hal
Kim, fəthimə nüsrət eylər ehmal?
Əlbəttə ki, həq rizasıdır bu,
Bir əhli-həqin duasıdır bu!"
17. Ərz eylədilər ki: - "Ey cahandar!
Məcnundan olubmusan xəbərdar?
Biz can qılırız onun fədası,
Ə'damızadır onun duası.
Biz qəsd ediriz onun muradın,
Ol düşmənə bağlar e'tiqadın".
18. Novfəl ki, eşitdi ol kəlamı,
Qalmadı ol əmrə ehtimamı.
Bilmişdi ki, sahibi-nəzərdir,
Əlbəttə duası mö'təbərdir.
Bildi ki, müyəssər olmaz ol kam,
Tə'sir qılır dua sərəncam.
19. Çün vəsl deyildi hökmi-təqdir,
Müşkül ki, əsər verəydi tədbir.
Vəhm etdi ki, mün'əkis ola hal,
Rəzmində mübarək olmaya fal.
Kirdarını görmədi münasib,
Nəzr etdi ki: gər olursa ğalib,
Zikr etməyə dəxi Leyli adın,
Tərk edə bu əmr üçün inadın.

15. Novfəl dostlarına sirrini açdı: "Çətin işimi həll edin. Dünyada məndən cəsuru yoxdur, qələbə göylərinin günəşiyəm. Heç kəs mənim qılıncıma, nizəmə, vuruş gücümə tab gətirə bilməz.

16. Başa düşə bilmirəm, bəs nədəndir ki, bu vuruşda qələbəm ləngiyir? Əlbəttə, bu haqqın razılığıyladır, bir Allah adamının duasındandır.

17. Cavab verdilər ki, "Ey cahandar! Məcnundan xəbərin varmı? Biz onun yolunda can veririk, o bizim məğlub olmağımız üçün dua edir. Biz onun muradına çalışırıq, onun inamı düşmənlərlədir".

18. Novfəl bu kəlamı eşidən kimi bu işi yerinə yetirməyə daha cəhd etmədi. Anladı ki, duaçı Allahın nəzərindədir və duası qəbul ediləcəkdir. Bildi ki, arzunun yerinə yetməməsi üçün əvvəl- axır dua öz tə'sirini göstərəcəkdir. Çətin ki, tədbir bir fayda verə.

19. Çünki taleyin hökmü onları qovuşduran deyil. Ağlına gəldi ki, iş tərsinə də çevrilə bilər, bu vuruşmada uğursuzluğa düçar ola bilər. Öz əməlini münasib görməyib nəzir dedi ki, əgər bu vuruşmada o, qalib gəlsə, Leylinin adını çəkməyəcək və öz inadından əl çəkəcək.

## BU, NOVFƏLİN İKİNCİ NÖVBƏT RƏZM EDİB QALİB OLDUĞUDUR VƏ VƏFAYİ-ƏHDƏ KAZIB OLDUĞUDUR

1. Çün tiğ çəkib mübarizi-Rum,
Şam əhlini etdi əmrə məhkum,
Fəth oldu sipahi-türkə mənsub,
Oldu ərəbin sipahı məğlub,
Adətcə, yenə ol iki ləşkər,
Rəzm etməyi etdilər müqərrər;
2. Tiğ aldı əlinə pəhlivanlar,
Başlar kəsilib, töküldü qanlar.
Can eylədi tərki-xaneyi-tən,
Ol çıxmağa açdı tir rövzən.
Başlarda bəlani çox görüb əql,
Bir özgə məqamə eylədi nəql.
3. Peykan zireh içrə oldu peyvənd.
Gül şaxələrində qönçəmanənd.
Əlqissə, xilafi-rəzmi-əvvəl,
Ə'dayə müzəffər oldu Novfəl.
Xəsm etdi qəbul hökmi-taət,
Başlandı təzərröü şəfaət.
4. Leylinin atası açdı başın,
Doldurdu gözünə qanlı yaşın,
Əcz ilə dedi ki: - "Ey xudavənd!
Şahənşəhi-adilü xirədmənd!
Gər Leyli üçündür iztirabın,
İkrah ilə verməzəm cavabın.
5. Əmma rəhü rəsmdir müqərrər,
Bir övrətə eybdir iki ər.
Leyli bu həşəmdə namizəddir,
Əqd ilə müqəyyədi-əbəddir.
Çün hökmün edər bu rəsmi pamal,
Bari onu ğeyrə vermə, sən al!
Gülbərgimizi həvayə vermə!
Namusumuzu fənayə vermə!"
6. Novfəl dedi: - "Ey güzidə əşraf!
Yox məndə xilafi-ədlü insaf!
Mən məhz mürüvvətü vəfayəm,
Gəncineyi-gövhəri-ətayəm!
Bidadü sitəm deyil şüarım,
Ədl içrə tamamdır əyarım.

## BU, NOVFƏLİN İKİNCİ DƏFƏ VURUŞUB QALİB GƏLDİYİDİR VƏ ƏHDİNİ POZUB VƏFA ETMƏDİYİDİR

1. Elə ki, Rum pəhləvanı ox çəkib Şam əhlini əmrə tabe etdi, türk silahı qalib çıxdı, ərəb qoşunu isə məğlub çıxdı, adətcə yenə o iki ordu vuruşmağı qərara aldı.

2. Pəhləvanlar oxa əl atdılar, baş kəsildi, qan töküldü. Can bədən evini tərk etdi. Bunun üçün oxlar deşik açdı. Əql başların bəlasının həddən aşdığını görüb, başqa bir yol seçdi.

3. Oxlar zirehlərə sancıldı - elə bil gül budaqları qönçə bağlamışdı. Qısası, əvvəlki vuruşdan fərqli Novfəl bu dəfə qalib çıxdı. Düşmən itaət hökmünü qəbul etdi, aman istədi.

4. Leylinin atası başını açdı, gözündən qan-yaş tökdü, acizanə dedi ki: "Ey ulu ağam, müdrik və ədalətli şahlar şahı! Əgər bu iztirabın Leyli üçündürsə, cavabında yox demirəm.

5. Ancaq adət belədir ki, bir qadına iki ər ayıbdır. Leyli qəbilədə nişanlıdır və əbədilik qolu nikahla bağlıdır. Əgər hökmün bu qaydanı pozursa, barı o qızı özgəyə vermə, sən al! Gül yarpağımızı bada vermə, namusumuzu fənaya vermə!"

6. Novfəl dedi: "Ey şərəflilərin seçilmişi, mən də ədalət və insafa qarşı deyiləm. Mən ancaq vəfa və vicdanam, gövhər xəzinəsini bağışlayanam, şüarım amansız zülm deyil, ölçülərimin məhək daşı ədalətdir.

7. Men hem xecilem bu maceraden,
Acizlere qıldığım cefaden.
Heqqa bu deyildir e'tiqadım
Kim, hasil edem men öz muradım.
Bir sınmışa mumiya dilerdim,
Bir xeste üçün şefa dilerdim.
8. Gördüm, görünür bu emr müşkil,
Bimar deyil elace qabil.
Bidadden olmuşam peşiman,
Əfv ede meger bu sehvi sübhan.
Gelmez gözüme eyalü malın,
Malın senin olsunü eyalın.
Var, indi sen eymen ol xeterden,
Minbe'd tevehhüm etme şerden".
9. Bunu dedi, açdı aleti-rezm,
Öz memleketine eyledi ezm.
Mecnun deri-e'tiraz edib baz,
Ol servere te'ne etdi ağaz:
10. - "Key bihude qövlünü qerarın!
Əhdinde bumudur e'tibarın?!
Ne faide sikkesiz diremden?
Ne sud neticesiz keremden?
Sayen uludur, veli ne hasil?
Kim, feyz deminde oldu zail".
11. Her nece ki, etdiler müraat,
Kim, "eyleyelim buna mükafat;
Ondan yegin edelim sene yar,
Asan işini gel etme düşvar!"
Mütleq eser etmedi ona pend,
Zenciri-heva qaçan tutar bend.
Əfğan çekib etdi xirqesin çak,
Sehralere düşdü zarü ğemnak.

7. Özüm de bu maceradan, acizlere etdiyim zülmden xecaletliyem. Meqsedim öz muradıma yetmek deyildi. Bir sınmışa derman-mumiya isteyirdim. Bir xesteye sağlamlıq dileyirdim.

8. Gördüm ki, bu teleb çetindir. Xeste elacsızdır. Zülmümden peşman olmuşam. Qoy bu sehvimi o şerefli Allah bağışlasın, mal-dövletin de mene gerek deyil, eyalın da senin olsun. Get, indi o xeterden arxayın ol, bundan sonra şerden qorxma".

9. Bunu dedi, silahını açdı ve öz ölkesine üz tutdu. Mecnun e'tiraz qapısını açaraq, o servere te'ne etmeye başladı.

10. "Ey sözü-soyu boş olan, ehdine vefan budurmu? Sikkesiz dirhemden ne fayda? Neticesiz keremden ne xeyir? Kölgen uludur, amma ne olsun ki, fayda vereceyi vaxtda yox oldu".

11. Çox yalvardılar ki, "gel onun evezinde sene mükafat olsun deye" ondan da yaxşısını yar edek, asan işini çetine salma". Nesihetin ona heç bir te'siri olmadı. Hava zenciri bend tutmaz. Feryad edib paltarını cırıb, o qem esiri ağlayıb-sızlayıb yene sehraya düşdü.

## BU, MƏCNUNUN ZƏNCİRƏ ÖZÜN MÜQƏYYƏD ETDİYİDİR VƏ BƏHANƏ İLƏ LEYLİ TƏRƏFİNƏ GETDİYİDİR

1. Bir gün seher ol mücaviri-deşt,
Eylerdi güruhi-vehşle geşt.
Bir piri-hezin göründü nagah,
Zencirli bir esir hemrah.
2. Mecnunun esire yandı canı,
Ol piri-hezine sordu anı:
Kim: - "Bu ne esirdir, beyan et?
Cürmin meni-mücrime eyan et!"
3. Sirri-dilin etdi pir rövşen
Kim: - "Dustdur, deyil bu düşmen.
Men xestevü besteyi-eyalem,
Feqr ile iyen şikestehalem.
Bu hem meni-zarden beterdir,
Avarevü xarü derbederdir.
4. Bir ruzi üçün olub füsunsaz,
Her dem qılırız füsunlar ağaz.
Ta hasil ola meaşi-etfal,
Bir şö'bededir bu gördüyün hal;
Bu qanlılığa qılıbdır iqrar,
Men eylemişem bunu giriftar.
5. Sahib diyetem menü bu xuni,
Gör vechi-meaş üçün füsuni.
Ta kim, gezib eyleye gedalıq,
Bendine qıla girehgüşalıq;
Her ne qazanır gezende ev-ev,
Teqsim ederiz arada cöv-cöv.
Qismetde hem etmişiz qerarı,
Men yarıyamü bu şexs yarı".
6. Mecnun dedi: - "Sehv edibsen ey pir!
Divanelere gerek bu zencir.
Gel hacetimi menim reva qıl,
Bend eyle meni, bunu reha qıl!
Sayen tek olub seninle hemseyr,
Men ehli-keremden isteyim xeyr.
Her ne yığılırsa biş, ya kem,
Varın sene eyleyim müsellem.

## BU, MƏCNUNUN ÖZÜNÜ ZƏNCİRƏ SALMASIDIR VƏ BU BƏHANƏ İLƏ LEYLİ TƏRƏFİNƏ GETDİYİDİR

1. Bir gün seher o, sehra sakini, vehşiler destesi ile gezirdi, qefleten yanında zencirli bir esir geden qemli bir qoca gördü.

2. Mecnunun esire canı yandı ve o qemli qocadan soruşdu: "Bu esir kimdir, günahı nedir, men günahkara bunun günahının ne olduğunu anlat!

3. Qoca ürek sirrini açdı ve dedi: "Dostumdur, bu menim düşmenim deyil. Men biçare oğul-uşaq yolunda qolu bağlıyam - yoxsulluq tenge getirib. Bunun da derdi menimkinden böyükdür.

4. Bir parça çörek üçün efsunçu olub, avara düşüb, uşaqları doyurmaq üçün her dem bir efsane qoşuruq, mö'cüze gösteririk. Bu gördüyün bir oyundur. Bu qanlılığı qebul edibdir, men de qan bahası sahibiyem.

5. Ehtiyac meni ve bu qanlını qazanca ortaq eleyib. O zencirde ev-ev gezib dilenir. Qazandığımızı misqal-misqal ten yarı bölürük. Qerarımız beledir ki, bölüşerek, yarısını o alar, yarısını men.

6. Mecnun dedi: "Ey pir, sehv edibsen! Zencir divaneler üçün gerekdir. Gel menim dileyimi yerine yetir, meni bağla, onu burax! Kölgen kimi seninle gezib rehmdillerden pay isterem. Her ne yığılsa, azmı-çoxmu - hamısını sene vererem.

7. Qəsdim bu ki, eyləyəm məni-zar,
Evdən-evə seyr Müştərivar,
Şayəd ki, bir evdə ola mümkin
Ol Zöhrəyə olmağım müqarin".
8. Pir oldu ümidi-nəf'ilə şad,
Əvvəlki əsirin etdi azad...
Zəncirə girib rəmidə Məcnun,
Ərbabi-cünunə verdi qanun.

7. İstəyim budur ki, Müştəri ulduzu səmada gəzən tək qapı-qapı gəzib ağlayam. Bəlkə bir evdə o Zöhrəmi görəm".

8. Qoca qazanc ümidi ilə sevindi və əsiri azad etdi. Ürkək Məcnun zəncirə girdi və dəlilərə dəlilik yolunu göstərdi.

## BU, MƏCNUNUN ZƏNCİRƏ ŞƏRHİ-ĞƏMİDİR VƏ BƏYANİ-SİLSİLEYİ-ƏLƏMİDİR

1. Ol silsiləyə olub həmavaz,
Ağlardı ki: - "Ey mənimlə həmraz!
Sən gənci-bəlayə əjdəhasən!
Sərriştəyi-möhnətü bəlasən!
2. Şərhi-ğəmə var min dəhanın,
Tərpəndikcə çıxar fəğanın!
Başdan ayağa dəlik-dəlik tən,
Könlündəki razı etdi rövşən!
Ey müntəziri-nəzareyi-yar!
Nəzzareyi-yarə min gözün var!"
3. Gəzmək həvəsilə xanə-xanə,
Ol pir ilə oldular rəvanə.
Tovfiq olub onlar ilə həmrah,
Leyli həşəmi göründü nagah.
Məcnun rəsəni əlində ol pir,
Ev-ev həşəmi gəzərdi bir-bir.
4. Leyli evinə irişdi növbət,
Ol xəstəyə ğalib oldu heyrət!
Sərgəşteyi-aləm oldu pabəst,
Məyxanə önündə düşdü sərməst.
5. Çün çəkdi bir ixtiyarsız ah,
Leyli ev içində oldu agah;
Bir ah ilə qıldı xeyməsin çak,
Məzlumuna açdı çeşmi-nəmnak,
Gördü ki, görünməz olmuş ol zar,
Olmuş ğəm ilə zəifü bimar,
6. Qaşı kimi qaməti bükülmüş,
Yaşı kimi peykəri tökülmüş,
Cismi ğəm içində can şəbihi,
Dərki nəzəri ğəmi bədihi.
7. Didar ilə ol şəhi-lətafət,
Mehmanına eylədi ziyafət.
Razi-dili-zarın etdi ifşa,
Bu şe'ri-bədihi ğıldı inşa:

## BU, MƏCNUNUN ZƏNCİRƏ QƏMİNİ AÇMASIDIR VƏ ÖZ DƏRDİNİN SİLSİLƏSİNİN BƏYANIDIR

1. O, zəncirin səsinə səs verib ağlardı ki: "Ey mənim sirdaşım! Sən bəla xəzinəsinin əjdahası və zülm bəlasının əsasısan!

2. Qəmini söyləməyə min ağzın var, tərpəndikcə fəryad edirsən! Bədənin başdan-başa dəlik-dəlikdir və könlündəki sirrini açıb göstərir. Ey yarın görüşünün intizarını çəkən, onu görmək üçün min gözün var!"

3. Ev-ev gəzmək üçün qoca ilə yola düşdülər. Bəxtləri gətirdi, qəflətən Leylinin qəbiləsi göründü. Qoca əlində Məcnunun ipi ev-ev gəzdi.

4. Növbə Leyli evinə yetişdi. Heyrət xəstəyə qalib çıxdı. Aləmdə avara gəzənin ayaqları bağlandı. Meyxanə önündə sərxoş kimi yerə sərildi.

5. Özündən xəbərsiz elə bir ah çəkdi ki, ev içində Leyliyə çatdı. Bir ah ilə o da çadırından çıxıb və nəmli gözlərini məzlumuna açdı. Baxdı ki, o yazıq görünməz olub, qəm onu zəif xəstəyə çevirib.

6. Qaməti qaşı kimi bükülmüş, gözlərinin yaşı kimi üst-başı da tökülmüş. Bədəni qəm içində can şəbihinə-ruha bənzəyir, ağlı, baxışı və dərdi sübut istəmir.

7. O zəriflik şahı üzünü göstərməklə mehmanına ziyafət verdi, ağlar ürəyinin sirrini açaraq bədahətən bu şe'ri dedi:

## BU ĞƏZƏL LEYLİ DİLİNDƏNDİR

Yar rəhm etdi məgər naləvü əfğanimizə
Ki, qədəm basdı bu gün külbeyi-əhzanimizə?

Əşk baranı məgər qıldı əsər kim, nagah,
Bitdi bir şaxi-güli-tazə gülüstanimizə?

Bizə ah ateşinin yandığı ondan bilinir
Ki, çirağ eylədi rövşən şəbi-hicranimizə.

Bu vüsalə yuxu əhvali deməк mümkün idi,
Əgər olsaydı yuxu dideyi-giryanimizə.

Bir xəyal ola məgər gördüyümüz, yoxsa nigar,
Mütləqa xatirə gəlməz ki, gələ yanimizə.

Yar mehmanımız oldu, gəlin, ey canü könül,
Qılalım sərf nəmiz var isə mehmanimizə!

Dilbərin canə imiş qəsdi, Füzuli, gəl kim,
Can verib dilbərə, minnət qoyalım canimizə.

## BU QƏZƏL LEYLİNİN DİLİNDƏNDİR

Məgər naləmizə, əfqanımıza yarın rəhmi gəldi ki,
bu gün qəm daxmamıza ayaq basdı?

Göz yaşı yağışı tə'sir etdi ki, gözlənilmədən
gülüstanımızda bir təzə gül şaxı bitdi?

Bizə ah ateşinin yandığı ondan bilinir ki,
bu çıraq hicran gecəmizi işıqlandırdı.

Bu görüşməyi yuxu adlandırmaq olardı,
əgər ağlar gözlərimizə yuxu getmiş olsaydı.

Gördüyümüz bəlkə də bir xəyaldır, yoxsa
nigarımızın yanımıza gələcəyi ağlımıza belə gəlməzdi.

Yar qonağımız oldu, ey can, ey ürək, gəlin,
nəyimiz varsa, hamısını mehmanımıza sərf eləyək!

Dilbərin qəsdi bizim canımız imiş, Füzuli,
gəl ki, can verib dilbərə, canımıza minnət qoyaq.

## BU, MƏCNUNUN LEYLİYƏ MÜQABİL OLUB, ƏHVALNI BİLDİRDƏYİDİR VƏ FÜRSƏTLƏ RAZI-PÜNHANIN ƏYAN ETDİYİDİR

1. Məcnun ki, ona nəzarə qıldı,
Razi-dilin aşikarə qıldı;
Çəkdi fələkə fəğanü ahi,
Sultanının oldu dadxahi:
2. - "Key qədri bülənd padşahım!
Bildir mənə kim, nədir günahım?
Fərmanə müxalifətmi qıldım?
Ə'dayə müvafiqətmi qıldım?
Bədxahlərinmidir bu tədbir?
Ğəmmazlərinmidir bu təzvir?
3. Mən mö'təqidəm bu asitanə,
Ya rəb, nola rəddimə bəhanə?
Kimdəndir ola bu məkrü hiylə?
Kim oldu ola buna vəsilə?
Ta xaki-dərindən olmuşam dur,
Aşiftəvü xəstəhalü rəncur;
4. Gahi çəkərəm şikənceyi-ğəm,
Gahi oluram bəlayə həmdəm.
Tənha keçər oldu ruzigarım,
Səhradə nə munisü nə yarım.
Sən xud gözəlim, ğəmim yeməzsən,
"Ol şiftə qandadır" - deməzsən.
5. Məndən bu təğafülün əcəbdir,
Guya ki, nişaneyi-ğəzəbdir.
Mən böylə neçün zəbunü xarəm,
Ha gəldim, əgər günahkarəm,
Çökdüm yerə gərdənimdə zəncir,
Bismillah, əgər olursa tə'zir,
Fərman səndən, qəbul məndən.
Olma, gözəlim, məlul məndən!
6. Zülfü müjə, xəncərü rəsən bəs,
Hökmünü yerit, həm asü həm kəs!
Gər arada bir ğübar qoyma,
Öldür məni, şərmsar qoyma!
Tə'zirimə eyləsən təəllül,
Lazım məni öldürər təğafül

## BU, MƏCNUNUN LEYLİYLƏ QARŞILAŞIB ƏHVALINI BİLDİRDİYİDİR VƏ BU FÜRSƏTLƏ GİZLİ SİRRİNİ ƏYAN ETDİYİDİR

1. Məcnun elə ki, ona baxdı, ürək sirrini açdı, ahı göyə yüksəldi, sultanından ədalət dilədi:

2. "Ey qüdrəti uca padşahım! Bildir mənə nədir günahım! Fərmanınamı qarşı çıxdım? Düşmənlərləmi bir oldum? Bu tədbir bədxahlarındırmı? Bu araqarışdırma çuğulların, böhtançılarınmıdır?

3. Mən bu astanaya inanmışam, tanrım. Qovulmağımın bəhanəsi nədir? Bu məkr - hiylə kimindir ki, kimin vasitəsilə mən sənin qapının torpağından aralı düşmüşəm, eşq xəstəsi olmuşam.

4. Gah qəm işkəncəsi çəkirəm, gah bəlayla dost oluram. Həyatım tənhalıqda keçir. Səhrada nə munisim, nə yarım var. Sən də gözəlim, mənim qəmimi çəkməzsən, "o vurğun hardadır" deməzsən.

5. Məndən bu xəbərsizliyin qəribədir, elə bil ki, qəzəb nişanəsidir.

Niyə mən belə köməksiz və alçalmışam. Budur, günahım varsa, gəlmişəm, boynu zəncirli diz çökmüşəm. Allah adına, cəzaya layiqəmsə, fərman səndən, qəbul məndən. Gözəlim, məndən məlul olma!

6. Saçlarının hörüyü, kipriklərinin xəncəri bəs edər, hökmünü yerit, as məni! Kəs məni! Arada bir qubar qoyma, öldür məni, başımı aşağı eləmə! Üzrümü bəhanə hesab eyləsən, ləngisən, məni sənin qəflətin öldürər.

7. Ey laləüzarü ənbərinmuy!
Gəncinəcəmalü margeysuy!
Ta zülfünə olmuşam giriftar,
Zənciri-cünunə rəğbətim var.
Ğəm silsiləsinə paybəndəm,
Divanələr içrə sərbüləndəm.
Sevdadə dönüb ziyanə sudim,
Peyvəstə bu şe'rdir sürudim:

7. Ey lalə üzlü, ənbər ətirli! Camalı xəzinə, saçları ilan. Saçlarına bağlanmışamsa, dəli zəncirinə rəğbətim var. Qəm silsiləsilə ayağım bağlanıb. Divanələrin uca başçısıyam. Sevdamda xeyirim ziyana dönüb, daima mahnım bu şe'rdir:

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Küfri-zülfün salalı rəxnələr imanimizə,
Kafər ağlar bizim əhvali-pərişanimizə.

Səni görmək mütəəzzir görünür böylə ki, əşk
Sənə baxdıqda dolar dideyi-giryanimizə.

Cövrü çox eyləmə kim, olmaya nagəh tükənə,
Az edib cövrü cəfalər qılıban canimizə.

Əskik olmaz ğəmimiz bunca ki, bizdən ğəm alıb,
Hər gələn ğəmli gedər, şad gəlib yanimizə.

Var hər həlqeyi-zəncirimizin bir ağzı,
Müttəsil verməyə ifşa ğəmi-pünhanimizə.

Ğəmi-əyyam, Füzuli, bizə bidad etdi,
Gəlmişiz əcz ilə dad etməyə sultanimizə.

## BU QƏZƏL MƏCNUNUN DİLİNDƏNDİR

Zülfünə bağlılığın günahı imanımıza xələl gətirəndən,
hətta kafirlər belə pərişan halımıza ağlayır.
Sənə tamaşa eləməklə biz günah işləmirik,
ona görə ki, sənə baxdıqda ağlar gözümüz yaşla dolur.
Zülmün çox eyləmə ki, birdən qurtarar.
Canımıza cəfa edərkən zülmü az-az elə.

Bunca yanımıza şad gələn bizdən qəm alıb,
qəmli gedir, ancaq qəmimiz heç əksilmir.

Zəncirimizin hər həlqəsinin bir ağzı vardır,
və onlar daimi gizli qəmimizi aşkar edər.

Füzuli, dünya qəmi bizə zülm etdi.
Acizliklə ədalət istəmək üçün sultanımızın
yanına gəlmişik.

## TƏMAMİYİ SÜXƏN

Bir ləhzə qılıb bu rəsmə fəryad,
Sultanına zülmi-eşqdən dad,
Zəncirini etdi parə-parə,
Tutdu yenə xəlqdən kənarə.
Əndamı şikəstə, çeşmi nəmnak,
Rüsvavü xərabü məstü bibak.
Ardınca qoşun-qoşun uşaqlar,
Əhvalına kim gülər, kim ağlar.

## SÖZÜN SONU

Bir an beləcə fəryad ucaldıb sultanına eşq zülmündən dad elədi, zəncirini parçaladı, yenə də xəlqdən kənara qaçdı. Bədəni əzgin, gözləri yaşlı, rüsvay, xərab, sərxoş və qorxudan azad!

Ardınca qoşun-qoşun uşaqlar, kimi halına gülürdü, kimi ağlayırdı.

## BU, MƏCNUNUN KORLUQ BƏHANƏSİLƏ DİLDAR CƏMALIN GÖRDÜYÜDÜR VƏ DİDEYİ-ÜMİDİN TUTİYAYİ-MƏQSUDƏ YETİRDİYİDİR

1. Bir gün dəxi ol bəhanəpərdaz,
Bir özgə bəhanə qıldı ağaz:
Bağladı iki gözün ki, kurəm,
Əhvali-cəhanə bişüurəm.
Ərz eylədi zə'fü binəvalıq,
Ev-ev gəzib eylədi gədalıq.
Təqribilə əzmi-yar qıldı,
Leyli evinə güzar qıldı.

2. Ol dusta zahir eyləyib raz,
"Ya dust!" deyib, yetirdi avaz.
Leyli ki, eşitdi ol sədayi,
Bildi eşiyindəki gədayı,
Evdən çıxıb etdi ərzi-didar,
Qıldı sədəqə zəkati-rüxsar.

3. Pünhan baxıban ol afitabə,
Məcnun yenə gəldi bu xitabə:
- "Key xali-siyahı göz səvadı!
Can arizusu, könül muradı!
Qər bağlı isə gözüm, rəvadır;
Sərçeşmeyi-lücceyi-bəladır,
Bənd eyləməsəm önün dəmadəm,
Seylabə gedər təmam aləm.

4. Göz kim, səni eyləyib nəzarə,
Rüsva qılır əhli-ruzigarə.
Təhqiq edibəm ki, düşməniindir,
Mən qıydım ona, riza səninidir.
Dərgahinə bağladım gətirdim,
Baş üzrə ayağına yetirdim.

5. Ey ğəmzəvü lə'li şəhdü şəmşir!
Xah əfv elə onu, xah tə'zir.
Dərgahinə gəldiyimdə, ey hur!
Sərmayə idi gözümdəki nur.
Öyrətdi mənə ğəmin ticarət,
Yüz şükr ki, qılmadım xəsarət,
Göz nurini xaki-payə verdim,
Az cinsimi çox bəhayə verdim

## BU, MƏCNUNUN KORLUQ BƏHANƏSİLƏ SEVGİLİSİNİN ÜZÜNÜ GÖRDÜYÜDÜR VƏ ÜMİD GÖZÜNÜ MƏQSƏD TUTİYASINA YETDİRDİYİDİR

1. Bir gündə o bəhanə ustası başqa bir bəhanəyə başladı. Gözlərini bağladı ki, koram və dünyadan xəbərim yoxdur. Əlacsızlığından söz açdı, ev-ev gəzib diləndi. Təqribən yol tapıb Leylinin evinə tərəf getdi.

2. Dostuna sirrini açdı: "Ey dost", deyə səsini ucaltdı, Leyli bu səsi eşidib qapısındakını - dilənçini tanıdı. Evdən çıxıb kora üzünü açmaqla pay verdi.

3. Gizlincə o günəşə baxıb Məcnun yenə dilə gəldi: "Ey qara xalı, göz bəbəyi can arzusu, könül muradı! Gözümün bağlılığı təbiidir, çünki o bəla fırtınasının mənşəyidir. Onun qabağını mən daima bağlamasam, tamam aləmi sel basar.

4. O gözlər ki, sənə baxıb, səni zəmanə əhlinə rüsvay edirdi, bildim ki, sənin düşmənindir, qıydım onlara, razılığı səndəndir. Qapına bağlı gətirdim, başım üstündə ayağına yetirdim.

5. Ey qəmzəsi qılınc, dodağı bal? İstərsən onu bağışla, ya da cəza ver. Ey huri! Qapına gələndə əlimdəki sərmayəm gözümün nuri idi. Dərdin mənə ticarət öyrətdi, yüz şükr ki, ziyan çəkmədim, gözümün işığını sənin ayağının torpağına dəyişdim, az malımı çox baha satdım.

6. Şahim, nezer et meni-gedaye!
Biganəlik etme aşinaye!
Can bağına ğəm nihalı tikdin,
Tən mülkünə dərd toxmu əkdin!
Ol toxmü nihale nəf" hasil,
Oldu nemi-əşkü suzişi-dil.
7. Gəl mülkünə, bağına güzər qıl,
Məhsulü menafee nezər qıl".
Bunu deyib ol ğəribü heyran,
Tutdu rəhi-badiyə kəmakan.

6. Şahım, mən dilənçiyə tərəf bax! Dostuna biganə olma! Can bağında qəm ağacı, can mülkünə dərd toxumu əkdim! O toxum ve ağacın məhsulu gözümün yaşı ve ürəyimin yanğısı oldu.

7. Gəl mülkümün bağını gəz, məhsuluna və mənfəətinə tamaşa elə. Bunu deyib o qərib və heyran yenə də səhraların yolunu tutdu.

## BU, İBN SƏLAMIN LEYLİ VƏSLİNƏ RAĞİB OLDUĞUDUR VƏ BU DƏ'VADƏ SÜBHİ-ÜMİDİ KAZİB OLDUĞUDUR

1. Saqi, bizə rahəti-rəvan ver!
Cansızlara himmət eylə, can ver!
Qıl məst bizi meyi-muğandan!
Əvvəl xoşü xürrəm eylə, ondan
Sor kim, necədir səbati-aləm,
Əncami-fərəh, nəhayəti-ğəm.
2. Dünya işi e'tibarsızdır,
Çərxin rəvişi qərarsızdır.
Çox kimsənə gənc üçün çəkər rənc,
Qeyrinə onun nəsib olur gənc.
3. Gör onu ki, hər nihali-sərkeş
Sudəndirü sərf eylər atəş.
Təqdirədir əsl əmri-mənsub,
Xoşdur bu ki, talib ola mətlub.
4. Çün ibn Səlam bildi hali,
Meydani-muradı gördü xali,
Cəm etdi əkabirin diyarın,
Ə'yanını əhli-ruzigarın,
Göndərdi nikah üçün bəsi mal,
Şərt etdiyin etdi cümlə irsal.
5. Min zərrin nə'l əsbi-tazi,
Misrivü iraqiyü Hicazi,
Min cariyəvü ğulami-ziba,
Pirayələri hərirü diba.
Min naqə nəbatü qənd yüklü,
Nəsrin dərili, bənövşə tüklü.
6. Min təblə əbirü ənbərü müşk,
Yüz yük gühəri-tərü zəri-xüşk.
Əsbabi-nikah olub rəvanə,
Kabini kəsildi nəqdi-canə.
7. Leyli bu cəfadan oldu agah,
Kim, buldu baharına xəzan rah.
Ümmidi gözünə doldu topraq,
Məqsudi-nihalı tökdü yarpaq,
Əksi-ğərəz oldu surəti-hal,
İdbarə mübəddəl oldu iqbal,
Gül istər ikən sataşdı xarə,
Nur istər ikən tutuşdu narə.

## BU, İBN SƏLAMIN LEYLİ VƏSLİNƏ CAN ATDIĞIDIR VƏ BU İDDİADA ÜMİD SÜBHÜNÜN YALANÇI OLDUĞUDUR

1. Saqi, bizə rahatlıq ver! Cansızlara rəhmin gəlsin, can ver! Bizi muğlar meyi ilə məst elə! Əvvəlcə şadlandır, sonra dünyanın işindən, fələyin əncamından, qəmin sonundan xəbər al.

2. Dünyanın e'tibarı yox, fələyin çərxi dayanmır. Çox adamlar xəzinə üçün əzab-əziyyət çəkir, xəzinə də başqasına qismət olur.

3. Bil ki, hər bir təzə fidanın ucalması sudan olmasına baxmayaraq, atəş onu yandıra bilər. Əsl əmr taleyindir. Nə xoşbəxtlik olardı hamı arzusuna çatsaydı.

4. ibn Səlam əhvalatdan xəbər tutub, murad meydanını kimsəsiz görüb, elinin ağsaqqallarını, əyanlarını, zəmanə əhlini başına topladı. Nikah üçün şərtə uyğun mal göndərdi.

5. Min qızıl nallı ərəb atı, min misirli, iraqlı, hicazlı gözəl cariyə və qulam ki, geyimləri, ipək və atlas idi. Min nabatla və qəndlə yüklü, nəsrin dərili, bənövşə tüklü dəvə.

6. Min tabaq ətir, ənbər, müşk, yüz yük təzə göhvər və saf qızıl götürüb nikah dəsti yola düzəldi. Onun can nəqdinə kəbini kəsildi.

7. Leyli bu zülmdən xəbər tutunca, baharının payıza döndüyünü duyunca ümidinin gözü torpaqla doldu. Arzusunun ağacı yarpağını tökdü, halı istədiyinin əleyhinə oldu. Bəxti qara gəldi, gül istərkən tikana rast gəldi, işığı axtararkən oda yandı.

8. Əfğan ilə matəm etdi suri,
Matəmkədə məhfili-sürurı.
Məşşatə dilərdi zülfü xalın
Artırmağa ziyb ilə camalın.
Ol ahü sirişk ilə dəmadəm,
Xalı güm edərdi, zülfü bərhəm.

9. Əyməzdi hilali vəsməyə baş,
Gözdən gidərərdi sürməsin yaş.
Geysusi çəkərdi şanədən sər,
Bir bar idi gərdənində gövhər.
Güzguyə kədər verərdi ahi,
Zülmati-xət istəməzdi mahi.

10. Pabusinə bulmayıb hənə dəst,
Etmişdi onu ğəm ilə pabəst.
Iklilə rüxi urardı ateş,
Buyi-xoş ona gəlirdi naxoş.
Tə'nə dikənindən etməyib bak,
Gül kimi qılırdı geydiyin çak.

11. Hər ləhzə qılırdı ahü fəryad,
Derdi ki: - "Əlindən, ey fələk, dad!
Səndən bumidi mənim muradım?
Dövranına bağlı e'tiqadım.
Vəslini təvəqqe etdiyim yar,
Billah, bu deyil, yanılma, zinhar...

12. Ol–neqşi-səhifeyi-vəfadır,
Bu–tərzi-cərideyi-fənadır.
Ol–ğərqeyi-bəhri-zövqi-candır,
Bu–məhvi-tənə'ümi-cahandır.
Ol–xeyr yoluna rəhbərdir,
Bu–başladığı təriqi-şərdir.

13. Cananəsi üçün ol dilər can,
Öz canı üçün dilər bu canan.
Mən onunam, ol mənim əzəldən,
Saxla bu əlaqəyi xələldən.
Ey çərx! Bu əqd olanda möhkəm,
Bəlkə yox idin arada sən həm.

14. Gəl tərki-təğəllübü sitəm qıl!
Tanrını arada gör, kərəm qıl!
Vermə qəviyə zəif malın!
Düşmənlərə dustlar həlalın!
Məcnunumu sanma kimsədən kəm,
Bir mərdi-rəhi-bəladır ol həm.

8. Əfqan və matəm toy qurdu, sevinc məclisi matəmə çevrildi. Bəzəkçi Leylinin gözəlliyini artırmaq üçün üzünə xal düzürdü, o isə gözünün yaşı ilə xalı silirdi, saçlarını isə qarışdırırdı.

9. Qaşı vəsmə üçün baş əymirdi. Gözlərinin yaşı sürməsini yuyurdu. Saçları daraqdan qaçırdı, qızıl boyunbağı boynuna yük idi. Ahı güzgünü dumanlandırırdı, ay üzü qara xətt götürmürdü.

10. Hənə onun ayağını öpməyə imkan tapmırdı, çünki ayaqları dərdlə bağlanmışdı. Üzünün odu əklilini yandırırdı, ətir belə xoşuna gəlmirdi. Tə'nə tikanından qorxmayaraq gül kimi öz geyimini yırtırdı.

11. Hər an ah və fəryad edərək deyirdi: "Dad əlindən, ey fələk, mən səndən bunumu istəmişdim? Axı dövranına inanmışdım? Vəslini istədiyim yar, bu deyil, yanılma... Allah eşqinə, saqın.

12. O vəfa varağının nəqşi idi, bu isə heçlik varağıdır. O can zövqünün dənizinə qərq olmuşdur, bu–dünya ne'mətləri içində batır. O–xeyir yolunun pənbəridir, bu - şər yolunun başlanğıcıdır.

13. O cananı üçün can diləyir, bu isə - öz canı üçün canan diləyir. Mən onunam, o mənimdir əzəldən, bu əlaqəni xələldən saxla. Ey çərx, bu məhəbbət möhkəm bağlananda bəlkə sən heç arada yox idin.

14. Gəl zülmü və tərsinə dolanmağı tərk elə! Tanrını arada gör, kərəm eylə! Zəiflərin malını güclüyə, dostların halalını düşmənə vermə! Məcnunumu heç kəsdən əskik sayma, axı o bəla yolunun mərd yolçusudur.

15. Ey ibn Səlami-bisərəncam!
Bilsən sənə məkr edibdir əyyam;
Məcnuna qoyubdur ad - Leyli,
Eylər səni ad ilə təsəlli.
Sən kami-dil istə, mən bəlayəm,
Sən gənc dilə, mən əjdəhayəm.
Əmma deməzəm işin xətadır,
Nisbət mənə ğayəti-ətadır.
16. Qurtar məni atadan-anadan,
Bir ğəm yeg olur iki bəladan!"
Dərd ilə qılırdı naləvü ah,
Əsbabi-təcəmmülündən ikrah.
Dövrandan edib fəğanü fəryad,
Bu şe'ri oxurdu ol pərizad:

15. Ey biəlac ibn Səlam! Əgər bilsən ki, zəmanə səni necə aldadıb; Məcnunun adını Leyli qoyubdur və bununla da sənə təsəlli veribdir. Sən ürək kamı arzula, mənsə bəlayam; sən xəzinə istə, mən əjdəhayam. Amma işin səhvdir deməräm - mənim üçün bu sənin tərəfindən böyük bir bəxşişdir.

16. Qurtar məni atadan-anadan, bir qəm iki bəladan yaxşı olur! Dərd ilə nalə və ah edirdi, bəzək-düzəkdən qaçırdı. Dövranından fəğan və fəryad edərək o pərizad bu şe'ri oxuyurdu:

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Xilafi-rə'yim ilə, ey fələk, mədar etdin!
Məni gül istər ikən mübtəlayi-xar etdin!

Müruri-ömrdə bir dönmədin muradimlə,
Dönə-dönə mənə zülm etməyi şüar etdin!

ihanətimdə nədir, bilməzəm, muradın kim,
Əzizi-aləm ikən xarü xakisar etdin!

Ümidvar idim əvvəl ki, bir nişat görüm,
Binayi-möhnətimi indi üstüvar etdin!

Cəfa əlilə qılıb çak pərdeyi-səbrim,
Nihan olan ğəmimi xəlqə aşikar etdin!

Vəfadə verməyə can vermədin mənə möhlət,
Məni bu əhd vəfasında şərmsar etdin!

Bir özgəni mənə yar eyləməklə sən guya,
Mənimlə yar olanı özgə ilə yar etdin!

Məgər bilindi, Füzuli, sənə fələk halı
Ki, varını bu cahanın yox e'tibar etdin!

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Ey fələk, rə'yımin tərsinə dövran etdin!
Məni, gül istəyərkən, tikana yetirdin!

Mənim bu ömrüm boyu bir an arzumla hərəkət etmədin.
Dönə-dönə mənə zülm etməyi şüar etdin!
Məni təhqir etməkdə bilmirəm, diləyin nədir
ki, aləmin əzizi olduğum halda məni xar, yerlə-yeksan etdin!
Əvvəllər bir şadlıq tapmaq ümidindəydim,
sənsə dərdimin binasını daha da möhkəm etdin!
Zülmün əlilə səbrimin pərdəsini yırtdın,
gizli dərdimi xalqa aşkar etdin!

Mənə vaxt vermədin ki, vəfada can verim.
Məni bu əhd vəfasında xəcalət etdin!

Bir özgəni mənə yar eləməklə sanki,
mənimlə yar olanı özgəsilə yar etdin!

Füzuli, məgər fələyin bu halını bildin ki,
bu cahanın varını da yox hesab etdin?!

## TƏMAMEYİ-SÜXƏN

1. Ol növ, görənlər iztirabın,
Təzyinü ciladən ictinabın
Eylərlər idi güman ki, ol zar
Bir özgə bəlayədir giriftar.
Qılmışdır ol afitabi müztər,
Hicri-pədərü fərağì-madər.
2. Derlərdi: - "Haqındır, ey səmənbu!
Tutmuşdun atan-anan ilə xu;
Hala ki, bulardan ayrılırsan,
Ğürbət sitəm olduğun bilirsən!
Əfğaninə hiç mən' yoxdur,
Sən kimi yanan fəraqə çoxdur,
Əmma bu imiş çü xəlqə adət,
Sən həm cəzə eyləmə ziyadət.
3. Qız daim ata evində qalmaz,
Peyvəstə anaya mehr salmaz.
Lazım meyi-ğəflət eyləyib nuş,
Eylərsən atan-anan fəramuş".
4. Leyli bu sözə qılırdı iqrar,
Deməzdi bir özgə möhnətim var.
Görməzdi onu özünə layiq
Kim, tə'nə edə ona xəlayiq.
Qız hər necə olsa yarə talib,
Əlbəttə, gərək həyası ğalib.
5. Bir əhli-həya, min əhli-ibram,
İsyan ilə olmaz iş sərəncam.
El tə'nəsi ilə xahü naxah,
Təklifə düşüb bəzəndi ol mah.
Ol ziynətü ziybə ziybü-ziynət
Bir şəkl ilə verdi ziybi-surət
Kim, onu görəndə derdi gərdun:
insaf... kəmali-səbri-Məcnun!
6. Pirayəsiz ol məh idi afət,
Pirayədən artırıb lətafət,
Bir həddə irişdi afitabi
Kim, oldu niqab hüsni tabi.
7. Çün tutdu ərusi-xəlvəti-şam,
Təmkin ilə xəlvətində aram,
Zülmat ziyayə oldu ğalib,
Yandırdı məşailin kəvakib,
Əncüm gühəri olub şəbəfruz,
Qıldı şəbi-tari ğeyrəti-ruz.

## SÖZÜN SONU

1. Leylinin bu iztirabını, bəzək-düzəkdən qaçmasını görənlər elə bilirdilər ki, o ağların başqa bir dərdi var. Bu günəşin kədərlənməsinin səbəbi ata-anasından ayrılmasıdır.

2. Ona deyirdilər: - "Haqlısan, ey yasəmən ətirli, atana-anana öyrənmişdin, indiki onlardan ayrılırsan, qürbətin zülm olduğunu bilirsən! Əfqanına heç e'tiraz yoxdur, sənin kimi ayrılığa yananlar çoxdur. Amma bu işdə xalqın adəti belədir, özünə çox da zülm vermə.

3. Qız ata evində daim qalmaz, həmişəlik meylini anasına salmaz. Qəflət meyi içib onları unutmağın gərəkdir".

4. Leyli bu sözləri dinləyirdi, deməzdi ki, bir özgə dərdim var. Xalqın tə'nəsini özünə layiq görməzdi, qız sevgilisini nə qədər istəsə də və əlbəttə gərək qızın həyası üstün gəlsin.

5. Bir həya əhlinin və ya min abırsızın üsyanı ilə də bu qayda pozulmaz. El tə'nəsini düşünərək, o ay üzlü istər-istəməz bəzəndi. O ziynətin gözəlliyi və gözəlliyin ziynəti özünə elə ziynət vurdu ki, fələk onu görəndə dedi ki, Məcnunun səbrinə, dözümünə yazıq.

6. Elə bəzəksiz də o ayüzlü bəla idi. Onun günəş gözəlliyi bəzəkdən elə bir həddə yetişdi ki, onun gözəlliyinin parıltısı niqab oldu.

7.Axşam xəlvətim gəlini təmkin ilə öz xəlvətgahında rahatlaşdı - zülmət işığa qələbə çaldı. Ulduzlar məş'əlini yandırdı, onların gövhəri gecəni işıqlandırdı, elə işıq oldu ki, gündüz gecəyə həsəd apardı.

8. Gülçöhrə sənəmlər oldular cəm,
Hər bir sənəmin əlində bir şəm;
Rəsmi-tərəb etdilər mürəttəb,
Beş yüz bütü gülrüxü şəkərləb.
Yüz ğönçə dəhənli mahparə
Gül suyu səpərdi rəhgüzarə.
Yüz gülrux əlində məcməri-ud
Eylərdi həvayı ənbəralud.

9. Yüz mahliqa olub ğinasaz,
Qoşmuşdu sədayi-sazə avaz.
Yüz nərgisi-məst gəzdirib cam,
Əhbabə verərdi cami-gülfam.
Yüz gül başı üzrə yüz-təbəq zər
Olmuşdu nisar üçün müqərrər.

10. Bir təxti-rəvan içində Leyli,
Nə şövkətə, nə şükuhə meyli,
Hər ləhzə fəğanü ah edərdi,
Sərgəştəvü müztərib gedərdi.
Əndişeyi-zövqü eyşdən pak,
Seylabdə san gedərdi xaşak.

11. Çün yetdi hərəmsəraye ol mah,
Dağıldı olan rəfiqü həmrah,
Gül xəlvəti oldu səhni-gülzar,
Dur oldu büsatdan xəsü xar.
Bəxt ibn Səlamı etdi agah
Kim: oldu sənə müsəlləm ol mah!

12. Ol talibi-gövhəri-yeganə,
Gövhər həvəsilə girdi kanə.
Nə gördü, niqab içində bir nur,
Gözdən rüxi-dilfüruzi məstur.
Gərm oldu məhəbbətin məzaği,
Tərpəndi vüsalə iştiyaqi.

13. Əl urdu ki, aça ol niqabi,
Rəf eyləyə ortadan hicabi,
Leyli dedi: - "Ey hərifi-qabil!
Sənsən sərü sərvəri-qəbail!
Övsafın eşitmişəm ziyadə,
Kamilsən ədəbdəvü həyadə.

14. Mə'lum edibəm ki, Qaf ta Qaf,
İnsafına el veribdir insaf.
Mən kim, deyiləm ğəni, fəqirəm,
Mehman deməyim, sənə əsirəm!
Zülm eyləmək etmə mən əsirə,
İzhari-tərəhhüm et fəqirə!

8. Gülçöhrə gözəllər toplandılar, hər sənəm bir şam tutdu. Şənlik səhnəsi quruldu. Beş yüz gül-üzlü, şəkər-dodaqlı sənəm yüz qönçə ağız, aypara yola gül suyu səpdi. Yüz gözəl əlində ətirli ud manqalı—buxırdanı havanı ənbər ətri ilə doldurdu.

9. Yüz gözəl nəğməkar olub sazın sədasında oxuyurdu. Yüz məst nərgiz cam gəzdirir, dostlara gül rəngli qədəh paylayırdı. Yüz gülün başında yüz tabaq qızıl şabaş üçün hazır idi.

10. Leylisə kəcavədə taxt içində oturub, nə şövkətə, nə şana meyl etmədən hər dəm ah-fəğan edirdi, başı bəlalı və qəmgin, zövqdən, səfadan uzaq, seldə çör-çöp gedən kimi gedirdi.

11. O ay öz hərəmsarayına çatanda dost-aşinaları başından dağıldı, o gül gülzarda xəlvətə çəkildi, çör-çöpsə məclisdən uzaqlaşdı. Bəxt Ibn Səlama xəbər yetirdi ki, o ay sənin malın oldu.

12. O yeganə gövhərin həvəsində olan bu həvəslə gövhər mə'dəninə girdi, nə gördü - niqab içində bir nur. Ürək açan üzü gözdən gizli. Məhəbbətin zövqü qızışdı, vüsal eşqi coşdu.

13. Əl atdı ki, niqabı üzündən götürüb aradan pərdəni qaldırsın, Leyli dedi: - "Ey qabil rəfiqim! Qəbilələrin sərvəri-başçısı sənsən. Sənin tə'rifini eşitmişəm. Ədəbdə, həyada kamilsən.

14. Bilirəm ki, Qafdan Qafa qədər el insafına ədalətlə qiymət verib. Mən zəngin deyiləm, fəqirəm, sənə qonaq deyiləm, əsirəm! Mən əsirə zülm eləmə, fəqirə mərhəmət göstər.

15. Gör canü tənimdə iztirabım,
Sor hali-dilim, eşit cəvabım!
Mən məktəbə getdiyim zamanlar,
Hifzi-səbəq etdiyim zamanlar,
Bir şəxs mənə göründü nagah,
Oldum pəri olduğundan agah.

16. Cinnilər içində ol pərizad
Ülfət mənim ilə qıldı bünyad.
Hər ləhzə durar mənə bərabər,
Der kim: - "Bəniadəm etmə həmsər!
Yoxsa qılaram dəmində fani,
Bir zərb ilə həm səni, həm ani!"

17. Çox məkr qılındı, oldu tədbir,
Boynumdan alınmadı bu zəncir.
Dəf olmadı bu bəliyyə hərgiz,
Həm ata, həm ana oldu aciz.
Çün bulmadı kimsə çareyi-kar,
Məndən ata-ana oldu bizar.

18. Şeydalığım oldu aləmə faş,
Nifrət qılır oldu yarü yoldaş.
Sən həm ki, bizim diyarə yetdin,
Əlbəttə, bu qissəni eşitdin.
Hala ki, səninlə düşdü bazar,
Oldun düri-əqdimə xiridar;
Qarşımda həm ol pəri durubdur,
Ğeyrət qılıncına əl urubdur.

19. Tərk et ki, bu vəsl bimi-candır,
Həm özünə, həm mənə ziyandır!
Bir neçə zaman təhəmmül eylə,
Dərmanın istə, təvəkkül eylə!
Ola ki, müyəssər ola məqsud,
Səndən açıla bu babi-məsdud.
Qət' ola zəbani-tə'ni-düşmən,
Həm sən yetəsən muradə, həm mən".

20. Ol sadəzəmir ona inandı,
Cinni xəbərin səhih sandı.
Vəhm etdi ki, olsa yarə vasil,
Nöqsan ola canü cahə hasil.
Canane yolunda ömrü cahi,
Ol naqisin oldu səddi-rahi.

21. Bir rəsmi-qədimdir cahanda,
Sud istəyən istəmək ziyan da.
Canan diləyən cəfayə dözmək,
Gənc istəyən əjdəhayə dözmək.

15. Canımdakı, bədənimdəki əzabı gör, ürəyimin halını xəbər al, cavabımı eşit. Mən məktəbə getdiyim, dərs aldığım zamanlar birdən gözümə bir nəfər göründü. Bildim ki, o pəridir.

16. Cinnilər arasında bu pərizad mənimlə ülfət bağladı. Həmişə yanımda durar və mənə deyərdi ki, "İnsan evladına ərə getmə, yoxsa bir zərbəylə bircə anda səni də, onu da məhv edərəm".

17. Nə qədər məkr-hiylə işlətdimsə, bu zəncir boynumdan açılmadı, bu bəla yox olmadı. Ata-anam da aciz qaldı. Heç kəs çarə tapa bilmədiyi üçün atam-anam məndən zara gəldi.

18. Divanəliyim aləmə bəlli oldu, dost-yoldaşım mənə nifrət etdi. Sən bizim yerə gələndə yəqin ki, bu məsələni eşitdin. İndi ki, alverim səninlə oldu, kəbin dürrümə müştəri çıxdın, bil ki, qarşımda o pəri durubdur və qeyrət qılıncına əl atıbdır.

19. Bu vəsldən vaz keç ki, can qorxusudur, həm sənə və həm də mənə ziyandır. Bir neçə vaxt səbr eylə, çarə elə, Allaha sığın. Bəlkə məqsədinə çatasan, bu bağlı qapını açasan. Düşmənin tə'nə dili kəsilə, həm mən, həm də sən murada yetək".

20. O sadəürəkli, qıza inandı, cin söhbətini doğru sandı, qorxdu ki, yarına yetişsə, canına xətər gəlsin, can və cah-cəlal qeydi sevgilisinin yolunda o naqisin qabağını kəsdi.

21. Dünyanın qədim qaydası budur - fayda axtaran, zərərdən qorxmamalıdır. Canan diləyən cəfaya, xəzinə istəyən, əjdahaya dözməlidir.

22. Eşq əhli məhəbbət etsə izhar,
Əvvəl onu imtahan edər yar,
Gər görsə onun cəfayə səbrin,
Kəsrini edər təmam cəbrin.
Gər görməsə cövrə ehtimalın,
Salmaz ona sayeyi-visalın.

23. Çün ibn Səlamə bimi-nöqsan,
Ol vəsldə ruzi etdi hicran,
Meyl etmədi mütləq ol nigarə,
Hərgiz ona qılmadı nəzarə.
Tədbiri-əlacə durdu qaim,
Dərdinə dəva sorardı daim,
Hər qanda görərdi əhli-təsxir,
Divanəsinə dilərdi zəncir.

22. Eşq əhli məhəbbətini açarkən, əvvəlcə sevgilisi onu imtahana çəkər. Görsə ki, onun zülmə səbri var, zülmünü azaldar, yox dözümü görməsə, ona vüsal kölgəsini salmaz.

23. İbn Səlam qorxudan hicrana qatlandı və o nigara qəti meyl etmədi, ona tərəf bir də baxmadı. Həmişə dərdinin əlacı ilə məşğul oldu, dərman axtardı, harda bir fateh, qabil adam görərdi, divanəsinə zəncir dilərdi.

## BU, ZEYD VƏFADARIN MƏCNUNA XƏBƏR GƏTİRDİYİDİR VƏ İBN SƏLAM İLƏ LEYLİNİN PEYVƏNDİ MÜJDƏSİNİ YETİRDİYİDİR

1. Sahibxəbəri-fəsanəpərdaz
Bu tərz ilə qıldı qissə ağaz,
Kim, var idi bir nədimi-nadir,
Zeyd adlı, vəfayi-əhdə qadir.
Məşhur idi fəzlivü kəmali,
Mə'ruf idi hüsnüvü cəmali.
2. Olmuşdu əsir bir nigarə,
Büt ziybli, Zeynəb adlı yarə.
Çəkmişdi məhəbbətin cəfasın,
Görmüşdü məlamətin bəlasın.
Ol aşiqi-müstəməndi-məhzun
Eylərdi həmişə meyli-Məcnun.
Söylərdi ona kəmali-eşqin,
Ustadına göstərərdi məşqin.
3. Leyli ərə getdiyindən ol zar
Təhqiq ilə oldu çün xəbərdar,
Məcnuna özün yetirdi filhal,
Rəngi-rüxi-zərdi əşkdən al,
Dolmuş gözü, peykəri pozulmuş,
Nitqində təkəllümü tutulmuş.
4. Məcnun dedi: - "Ey vəfalı yarım!
Ğəm mərhələsində ğəmküsarım!
Adətcə görünməz ixtilatın,
Hərgünküyə bənzəməz nişatın,
Noldu sənə, söylə, zar olubsan?
Bitaqətü biqərar olubsan?!
5. Əqrəbdə idi bu gün məgər mah,
Ketdin bu yana əziməti-rah?
Qandan bu küdurət oldu hasil?
Noldu səbəbi-məlaləti-dil?"
6. Zeyd ol xəsi-xüşkə urdu ateş,
Suz ilə dedi ki: - "Ey bəlakeş!
Dün əxtəri-bəxtin oldu tirə,
Dövran sitəm etdi sən fəqirə.
Yar ibn Səlamə ruzi oldu,
Ruzi sənə dərdü suzi oldu.

## BU, ZEYD VƏFADARIN MƏCNUNA XƏBƏR GƏTİRDİYİDİR VƏ İBN SƏLAM İLƏ LEYLİNİN PEYVƏND MÜJDƏSİNİ YETİRDİYİDİR

1. Əfsanə qoşan rəvayət sahibi hekayəti belə başladı: Bir nadir dost var idi, vəfalıydı, adı Zeyd idi. Ağlı, kamalı məşhur, hüsnü-camalı dillər əzbəriydi.

2. Zeynəb adlı büt kimi bir gözəlin əsiriydi. Məhəbbətin cəfasını çəkmiş, məzəmmət bəlasını görmüşdü. Bu zavallı və kədərli aşiq həmişə Məcnuna meyl edərdi. Ona sonsuz məhəbbətindən söz açardı - ustadına, məşqini göstərərdi.

3. Leylinin ərə getdiyini o ağlar yəqin edən kimi üzünün rəngi saralmış, göz yaşlarından qana boyanmış, dərhal özünü Məcnuna yetirdi. Gözləri dolmuş, görkəmi pozulmuş, dili tutulmuşdu.

4. Məcnun dedi: "Ey vəfalı dostum! Qəmli çağlarımda qəmküsarım. Söhbətin həmişəki deyil, şadlığın hər günkü kimi deyil. Sənə nə olubdur, söylə, nədən belə ağlarsan? Taqətini, səbrini itirmisən?

5. Bu gün ay Əqrəb bürcündəydimi ki, mənim yanıma gəldin? Bu kədər nədəndir, ürək dərdinin səbəbi nədir?"

6. Elə bil qurumuş çöpə od vuruldu, Zeyd yanaraq dedi: "Ey bəlakeş! Dünən bəxt ulduzun qaraldı, dövran sən yazığa zülm etdi. Yarın ibn Səlamın qisməti oldu, səninsə qismətinə yanıb sızlamaq qaldı.

7. Yar özgəyə oldu şəm'i-məhfil,
Qaldı sənə tabi-ateşi-dil.
Əğyar ilə oldu yar Leyli,
Var indi sən ondan ol təsəlli.
Zaye sənin ol fəğanü ahin,
Suzi-şəbü ahi-sübhgahin".

8. Məcnun ki, xəbərdən oldu agah,
Gərdunə yetirdi şö'leyi-ah.
Vəhşilər içində ol giriftar
Bir dərd ilə qıldı naləvü zar,
Kəfğanə gətirdi marü muri,
Ağlatdı vühuşi, həm tüyuri.

9. Xamə kimi yaş töküb dəmadəm,
Namə kimi qamətin qılıb xəm,
Yazdı alıban əlinə xamə,
Dildarına bir itabnamə.

7. Sevgilin özgə məclisinin şamı oldu, səninsə qismətin ürək oduna dözmək oldu. Leyli başqasına yar oldu. İndi get, bundan təsəlli al. Sənin fəğanın, ahın, gecələrin oduna yanmağın, sübhlərinin fəryadı zay oldu".

8. Məcnun bu xəbəri eşidəndə ahının alovu göylərə ucaldı. Vəhşilər içində bu bədbəxt elə bir nalə çəkdi ki, ilan və qarışqalar, vəhşilər və quşlar ağladılar.

9. Qamış qələm kimi göz yaşı töküb, namə kimi bükülüb, əlinə qələm aldı, dildarına bir danlaq məktubu yazdı:

## BU, MƏCNUNDAN LEYLİYƏ BİR NAMEYİ-İTABAMİZDİR VƏ PEYĞAMİ-ŞİKAYƏTƏNGİZDİR

1. Dibaçeyi-namə nami-mə'bud,
Qəyyumu qədimü heyyü mövcud.
Ol pərdəkəşi-hicabi-əsrar
Kim, aləmi yoxdan eylədi var.
Gün güzgüsün eyləyən mücəlla,
Dün türrəsin eyləyən mütərra.
2. Çün bir neçə həmd toxmun əkdi,
Dərdi-dilini bəyanə çəkdi
Kim, bu mütəhəmmili-bəladən,
Sərgəştəvü zarü mübtəladən,
Bir namə ki, məhz dərdü ğəmdir,
İzhari-şikayətü sitəmdir;
Ol dilbərə kim, vəfası yoxdur,
Bu aşiqinə cəfası çoxdur.
3. Ey əhdə vəfası olmayan yar!
Əğyarıma gül olan, mənə xar!
Noldu sənə nəqzi-əhd qıldın!
Sındırmağa əhdi cəhd qıldın!
Tənhaığımı gətirmədin tab
Kim, eylədin arizuyi-həmxab?
4. Tar oldumu olduğun nişimən
Kim, eylədin onda şəm rövşən?
İncitdimi dərdi-dil mizacın
Kim, oldu təbibə ehtiyacın?
Pəjmürdəmi oldu sərvi-dilcu
Kim, cəhdlə vermək istədin su?
5. Bədxahmı etdi qəsdi-gülzar
Kim, böylə uruldu rəxneyi-xar?
Nə bim ilə hifzi-gövhər etdin
Kim, bəsteyi-əqdi-şövhər etdin?
Mucib nə idi məni unutdun,
Tərkim qılıb özgə yar tutdun?
6. Hər ləhzə olub güvahi-halım,
Xaki-dərinə sirişki-alım,
Mütləq güzər eyləməzmi oldu,
Məndən xəbər eyləməzmi oldu?
Aya, nə idi bu bivəfalıq?
Biganələr ilə aşinalıq?

## BU, MƏCNUNDAN LEYLİYƏ BİR MƏZƏMMƏT MƏKTUBUDUR VƏ ŞİKAYƏTLƏ DOLU SİFARİŞDİR

1. Məktubun girişini ibadət edilən qəyyum, qədim, həmişə var olan, sirlərin pərdəsini açan, aləmi yoxdan var eyləyən, gün güzgüsünü cilalandıran, gecənin zülfünü darayan tanrının adı ilə başladı.

2. Onun önündə bir neçə həmd (şükr) duasını oxuduqdan sonra öz ürək dərdini belə bəyan elədi: "Bəla yükünü daşıyan, didərgin ağlar əsirdən bu bir dərd və qəm məktubudur və zülm şikayətini söyləyən bir namədir o dilbərə ki, vəfası yoxdur və öz aşiqinə cəfası çoxdur".

3. "Ey əhdə vəfası olmayan yar! Düşmənimə gül, mənə tikan olan! Sənə nə oldu ki, əhdimizi pozdun, qırmaq istədin! Təkliyəmi dözmədin və özünə həmyastıq aradın?

4. Sənə otağın qaranlıqmı gəldi ki, orada bir şam yandırdın? Ürəyinin dərdi səni incitdimi ki, həkimə ehtiyac duydun? Sənin ürəyini açan sərv solurdumu ki, sən ona su verməyə çalışdın?

5. Bədxah sənin gülzarının qəsdinə durdumu ki, sənə tikanla belə ziyan vuruldu? Hansı qorxu ilə öz gövhərini qorumaq üçün onu ər sapına düzdün? Səbəb nə idi ki, məni unutdun, məni tərk eləyib başqa yar tutdun.

6. Hər an mənim halımın şahidi qapının torpağına tökdüyüm qanlı göz yaşları olubdur. Qəti buralara gəlməzmi oldun, məndən xəbər almazmı oldun? Axı nə idi bu bivəfalıq, biganələr ilə aşinalıq?

7. Çəkdin yeni yarını kənarə,
Rüxsətmidir indi əski yarə?
Məndən idi möhnətü məlalın,
Xoş oldu ola onunla halın?
Mən əhdü vəfayə aldanırdım,
Əhdində vəfa ola sanırdım.

8. Bilməzdim ola zəif rayin,
Nöqsani ola təmam ayın,
Göftarın ola mənimlə daim,
Könlün ola özgə ilə qaim,
Zahirdə mənimlə olasan yar,
Batində tutasan özgə dildar,
Səndən mən olam cahanda bədnam,
Bir namü nişanı yox, ala kam.

9. Mə'zursən, ey nigar, mə'zur!
Bu dövr ilədir zəmanə məşhur:
Gül ğönçəliyində xar iləndir,
Açılsa bir özgə yar iləndir.
Əslində tikan çəkər əzabın,
Fəslində həkim alır gülabın.

10. Ey arizuyi-dili-fikarım!
Qəhri çoxü mehri az nigarım!
Ey adı olan vəfadə məzkur!
Cismimdəki can, gözümdəki nur!
Sevdayi-dimağımın əlacı!
Bazari-cünunumun rəvacı!

11. Sən mehri-cəmalü məhcəbinsən,
Ğayətdə lətifü nazəninsən.
Mən xar mizacü xak xuyəm,
Bəs tünd zəban, tirə ruyəm,
Sən hali-dil ilə eyləyib ar,
Dersən ki: "Sənə nə nisbətim var?"

12. Mən həm sənə söylədim müvafiq
Kim, mən sənə, sən mənə nə layiq?
Mən xud olubam xəyalə qane,
Sən layiqin istəsən, nə mane?
Əmma mənü səndən özgə çoxdur
Kim, sözləri bizdən özgə yoxdur.

13. Gördükdə mən eyləyən vəfayı,
Bildikdə sən eyləyən cəfayı,
Aya, kimə bivəfa deyərlər?
Kimin işini xəta deyərlər?
Yaxşımıdır eyləmək yaman ad
Kim, qılmaya kimsə xeyr ilə yad?

7. Yeni yarını bağrına basdın, indi köhnə yara da icazə verilirmi? Sənin dərdini-qəmini mən çəkdim, sənsə onunlamı xoş oldun? Mən əhd və vəfaya aldanırdımsa, elə bilirdim ki, əhdinə vəfa edəcəksən.

8. Amma bilmirdim ki, fikrin zəifdir və bütöv ay yarımçıq ola bilərmiş: Söz-söhbətin daima mənimlə ola, könlün isə başqası ilə bağlana, zahirdə mənə yar olasan, batində özgə dildar tutasan. Mən sənə görə dünyada bədnam olum, adı-nişanı olmayan bir kəs isə səndən kam alsın!

9. Üzürlüsən! Ey nigar, üzürlü! Zəmanə belə dövran etməsilə məşhurdur, gül qönçəliyində tikanladır, açılanda özgə yar ilədir. Əslində əzabını tikan çəkir, fəslində gülabını həkim alır.

10. Ey xəstə ürəyimin diləyi! Zülmü çox, məhəbbəti az nigarım! Ey adı vəfada tanınmış! Cismimdəki can, gözümdəki nur! Ruhumun sevdasının əlacı! Dəlilik bazarımın asan satılan malı!

11. Sən qünəş camallı, gözəl ay alınlısan, çox lətif və nazəninsən. Mən tikan təbiətli, torpaq xasiyyətliyəm. Acıdilli, üzüqarayam. Sən ürəyimin halı ilə utanıb deyirsən ki, "sənlik nə işim var ki?

12. Mən də sənə bunun qarşısında dedim ki, sən mənə, mən sənə nə layiq? Mən xəyala da qaneyəm, sən özünə layiqini istəsən, nə manə? Ancaq səndən, məndən özgə çoxları var ki, bizdən başqa sözləri yoxdur.

13. Mənim vəfamı gördükcə, sənin cəfanı bildikdə, kimə vəfasız deyərlər? Kimin işini səhv sayarlar? Pis ad çıxarmaq, bir kəs tərəfindən yaxşı adla anılmamaq yaxşıdırmı?

14. Sən gərçi tutub xilafi-adət,
Bir özgəyə bağladın iradət,
Çoxdur sənə mən kimi cigərxun,
Hər kimə ki, baxdın, oldu məcnun.
Mən kim, kəsəyin derəm səlami,
Səndən çəkəyin bu intiqami,
Tutmaq dilərəm sənin kimi yar,
Əmma əcəb, ər sənin kimi var?!

14. Sən adətin əksinə olaraq bir özgəsinə bağlandın. Sənin mən kimi ciyəri qanlıların çoxdur, kimə baxıbsan - Məcnun olub. Mən səninlə salamı kəsib, intiqam alım, deyirəm; sənin kimi bir yar tapmaq dilərdim. Amma qəribədir ki, sənin kimisi məgər varmı?!

15. Peyvəndini ğeyr ilə eşitdim,
Billah ki, bəsi təəccüb etdim.
Ey çeşmeyi-abi-zindəgani!
Sən canım içindəsən nihani!
Bir ləhzə gözümdən olmadın dur,
Vəslin necə oldu ğeyrə məqdur?

15. Başqasına calandığını eşitdim, billah, çox təəccüb etdim. Ey dirilik suyunun çeşməsi! Sən canımın içində gizlənibsən! Bircə anlığa gözümdən iraq olmadığın halda bəs sən necə başqasının əlinə keçdin.

16. Gər Ibn Sələmə nuri-Leyli
Bir vəch ilə eyləmiş təcəlli;
Leylidən olan xəyalı görmüş,
Öz vahiməsilə eyş sürmüş.
Leyli deməsin mənə qərindir
Kim, ona xəyali həmnişindir.

16. Əgər ibn Səlamın gözünə Leylinin nuru bir yolla görünübsə, o, Leylinin xəyalını görüb, keyfi öz xəyalı ilə sürüb. Deməsin ki, Leyli mənə bağlıdır. Ona həmnişin Leylinin xəyalıdır.

17. Məcnundan edərmi ol cüdalıq
Kim, ğeyr ilə edə aşinalıq?
Ey gövhəri-tac, taci-tarək!
Məqsuduna yetdiyin mübarək!
Əshab yığıb, tərəb qılıb şad,
Bu xeyr işi eyləyəndə bünyad,
Çox zövq ilə çəkdim intizari
Kim, yad edəsən məni-figari.

17. Leyli heç Məcnundan ayrılırmı ki, özgəsilə ünsiyyət bağlasın. Ey başların tacı, tacların gövhəri! Məqsədinə yetməyin mübarək! Həmsöhbətlərin yığılıb sevinəndə, güləndə, bu xeyr işi quranda çox zövq ilə intizar çəkdim ki, bəlkə mən yazığı da yada salasan.

18. Sən xud demədin ki, bir qulum var,
Boynunda təriq ilə yolum var.
Gər sandın isə ki, bərhüzurəm,
Şayəsteyi-sərvəti-sürurəm,
Şərt idi mənə həm etmək e'lam,
Ta mən həm alam bu bəzmdən kam.

18. Sən heç demədin ki, bir qulum var, boynunda mənim zəncirim.. Əgər sandınsa ki, o məclisə mən layiq deyiləm, bu şadlıq səadəti mənə yaraşmır, yenə də mənə xəbər etmək lazım idi ki, mən də bu məclisdən kam alam.

19. Lillahilhəmd əlim deyil dar,
Can kimi nüqudə qüdrətim var.
Vər sandın isə ki, natəvanəm,
Azürdeyi-möhnəti-cəhanəm,
Həm şərt idi üzr qılmaq irsal,
Etmək məni bir söz ilə xoşhal.
Nə böylə edib, nə öylə, ey gül!
Yaxşımıdır eyləmək təğafül

19. Allaha and içirəm, xəsis deyiləm, əlimdə canım kimi nəqdə gücüm çatır. Əgər sandınsa ki, gücsüzəm, zəifəm, dünya dərdindən inciyəm, heç olmasa üzr istəməliydin, bircə sözlə könlümü almaq üçün. Nə belə, nə də elə etdin, ey gül! Qayğısızlığınmı yaxşıdır?

20. Ey canım içində canə düşmən!
Hər necə ki, düşmənəm sənə mən,
Ayini-qədimini unutma!
Min yar tut, özgə xuy tutma!
Ğeyr ilə olanda şadü xürrəm,
Təqribilə yad qıl bizi həm,
Nəqş et bu mürəbbe'i həriré,
Gər onu, bizi gətir zəmirə:

20.Ey can içində canıma düşmən! Necə ki, düşmənəm sənə mən. Köhnə adətini unutma! Min yarın olsun, amma öz təbiətini unutma! Başqası ilə şad olub sevinəndə bir az da bizi yada sal. Bu mürəbbeni ipəyin üstünə yaz, ona bax, ürəyində bizi gör.

## MÜRƏBBE

Ğeyr ilə hər dəm nədir seyri-gülüstan etdiyin?
Bəzm edib, xəlvət qılıb, yüz lütfü ehsan etdiyin?
Əhd bünyadın mürüvvətdirmi viran etdiyin?
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Ləhzə-ləhzə müddəilər pəndini guş eylədin,
Qanə-qanə ğeyr cami-şövqünü nuş eylədin,
Varə-varə əhdü peymani fəramuş eylədin,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Ğeyrə salıb mehrini bizdən sovutdun aqibət,
Tərki-mehr etdin, təriqi-zülm tutdun aqibət,
Əhdlər, peymanlar etmişdik, unutdun aqibət,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Cürmümüz noldu ki, bizdən eylədin bizarlıq?
Biz ğəmin çəkdik, sən etdin özgəyə ğəmxarlıq?
Sizdə adət bumudur? Böylə olurmu yarlıq?
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Çərx tək bədmehrlik rəsmini bünyad eylədin,
Yaxşı adın var ikən, döndün yaman ad eylədin,
Dönə-dönə bizi ğəmnak, özgəni şad eylədin,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Könlümüz minbə'd zülfünçün pərişan olmasın,
Bağrımız lə'lin həvasilə dəxi qan olmasın,
Bivəfasən! Çeşmimiz yadinlə giryan olmasın,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

Və'deyi-vəsl ilə aldın səbrimiz, aramımız,
Olmadı bir gün vüsalından müyəssər kamımız.
Keçdi hicr ilə, Füzulidən betər əyyamımız,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdiyin?!

## MÜRƏBBE

Nədir hərdəm özgələrlə gülüstanda seyr etdiyin?
Məclis qurub, xəlvət tapıb yüz lütf ehsan etdiyin?
Əhdimizin binasını insafmı viran etdiyin?
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Dönə-dönə düşmənlərin nəsihətini eşitdin,
Qana-qana başqasının bir şövq camını içdin,
Get-gedə əhd-peymanımızı unutdun,
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Məhəbbətini başqasına bağlayıb bizdən ötdün aqibət,
Mehri tərk etdin, zülmün yolunu tutdun aqibət,
Əhdlər etmişdik, andlar içmişdik, unutdun aqibət,
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Təqsirimiz nə oldu ki, bizdən eylədin bizarlıq?
Qəminizi biz çəkdik, sən özgəyə etdin qəmxarlıq?
Sizdə adət budurmu, beləmi olur yarlıq?
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Fələk kimi sevgisizlik adətinin təməlini qoydun,
Yaxşı adın var ikən döndün yaman ad elədin,
Dönə-dönə bizi qəmnak, özgəni şad elədin,
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Könlümüz bir daha saçların üçün pərişan olmasın,
Bağrımız lə'lin havası ilə daha qan olmasın,
Bivəfasan, gözümüz yada salmaqla ağlar olmasın,
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

Vüsal və'dəsilə səbrimizi, aramımızı aldın,
Görüşündən bircə gün də kam ala bilmədik,
Keçdi, Füzulidən betər, hicran ilə günlərimiz
Hanı, ey zalım bizimlə əhd-peyman etdiyin?

## TƏMAMİYİ-SÜXƏN

1. Payana çü yetdi sə'yi-xamə,
Təslim olundu Zeydə namə.
Məktubla Zeyd olub səbükpər,
Əzm eylədi öylə kim kəbutər.
2. Çün yetdi nigar olan diyarə,
Məkr ilə vüsalə qıldı çarə,
Əfsun ilə urdu sehrdən dəm,
Ta İbn Səlamə oldu həmdəm,
Leylinin eşitdi vəsfi-halin,
Keyfiyyəti-möhnətü məlalin;
3. Dedi: - "Bilirəm nədir dəvası,
Üş yazılı məndədir duası".
Bağlandı onun sözünə ixlas,
Xəlvətgəhi-qürbə qıldılar xas.
Çün Leyliyə Zeyd oldu vasil,
Məqsudini etdi bəxt hasil.
4. Bir dəm oturub gəlib qiyamə,
Əl urdu rəvan çıxardı namə.
"Tə'viz dedi və qıldı tə'zim,
Əvvəl öpüb ondan etdi təslim.
Çün naməni aldı Leyliyi-zar,
Ol namədən aldı buyi-dildar.
5. Bildi ki, bir özgə qeyddir bu,
Nə nüsxəyi-Əmrü Zeyddir bu.
Çün naməyə qıldı bir nəzarə,
Can kisvətin etdi parə-parə.
Ol feyzi bilib özünə iqbal,
Göz mərdümünə buyurdu filhal.
Kim, dürr ala bəhri-çeşmi-tərdən,
Lə'l ala xəzaneyi-cigərdən.
Ol naməni eyləyə nisarın,
Əfzun edə qədrü e'tibarın.
6. Çün dürcdən aldı dürri-məknun,
Məktubu oxudu, bildi məzmun.
Fəhm etdi məaniyü ibarət,
Bildi nəyədir olan işarət.
Canına qılıb itab tə'sir,
Ol namə cavabın etdi təhrir.

## SÖZÜN SONU

1. Addım-addım qələmin sə'yi bitəndə, namə Zeydə təslim olundu. Zeyd göyərçin kimi iti qanad çaldı uçdu.

2. Elə ki, nigar olan diyara yetdi, hiyləylə görüşmək üçün çarə axtardı. Sehrbazlıqdan, əfsundan söz açıb ibn Səlamla dost oldu. Leylinin halının təsvirindən dərdindən-qəmindən xəbər tutdu, dedi:

3. "Dərmanını bilirəm, budur yazılı duası məndədir". Sözünə inandılar, Leylini xəlvətgahına apardılar. Bəxti onu məqsədinə yetirərək Zeydə Leyli ilə görüşməyi qismət elədi.

4. O bir an oturdu, sonra ayağa qalxıb əlini atıb dərhal naməni çıxartdı. "Təviz" deyib baş əydi, məktubu öpüb ağlar Leyliyə verdi. Ağlar Leyli naməni götürdü və ondan dildarının iyini aldı.

5. Bildi ki, bir özgə yazıdır, bu Əmrü Zeydin yazdığı deyil. Məktuba baxan kimi can geyimini parça-parça elədi. Bu xeyirxahlığı özünə bəxt bilib göz bəbəyinə buyurdu ki, gözünün yaşından dürr ala, ciyərinin xəzinəsindən lə'l götürə. Məktubun əvəzini verərək beləcə qat-qat, qədr-qiymətini artıra.

6. Dürcdən (Zeyddən) qiymətli dürrü aldı, məktubu oxudu, məzmununu bildi, hər işarəni, hər mə'nanı anladı. Töhmət canına yaman dəydi, məktuba bu cavabı yazdı.

## BU, LEYLİNİN MƏCNUNA PEYĞAMI CAVABIDIR VƏ ÜZRÜ İTABIDIR

1. Bu tərz ilə kilki oldu cari
Kim, əvvəli-namə; nami-bari,
Me'mari-binayi-əqdü peyvənd,
Vəhhabi-ətayi-malü fərzənd.
İzhari-vücud edən edəmdən,
İcadi-hüdus edən qidəmdən,
Məşşateyi-şahidi-zəmanə,
Sultani-bülənd-asitanə.
2. Bu namə ki, bir figardəndir,
Yə'ni məni-biqərardəndir.
Bir sahibi-izzü e'tibarə,
Yə'ni Məcnuni-dilfigarə.
3. Ey xakbüsatü xarbəstər!
Kami-dili-təngü dideyi-tər!
Hər tə'nə ki, eyləsən rəvadır,
Səndən xəciləm, üzüm qaradır.
Bəsdir mənə çəkdiyim xəcalət,
Şərməndəliyimdəki məlamət.
4. Çün mö'tərifəm ki, var günahim,
Öz lütfünü eylə üzrxahim.
Mən gövhərəm, özgələr xiridar,
Məndə deyil ixtiyari-bazar.
Dövran ki, məni məzadə saldı,
Bilmən kim idi satan, kim aldı?
5. Olsaydı mənim bir ixtiyarım,
Olmaz idi səndən özgə yarım!
Gər töhmətə olmuşam giriftar,
İkrah ilə məndən olma bizar.
Bir dür deyiləm ki, ola həkkak,
Aldıqda təsərrüfündə çalak.
6. Gər ibni SƏlamə dilfüruzəm,
Şəm'i-şəbü afitabi-ruzəm,
Qanedir irağdan ala bir nur,
Mən ondanü məndən ol ola dur.
Dur olsa görər füruğü tabım,
Olduqda yaxın, çəkər əzabım.

## BU, LEYLİNİN MƏCNUNA NAMƏSİNİN CAVABIDIR VƏ MƏZƏMMƏT ÜÇÜN ÜZR İSTƏMƏSİDİR

1. Onun qələmi məktubun əvvəlini belə başladı: Allahın, mahiyyət düyünlərinin binasının me'marı, mal-dövlət və övlad bağışlayan, heçlikdən varlıq yaradan, indiliyi qədimdən törədən, zəmanə gözəlinin saçını darayan, sarayının astanası uca olan sultanın adı ilə.

2. Bu məktub bir yaralıdandı, yə'ni mən biqərardandır. Bir şərəf və e'tibar sahibi - yə'ni ürəyi yaralı Məcnunadır.

3. Ey xalçası torpaq, yatağı tikan! Ürək kamı daralmış, gözü nəmli! Bütün tə'nələrin rəvadır. Səndən xəcalətliyəm, üzüm qaradır. Çəkdiyim xəcalət və utanmağımın zülmü mənə bəsdir.

4. Boynuma alıram, günahım var, lütf elə, üzürxahlığımı qəbul elə. Mən gövhərəm, özgələri alıcı. Bazarımın ixtiyarı məndə deyil. Dövran məni alqı-satqı malına döndərdi, bilmədim satan kim, alan kim oldu.

5. İxtiyar mənim olsaydı, səndən başqa yarım olmazdı! Əgər töhmətə düşmüşəmsə, gəl məndən ikrahla bizar olma. Elə bir dürr deyiləm ki, məni alan sərraf öz işində cəld ola bilsin.

6. Əgər mən ibn Səlamın gecəsinə şam, gündüzünə günəşəmsə, o məndən uzaqdan da işıq almağa, mən ondan, o məndən uzaq olmağa qanedir. Aralı olanda işığımı, nurumu görər, yaxın olarsa, əzabımı çəkər.

7. Fikr etmə ki,-mən nişatməndəm,
Bir dami-ğəm içrə paybəndəm.
Nə zəhreyi-seyri-kuçəvü kuy,
Nə tabi-təpançeyi-sərü ruy.
Gahi həvəs eyləsəm fəğanə,
Əvvəl ona istərəm bəhanə.

8. Ya atavü ana eylərəm yad,
Ya söhbəti-həmnişinü həmzad.
Gər rəxtimi etmək istəsəm çak,
Xəyyatına oluram ğəzəbnak.
Kim, eyblidir bu damənü ceyb,
Cəhd eylə ki, zahir olmaya eyb.

9. Gahi tələb eyləsəm vüsalın,
Bilmək diləsəm ki, noldu halın,
Bir çeşmə yana olub rəvanə,
Ğüsli-bədən eylərəm bəhanə,
Tənha oluram orada üryan,
Muyi-sərim eylərəm pərişan.

10. Ayinədə eylərəm nigahi,
Halın görürəm sənin kəmahi.
Boynumda yox özgə tövqdən bar,
Lə'limdə bulunmaz özgə göftar.
Boynum qolunu dilər həvadən,
Lə'lim ləbini sorar səbadən.

11. Candan ğəmin içrə naümidəm,
Şəmşiri-cəfa ilə şəhidəm.
Qanlı kəfənimdir al pərdə,
Mən gurdəyəm, sağınma ərdə.
Gəl şəm'i-məzarım eylə ahin,
Ziybi-ləhəd et ğübari-rahin.

12. Mən bülbüli-bağı-firqətəm zar,
Əmma qəfəs içrəyəm giriftar.
Bilməm bu qəfəsdə nola halim,
Sındırdı bəla pər ilə balim.
Bir vəhşi ilə gər etmişəm xu,
Müstəvcibi-sərzəniş deyil bu,
Vəhşilər imiş səninlə həmdəm,
Həmrəng olubam səninlə mən həm.

13. Ey aşiqi-müstəməndü məhcur,
Tutğıl məni-müstəməndi mə'zur!
Səbr et neçə gün, ola ki, gərdün,
Bu günləri eyləyə digərgun.
Ancaq özünü nizar sanma!
Sərgəşteyi-ruzigar sanma!
Bu şe'ri gər oxusan dəmadəm,
Mə'lumun olur mənim ğəmim həm:

7. Fikr etmə ki, mən şadam. Bir qəm torunda ayağım bağlıdır. Nə küçəyə-bacaya çıxa bilirəm, nə üzümə-başıma döyə bilirəm. Ağlamaq istəyəndə də əvvəlcə bəhanə axtarıram.

8. Ya ata-anamı, ya qohumları, dost-yoldaşların söhbətini yad eləyirəm. Yaxamı açmaq istəyəndə dərzimə hirslənirəm ki, ətəyi və qolları düz deyil, çalışmalıdır ki, eybi olmasın.

9. Bə'zən vüsalın könlümə düşürsə, halının necə olduğunu bilmək istəyirəmsə, yuyunmaq bəhanəsilə bir çeşmə tapıb ora düzəlirəm, təkcə orada çılpaq olub saçlarımı dağıdıram.

10. Səninlə güzgüdə qovuşuram, səni olduğun kimi görürəm. Boynumda özgə gərdənlik yoxdur, dodağımda başqa sözüm yoxdur. Boynum havadan qollarını diləyir, ləbim sənin ləbinin sorağını səba yelindən xəbər alır.

11. Sənin qəmin içində candan ümidsizəm. Cəfa qılıncına doğranmışam. Al pərdə qanlı kəfənimdir, zənn etmə ki, ərdəyəm, mən gordayam. Gəl ahın məzarımın şamı olsun. Ayağının torpağı məzarımın zinyəti olsun.

12. Mən ayrılıq bağının ağlar bülbülüyəm, amma qəfəsdə əsirəm. Burada halım nə olacaq bilmirəm, bəla qolumu-qanadımı sındırıb. Mən əgər tək bir vəhşi ilə yaxınamsa, bu danlaq səbəbi olmamalıdır, axı sənin bütün həmdəmin vəhşilərdir və burada da biz səninlə həmrəngik.

13. Ey biçarə kimsəsiz aşiq! Mən biçarəni bağışla! Səbr eylə, bir vaxt bəlkə fələk bu günlərimizi dəyişər. Təkcə özünü zəif, dünyanın başı bəlalısı sanma! Əgər bu şe'ri dönə-dönə oxusan, mənim də qəmimdən xəbər tutarsan.

## BU MÜRƏBBE LEYLİ DİLİNDƏNDİR

Giriban oldu rüsvalıq əlilə çak damən həm,
Mənə rüsvalığımda dustlar tə'n etdi, düşmən həm.
Rəhi-eşq içrə can qıldım giriftari-bəla, tən həm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Əgər tutsan ğəmim eldən nihan, səbrü qərarim yox,
Və gər şərhi-ğəmi pünhanım etsəm, ğəmgüsarım yox,
Əsiri-bəndi-zindanəm, əlimdə ixtiyarim yox,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Olubdur əşki-xunab ilə gülgun-çöhreyi-zərdim,
Yanıbdır atəşi-hicranə cani-dərdpərvərdim,
Cəfayi-çərxi-kəcrəftar əlindən var min dərdim,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Gəhi-şövqi-visalü gəh bəlayi-hicr ilə zarəm,
Özüm həm bilməzəm dərdim nədir, mən necə bimarəm,
Ğəmi-eşq içrə bir dərmanı yox dərdə giriftarəm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Cüda səndən bəlavü dərdi-hicran ilə tutdum xu,
Qılır hər dəm mənə bidad dərd ayru, bəla ayru,
Bəlavü dərdə düşdüm ruzigarım böylə, halım bu,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Təbibi-eşqə çün izhar qıldım dərdi-pünhani,
Məni-bimarə mütləq olmadı bir səhhət imkani,
Əzəldən var min dərdim ki, yoxdur hiç dərmani,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Füzuli, hər zaman bir tə'n ilə bağrım qılırsan qan!
Əcəb bilməzmisən kim, eşqdən keçmək deyil asan?
Bilirsən düşmüşəm bir dərdə kim, yoxdur ona dərman,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

## BU MÜRƏBBE LEYLİ DİLİNDİNDİR

Rüsvalığın əlilə yaxam da, ətəyim də yırtıldı
Mənə rüsvalığımda dostlar da, düşmənlər də tə'nə etdi,
Eşq yolunda canımı da tənimi də bəlaya saldım,
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Əgər qəmimi eldən gizli tutsam, səbrim, qərarım yox,
Yox əgər gizli qəmimi açsam, dərd bilənim yox,
Zindanda bağlı əsirəm, əlimdə ixtiyarım yox,
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Saralmış üzüm qanlı göz yaşımdan gül rəngli olub,
Dərdlə dolu canım ayrılıq oduna yanıb,
Kəcrəftar çərxin zülmü əlindən min dərdim vardır
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Gah vüsal əşqi ilə, gah ayrılıq bəlası ilə ağlayıram,
Özüm də bilmirəm dərdim nədir, mən necə xəstəyəm,
Eşq dərdi içində bir dərmanı yox dərdə düşmüşəm,
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Səndən ayrı ayrılıq dərdinin bəlasına alışdım,
Hər an mənə dərd ayrıca və bəla ayrıca zülm verir,
Bəlaya, dərdə düşmüşəm, ruzgarım belə, halım bu,
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Eşq təbibinə gizli dərdimi dedimsə də,
Mən xəstənin qətiyyən sağalmaq imkanı olmadı,
Əzəldən min dərdim vardır ki, heç yoxdur dərmanı,
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

Füzuli, hər zaman bir tə'nə ilə bağrımı qan eyləyirsən,
Əcaba,eşqdən keçməyin asan olmadığını bilməyirsənmi?
Bilirsən, elə bir dərdə düşmüşəm ki, dərmanı yoxdur
Bu yetməzmi ki, sən də dərdimə bir dərd artırırsan.

## TƏMAMİYİ -SÜXƏN

1. Yazıldı çü naməyə ğəmi-dil,
Zeydə dedi: - "Ey həkimi-kamil!
Tə'vizin ilə xoş oldu halim,
Zail oluban ğəmü məlalim.
Xəttin mənə nüsxeyi-səfadır,
Tə'vizin əsər qılır, duadır.

2. Hər gün gəlü yaz böylə tə'vid,
Ta səhhətə tutmaq ola ümmid,
Bir yazılı nüsxə var məndə,
Billah, belə al onu gedəndə,
Gərçi bilirəm onu ki, xətdir,
Bilmən ki, səhih, ya ğələtdir.
İğlaqinə ver kəmali-izah,
Gər var isə səhvi, eylə islah!

3. Təqrib ilə verdi Zeydə məktub,
Böylə gərək əhli-əqlə üslub.
Məcnunə çü namə oldu vasil,
Dür gördü əqiqinə müqabil.
Məfhumdən etdi kəsbi-məqsud,
Leyli tərəfindən oldu xoşnud.

## SÖZÜN SONU

1. Bu naməyə ürək qəmini yazdı və Zeydə dedi: "Ey kamil həkim! Duan halımı yaxşılaşdırdı, qəmim, dərdim yox oldu. Yazdığın mənə şəfa nüsxəsidir, duan tə'sirli duadır.

2. Hər gün gəl belə dua yaz, bəlkə sağalmağıma ümid ola. Məndə yazılı bir nüsxə var, Allah adına, gedəndə onu da apar, bilirəm ki, o yazıdır, düzlüyünü, əyriliyini bilmirəm. Ağıllıca yoxla, səhvi varsa, düzəlt.

3. Beləcə əql əhlinə layiq qaydada məktubu Zeydə verdi. Məcnuna məktub çatanda, əqiqinə layiq dürr aldı. Mə'nasından məqsədini anladı, Leylidən razı qaldı.

## BU, MƏCNUNU ATASI SƏHRADƏ BULDUĞUDUR VƏ NƏSİHƏTLƏ İSLAHİNDƏN ACİZ OLDUĞUDUR

1. Təhrir qılanda əhli-inşa,
Böylə bu misalə çəkdi tuğra
Kim, ğüsseyi-dəhr mübtəlası,
Məcnuni-şikəstənin atası
Qalmışdı məlamət içrə dün-gün,
Nə günü gün idi, nə dünü dün.
2. Getmiş idi əldən ixtiyari,
Gündüz səbri, gecə qərari.
Qılmazdı tərəddüdündə təqsir,
Bulmazdı bu dərdə hiç tədbir.
3. Bir gün onu etdilər xəbərdar,
- "Key piri-şikəsteyi-diləfkar!
Dün Leyli atası, ol siyəhdil,
Ol mün'imi-süflə, piri-cahil,
Sərxeyli yanında dad edərdi,
Məcnuni-həzini yad edərdi:
4. "Kim, bu dəli hökmə olmayıb ram,
Xəlqə bizi eylər oldu bədnam.
Peyvəstə bizə yetər bəlasi,
Novfəl ğəzəbindən et qiyasi.
Hər necə ki, təndə canı vardır,
Namusumuza ziyanı vardır.
5. Çün məhzi-şər oldu zati-əf'i,
Vacib görünür müdam dəf'i"
Namus bizim deyil, sənindir.
Dəf eyləyə gör ki, düşmənindir.
Çün kim zərərində gördülər nəf,
Əzm eylədilər ki, edələr dəf.
6. Yadın deyil, eylə oğlunu yad!
Qıl çarə ki, düşmən olmaya şad".
Ol pir düşüb min iztirabə,
Naçar özün verib əzabə,
Səhralərə tutdu seyl tək ru,
Cəhd ilə yüyürdü gəzdi hər su.
7. Mənzil-mənzil sirişki qanın,
Rəhbər qılıb istədi nişanın.
Çün gecəyə gündüz oldu təğyir,
Oldu gecə zülməti cahangir,
Rəf oldu əlameyi-mənazil,
Ol pirə tərəddüd oldu müşkil.

## BU, MƏCNUNU ATASI SƏHRADA TAPDIĞIDIR VƏ NƏSİHƏTLƏ ONU YOLA GƏTİRMƏKDƏN ACİZ OLDUĞUDUR

1. Qələm əhli əhvalatı yazanda hekayəti belə möhürlədi ki, zəmanə dərdinə düşmüş xəstə Məcnunun atası gecə-gündüz qaxınc içindəydi. Nə gecəsi gecəydi, nə gündüzü gündüz.

2. Əlindən ixtiyarı getmişdi, gündüzlər səbri, gecələr qərarı yox idi. Əlindən gələni edirdi, ancaq bu dərdə heç bir əlac tapa bilmirdi.

3. Bir gün ona xəbər çatdırdılar ki, "Ey ürəyi yaralı xəstə qoca! Dünən Leylinin o acıdil atası, o varlı alçaq, cahil qoca xeyli adam içində dad edirdi, yazıq Məcnunun adını çəkirdi:

4. "Bu divanə hökmə tabe olmayıb, bizi el içində bədnam eləyir. Daima bizə zərəri dəyir, elə Novfəlin qəzəbini götürün. Necə ki, təndə canı var, namusumuza ziyandır.

5. Şər ilanın zatında olduğu üçün onu dəf etmək lazımdır. Namus bizim deyil, sənindir, dəf elə, axı, o sənin düşmənindir. Düşmənliyinə inandılar, onu yox eləmək qərarına gəldilər.

6. Yad deyil, oğlunu yada sal, bir çarə gör ki, düşmənimiz sevinməsin". O qoca min iztiraba dözüb, əlacsız qaldı; özünə əzab verib, sel tək səhralara üz tutdu; cəhd edib, hər yeri gəzdi.

7. Mənzil-mənzil qanlı göz yaşlarının izini tutub onun nişanını axtardı. Gecənin qaranlığı gündüzü əvəz edəndə, dünya zülmətin əlinə keçəndə, iz seçmək çətinləşdi, qocanın axtarışı ağırlaşdı.

8. Sərgəştə gəzərkən eyləyib ah,
Bir şö'lə ona göründü nagah,
Ol pirin olub dəlili-rahi,
Ruz etdi ol od şəbi-siyahi.
Sandı odu yandıran ərəbdir,
Xeyli həşəm ol oda səbəbdir.
9. Pərvanə kimi üz urdu narə,
Çün yetdi və eylədi nəzarə,
Gördü ki, bu şö'lə bir nəfəsdir,
Nə şö'leyi-cirmi-xarü xəsdir,
Məcnunundur bu ahi-sərkəş,
Çəkmiş, urmuş cahana atəş.
10. Qət'i-nəzər eyləmiş cahandan,
Keçmiş sərü çeşmü cismü candan.
Nə mülk, nə mal cüstcüsu,
Nə ata, nə ana arizusu,
Getmiş yelə bərgi-e'tibari,
Ol qalmışü mərg intizarı.
11. Ol pir çü gördü oğlu halın,
Tökdü rüxi-zərdə əşki-alın.
Yanında oturdu zarü ğəmnak,
Əl urdu ki, çöhrəsin edə pak,
12. Ol şiyftə açdı çeşmi-pürnəm,
- "Kimsən? - dedi - ey mənimlə həmdəm!
Gər elçi isən, yetir pəyamın!
Ver müjdəsin ol məhi-təmamın!
Vər yolçu isən, oturma ğafil,
Əzm eylə, gözət bir özgə mənzil!"
13. Ol pir təzərrö etdi ağaz:
- "Key neqdi-həyatə kisəpərdaz!
Mən dürcəmü sən düri-şəbəfruz,
Ye'ni atanam məni-siyəhruz!
Ey hasili-məzrəi-vücudim!
Vey ömr xəsarətində sudim!
14. Ey cövhəri canımın həvası,
Vey dideyi-bəxtimin ziyası!
Dərdim olasan mənim pənahım,
Fəxrim, şərəfim, ümidgahım.
Məndən bu sərir olanda xali,
Sən olasan əhli-mülkə vali.
15. Xəlq edə səni görəndə yadım,
Baqi sənin ilə ola adım.
Gər tifliliyində məstü bibak,
Səhrayə düşüb, yaxan qılıb çak,
Oldun rəhi-eşq içində məşhur,
Mə'zur idin ol zamanda, mə'zur!

8. Ah-vayla avara gəzərkən qəflətən bir işıq göründü və o, qocaya yol göstərdi. O od qara gecəni gündüzə çevirirdi. Elə bildi ki, odu yandıran böyük bir ərəb qəbiləsidir.

9. Pərvanə kimi oda tərəf üz tutdu, yetişib baxıb gördü ki, bu şö'lə bir nəfəsdir, çör-çöp yanmasının işığı deyil, Məcnunun başından ucalan ahdır, ucalır, od saçır.

10. Dünyadan gözünü çəkmiş, başından-gözündən, cismindən, canından keçmiş Məcnunun ahıdır. O nə mal, nə mülk qovğasındadır, nə ana, nə ata arzusundadır. Etibar yarpaqlarını yel aparmış. Gözlədiyi təkcə ölümdü.

11. Oğlunun halını görüb qoca gözündən saralmış üzünə qanlı yaş tökdü. Dərd-qəm içində onun yanında oturdu, əl uzatdı ki, üzünün tozunu silsin.

12. O yazıq yaşla dolu gözünü açdı və dedi: "Kimsən! Ey mənim həmdəmim! Əgər elçisənsə, xəbərini yetir! O bədrlənmiş ayın müjdəsini ver! Əgər yolçusansa, vaxtını itirmə, çalış özünə özgə mənzil axtar".

13. O qoca yalvarmağa başladı: "Ey mənim həyat neqdimin sahibi! Mən sandıqçayam, sən gecəni işıqlandıran dürrsən, ye'ni mən üzüqara sənin atanam! Mənim ziyana düşmüş ömrümün barı-bəhəri:

14. Ey canımın cövhərinin havası! Ey bəxtimin gözünün nuru! Deyirdim mənim köməyim olasan, fəxrim, şərəfim, ümidim olasan.

15. Bu taxt məndən boşalanda sən mülkümə vali olasan, səni görəndə xalq məni yada sala, sənin adınla adım həmişəlik ola. Uşaq vaxtında sərxoş olub qorxmadan səhralara düşəndə, yaxanı yırtıb eşq yolunda dünyada məşhur olduqda o vaxt üzürlüydün!

16. Hər veqtdədir bir əmr ğalib,
Hər əhddədir bir iş münasib.
Növrəslərə eşq bir hünərdir,
Sərhəddi-kəmalə rahbərdir.
Hala ki, məqami-əql buldun,
Təhsili-kəmalə qabil oldun,
17. Səndən nə rəva bu macəralər,
Sərmayeyi-eyb olan sədalər.
Gər ğafil idin, ol indi aqil,
Səhralərə düşmə, gəzmə ğafil!
Vəhşilər ilə nədir bu birlik?
İnsan ilə xoş deyilmi dirlik?
18. Vəhşi ilə vəhşi, teyr ilə teyr,
Həmcins ilə xoşdur eyləmək seyr.
Rəhm et məni-zarü namuradə,
Qoyma bu məşəqqətü bəladə.
Kafürvəş oldu mişknabım,
Bu sübhdə sənsən afitabım!
19. Olmaq əlifim qərineyi-dal,
Meylim sinə olmağunadır dal.
Dövran sitəmilə canə yetdim,
Mən özgə diyar əzmin etdim.
Gəl, tapşırayım sənə məqamım,
Zəbt eylə büsatü ehtiramım!
20. Nə sud həmişə məstlikdən,
Nə faidə bütpərəstlikdən?
Ey məst, kəmali-hiddətindən,
Yoxdur xəbərin qəbahətindən!
Ol ləhzə ki, huşiyar olursan,
Əlbəttə ki, şərmsar olursan.
21. Ey bütkədələr sənəmpərəsti!
Çün rəf ola bu hicabi-məsti.
Məzmum olub etdiyin bu halət,
Əlbəttə, sənə yetər xəcalət.
Bir dilbərə ver könül ki, daim
Bünyadi-səbatı ola qaim!
22. Gər olsa yolunda bu cahan xak,
Damani ola ğübardən pak.
Sən seydi olan xücəstə şəhbaz
Hər ləhzə qılır bir əldə pərvaz.
Gəh Novfələdir mütii-fərman,
Gəh Ibn Səlamə munisi-can.
23. Sən - böylə bəlalərə giriftar,
Ol - öylə çirağı-bəzmi-əğyar.
Şərm eylə bu eşqbazlıqdan,
Bifaidə cangüdazlıqdan!

16. Hər vaxtın bir əmri var, hər əhdin öz uyar işi var. Cavanlar üçün eşq hünərdir, ağla dolmağa rəhbərdir. İndi ki, ağıl məqamına çatmısan tam təhsilə, kamala sahib olmusan.

17. Bu macəralar, əsası eyib olan sədalar sənə rəvadırmı? Əgər özündən xəbərsiz idinsə indi ağıllı ol, səhralara düşmə, qafil gəzmə! Bu vəhşilərlə birlik nədir? Dirilik insanla xoş deyilmi?

18. Vəhşilər vəhşilərlə, quşlar quşlarla, hərəyə öz həmcinsi ilə gəzmək xoşdur. Mən ağlar namurada da rəhm et, məni bu bəla əzabında qoyma. Mişkim kafura dönür. Mənim sübhümün günəşi sənsən.

19. Belimin bükülməsi ömrün sona yetməsinin və meylimin qəbrə tərəf olmasının sübutudur. Dövrün sitəmindən cana yetmişəm, artıq özgə yolun yolçusuyam. Gəl yerimi sənə tapşırım, busatımın ehtiramımın sahibi ol.

20. Həmişə məstlikdən nə xeyir? Bütpərəstlikdən nə fayda? Ey məst, hiddətin o qədərdir ki, qəbahətindən xəbərin yoxdur? Elə ki, ayılırsan, əlbəttə, xəcalət çəkirsən.

21. Ey bütxanələr sənəmpərəsti! Bu sərxoşluq pərdəsi üzündən götürülməlidir. Bu məzəmmətli halətin sənə ancaq xəcalət gətirər. Elə bir dilbərə könül ver ki, səbatı olsun.

22. Yolunda bütün dünya toza, torpağa dönsə də, ətəyi təmiz olsun. Səni ovlamış xoşbəxt şahin daima əldən- ələ qonur. Gah Novfəlin qulluğunda durur, gah İbn Səlama can dostu olur.

23. Sən bu bəlada ikən o düşmən məclisinin çırağıdır. Bu eşqbazlıqdan canını boş yerə güdaza verməkdən utan.

24. Yoxdur çü bəqasi ruzigarin,
Fərz eylə ki, oldu yar yarin,
Vəsl etmə onunla kim, bilirsən,
Bir gün olur ondan ayrılırsan.
25. Tərk eylə bu hərzə-hərzə seyri,
Yad eylə ilahi, anma ğeyri
Kim, nəfsə məadü mərcə' oldur,
Qət et ona söz ki, məqtə' oldur.
Həq sanei-dəhrü kargəhdir,
Bunda əməl etməmək günəhdir.
26. Hər kimsə gərək gələn məhəldə,
Bu kargəh içrə bir əməldə.
Hər kim nə əməl qılırsa bünyad,
Muzdunu verər əməlcə ustad.
Ey kargəhi-cahana daxil,
Sən həm əməl eylə, olma ğafil!
27. Vəqt oldu səfər qılam cahandan,
Avarə olam bu xakidandan;
Vəqt oldu verəm fənayə təxtim,
Qədr ilə çəkəm bəqayə rəxtim.
Gəl yanıma, eylə fikri-halım!
Biganəyə vermə mülkü malım!
28. Çün onu yığınca çəkmişəm rənc,
Qıyma ki, nəsibi-ğeyr ola gənc.
Eşqin, bilirəm ki, böylə qalmaz,
Daim səni ğəm bu halə salmaz;
Bəxtin oyananda bu yuxudan,
Hirsin yorulanda cüstcudan,
Qorxum bu ki, özgə ola halım,
Dünyadə nə mən qalam, nə malım.
29. Bikəslik olub sənə müqərrər,
Bikəs olasan müdam, bizər...
Aqil kişi durbin gərəkdir,
Dünyada ümid bir dirəkdir".
30. Çün pəndi tükətdi ol xirədmənd,
Məcnuna təfavüt etdi ol pənd.
Dövlətli sözünə oldu mail,
Bir fikr elədi ki, ola aqil,
Qət edə səlasili-cünuni,
Sevdasının olmaya zəbuni;
Tərk eyləyə arizuyi-dildar,
Eşqə dəxi olmaya giriftar.

24. Dünyanın vəfası yoxdur. Tutaq ki, yarın sənə yar oldu. Onunla qovuşanda bil ki, bir gün gələcək ayrılacaqsan.

25. Bu boş-boş gəzməyi burax. Allahı yada sal, başqa heç kəsi anma, çünki o ruhun son sığınacağı və son qayıdacağı yerdir. Axırda da ruhun Allahındır. Sən sözünü ona de, çünki son nöqtə odur. Allah zamanın da və aləmin də yaradıcısıdır. Buna əməl eləməmək günahdır.

26. Hər kəs bu iş yerində bir iş görməlidir. Ustad muzdu hər kəsin əməlinə görə verir. Ey bu iş evinə-dünyaya gəlmiş, sən də bir əməldən yapış, qafil olma!

27. Mənim də dünyadan köç edib, bu torpaq binasından ayrılmaq vaxtım gəlib. Vaxtımı fənaya vermək qədr-qiymətlə yatağımı əbədi dünyaya çəkmək vaxtım gəlib. Qayıt yanıma, məni də düşün! Malımı, mülkümü yadlara vermə.

28. Çünki onu çox əzabla yığmışam, qıyma xəzinə özgələrin payı olsun. Bilirəm, eşqin belə qalmayacaq, qəm səni həmişə bu hala salmayacaq. Bəxtin yuxudan oyananda bu çəkişmədən yorulanda, qorxuram halın başqa ola - dünyada nə mən olam, nə malım.

29. Kimsəsizliyə bağlanıbsan, qorxuram kimsəsiz və qızılsız qalasan. Aqil insan uzağı görən olmalıdır, dünyada ümid bir dirəkdir".

30. Ağıllı qoca nəsihətini bitirəndə, öyüd Məcnuna tə'sir elədi. Müdrik sözlərə mayil oldu, bir fikrə düşdü ki, aqil olsun, divanəlik zəncirini qırsın, öz sevdasının əsiri olmasın. Dildar arzusundan keçib bir daha eşqə düşməsin.

31. Əmma yenə eşq şəhriyari
Fərmanına çəkdi ol fikari:
- "Key vari olan mənim cahanda
Nən var sənin, bu cismü canda?
Canə təmə etmə kim, mənimdir!
Tərk eylə təni ki, məskənimdir!
Məndən keçü canü təndən ayrıl!
Qoy varlığın, özünlə sən bil!"

32. Gülbün kimi qanı cuşa gəldi,
Bülbül sifəti xüruşə gəldi:
- "Key eyni-səlah olan bəyani!
Və'zi mənə afiyət nişani!
Mən həm buna qailəm ki, pəndin
Məzmuni-kəlami-sudməndin
Nisbət mənə xeyrdir, deyil şər,
Gər olsa eşitməyi müyəssər.

33. Gərçi sözünə qulaq tutdum,
Nə sud, eşitdimü unutdum.
Sən demə ki, tut xəbər sözümdən
Kim, yox xəbərim mənim özümdən.
Eşq aldı dərunimü birunim,
Getdi yelə səbr ilə sükunim.

34. Mən əqlə təvəccöh eylərəm çox,
Sevda yolumu tutar ki: - Yox, yox!
Sən qandanü tərki-eşq qandan?
Eşqi-əzəli çıxarmı candan?
Tə'nin sitəmilə canə yetdim,
Tərk eylə məni çü tərkin etdim!

35. Lütf eylə zaman-zaman verib pənd,
İslahıma olma arizumənd!
Artar ələmim bu macəradən,
Atəş kimi cünbüşi-həvadən.
Bir şişə ki, oldu parə-parə,
Peyvəndinə hiç varmı çarə?

36. Təklifimi qılma xanimanə,
Gör sür'əti-gərdişi-zəmanə;
Çün sən həm onu qoyub gedirsən,
Onda məni əyləyib nedirsən?
Ancaq mənə ərzi-mülkü mal et!
Oğlunu özün kimi xəyal et!
Fərz eylə ki, malə oldu vali,
Getdi, yenə ğeyrə qoydu mali".

31. Amma yenə eşq şəhriyari o yazığı qulluğuna çəkdi: - Ey bu dünyada bütün varlığı mənim olan! Bu cism və canda sənin nəyin var? Cana tamah salma' ki, mənimdir! Tənimdən əl çək ki, məskənimdir! Məndən keç, canımdan, tənimdən ayrıl! Varın qoy özünün olsun, özün bil!" - dedi.

32. Gül kolu kimi qanı cuşə gəldi, bülbül kimi fəğanə gəldi: - "Ey sözləri tamam haqlı olan! Nəsihəti mənə sağlamlıq nişanı olan! Mən inanıram ki, öyüdünün, kəlamının və fikirlərinin faydalılığı mənim xeyrimədir, şərimə deyil. Əgər eşitməyim mümkün olsaydı!

33. Əgər sözünə qulaq tutdumsa da nə fayda, eşitdim və unutdum. Sən demə sözümdən xəbər tut, çünki mənim özümdən xəbərim yoxdur. Daxilimi və xaricimi eşq alıb, səbrimi, sükutumu yel aparıb.

34. Mən çox ağıla can atıram, amma sevda yolumu tutub ki, yox, yox! Sən hara, eşqi tərk etmək hara! Əzəli eşq də candan çıxarmı? Tə'nənin sitəmindən cana yetdim. Məni tərk eylə, çünki səni tərk etmişəm.

35. Rəhm elə, zaman-zaman nəsihət verib məni sağaltmaq arzusuna düşmə! Bu rəftarından dərdim-qəmim yeldən od güclənən kimi artar. Para-para olmuş şüşənin calanmasına çarə vardırmı?

36. Məni evə çağırma, zamanının sür'ətini gör ki, sən də onu qoyub gedirsən, onda məni niyə dayandırırsan? Sənsə ancaq mənə mülk, mal sözü söylə! Oğlunu da özün kimi bil! Fərz elə ki, mala sahib oldu, getdi, yenə dövləti özgəsinə qoydu".

37. Ol kişvəri-eşq padişahi,
Ol övci-bəlavü dərd mahi
Üzr ilə qılırdı eyləyib ah,
Babasına şərhi-ğəm ki, nagah
Lərzan oluban təni-həzini,
Qan doldu qolundan asitini.
38. Əl verdi atasına təhəyyür,
Məcnun dedi: - "Eyləmə təfəkkür!
Fəsd eylədi ol büti-pərizad,
Niş urdu onun qoluna fəssad;
Ol zəxm əsəri göründü məndə,
Biz bir ruhuz iki bədəndə.
39. Bizdə ikilik nişanı yoxdur,
Hər birinin özgə canı yoxdur.
Sən sanma ki, oldur ol, mənəm mən,
Bir can ilə zindədir iki tən.
Xürrəm oluram, o olsa xürrəm,
Qəm yetsə ona, mənə yetər ğəm".
40. Ol pir çü vaqif oldu halə,
İnsaf gətirdi ol kəmalə.
Bildi ki, deyil bu nəqş batil,
Olmaz hiyəl ilə eşq zail.
Minbə'd nəsihət etməz oldu,
Tə'n ilə fəzihət etməz oldu,
Tərk etdi təriqeyi-nizain,
Nomid olub eylədi vidain.

37. O eşq ölkəsinin padişahı, o bəla-dərd zirvəsinin ayı, üzr istəyib ah çəkirdi, atasına qəmini anladırdı ki, birdən zəif bədəni titrədi, qolundan qolçağına qan doldu.

38. Atası heyrət elədi. Məcnun dedi: "Fikir eləmə, o pərizad bütümdən qan aldılar. Qan alan onun qoluna neştər vurdu və onun nişanəsi məndə göründü. Biz iki bədəndə bir ruhuq.

39. Bizdə ikilik nişanı yoxdur. Hər birimizin özgə canı yoxdur. Sən sanma ki, o odur, mən mənəm, iki tənimiz bir canla diridir. O, şad olsa, şad oluram, qəm etsə, mənə də qəm yetir".

40. O pir bu halı bilib bu kamalın qiymətini insafla anladı. Bildi ki, bu nəqş pozulan deyil, hiylə ilə eşq zail olmaz. Bir daha nəsihət, tə'nə vurmaqla əzab vermədi. Qovğa yolundan əl çəkib ümid siz vidalaşdı.

## BU, MƏCNUN ATASININ TƏRKİ-NİZA ETDİYİDİR VƏ NAÇAR HƏSRƏTLƏ VİDA ETDİYİDİR

1. - "Key rişteyi-gövhəri-muradım!
Ayineyi-hüsni-e'tiqadım!
Bir ləhzə mənə tərəhhüm eylə!
Göftarım eşit, təkəllüm eylə!
Pərvayi-məni şikəstəhal et!
Əzmi-səfər eylədim, həlal et!
2. Naxoş sənə məndən idi əhval,
Mən getməli oldum, indi xoş qal!
Zinhar şikayət etmə məndən,
İncikli hekayət etmə məndən!
Dirlikdə çü səndən almadım kam,
Tuvsənliyə düşdün, olmadın ram;
3. Budur kəremindən iltimasım
Kim, tutasan öldüyümdə yasım!
Hər ləhzə edib fəğanü zari,
Torpağıma edəsən güzari.
Təklifi-nişatü eyş qılmən
Kim, sən deyəsən: "bu rəsmi bilmən".
4. Fəryadü fəğandır əsli-matəm,
Sən xud bu revişdəsən müsəlləm.
Öz adətin ilə nalə eylə,
Əcrini mənə həvalə eylə!
Budur ğərəzim ki, dustü düşmən
Görsün səni eyləyəndə şivən.
Bikəsliyim olmaya mənə ar,
Mə'lum edələr ki, varisim var".
5. Çün qıldı vəsiyyət ol pərişan,
Döndü evə gəldi zarü giryan.
Dərdü ələm etdi onu rəncur,
Qalmadı həyatı şəm'inə nur,
Dərdinə bulunmaz oldu dərman,
"Məcnun!" dedi, verdi aqibət can.
6. Dünyayə ümid tutmaq olmaz,
Hərgiz ölümü unutmaq olmaz!
Xoş xaneyi-eyşdir bu aləm,
Dərda ki, deyil əsasi möhkəm.

## BU, MƏCNUNUN ATASININ MÜNAQİŞƏDƏN ƏL ÇƏKDİYİDİR VƏ NAÇAR HƏSRƏTLƏ VİDALAŞDIĞIDIR

1. "Ey muradımın gövhərinin sapı! İnamımın hüsnünün güzgüsü! Bircə anlığa mənə mərhəmət eylə! Sözlərimi eşit, mənimlə danış! Mən biçarəyə yazığın gəlsin! Səfərə çıxıram, halallıq ver!

2. Sənə görə əhvalım naxoş idi, indi gedirəm, xoşluqla qal! Saqın, məndən sonra inciklikla danışma, şikayət eləmə! Sağlığımda səndən kam almadım, tərslik elədin, ram olmadın.

3. Kərəmindən xahişim budur ki, öləndə yasımı tutasan! Bircə anlıq ah-zarla torpağıma qədəm qoy. Sənə şadlıq-keyf demirəm ki, "bu qaydanı bilmərəm" deyəsən.

4. Əsl matəm fəryaddı, fəğandı, sənə də ki, elə bu lazımdı. Adətinlə nalə çək, mənim adıma yaz! Guya məni ağlayırsan. İsteyim budur ki, dost-düşmən səni ağlayan görsün. Kimsəsizliyimdən utanmayım, hamı bilsin ki, varisim var".

5. Pərişan halda vəsiyyətini eyləyib ağlaya-ağlaya evinə döndü. Dərd-qəm onu əzdi, həyat şamında nur qalmadı, dərdinə dərman tapılmadı. "Məcnun!" deyib axırda can verdi.

6. Dünyaya ümid bağlamaq olmaz və heç vaxt ölümü unutmaq olmaz! Bu aləm xoş, eyş-işrət evidir, dərd budur ki, özülü möhkəm deyil.

## BU, MƏCNUNUN ATASININ VƏFATINDAN XƏBƏRDAR OLDUĞUDUR VƏ MƏZARİNƏ YOL BULDUĞUDUR

1. Saqi, meyi-laləfam yoxmu?
Dözmən bu xumarə, cam yoxmu?
Öldürdü məni ğəmi-nihani,
Yoxdurmu şərabi-ərğəvani?
Ğəm dəf'inə durma, eylə tədbir!
Əldən gələni gəl etmə təqsir!
2. Dünya ki, nigari-dilrübadır,
Zinhar, inanma, bivəfadır.
Sən gərçi olubsan ona məftun,
Oldur tələbində səndən əfzun.
Sənsən ona cəhl ilə tələbkar,
Oldur sənə elm ilə həvadar.
3. Hər necə ki, ona mihmansan,
Eyşü tərəbilə kamiransan.
Ondan səfər ixtiyar edəndə,
Qürbi-həqə üz tutub gedəndə,
Göz sürməsi eyləyib ğübarın,
Ta məhşər olur nigahdarın,
4. Yolunda özün verər fənayə,
Saxlar, səni tapşırar bəqayə.
Hər kim ki, bu nüktədəndir agah,
Dövrani-fələkdən etməz ikrah.
Həm dirlikdə əzabı olmaz,
Həm mövtdən ictinabı olmaz.
5. Bir gün axıdıb sirişki-gülgün,
Nəcd üzrə oturmuş idi Məcnun,
Min tə'n ilə bir cəfaçı səyyad,
Ol zarə yetişdi, qıldı fəryad:
6. - "Key ardən el içində ari!
Vey naqis olan əyari-kari!
Yox səndə nişani-namü namus,
Əfsus ki, arsızsan, əfsus!
İnsaf deyil sitəmdə israf!
İnsafsız olduğuna, insaf!
7. Dirlikdə atanı etmədin şad,
Bari qıl onu öləndə bir yad!
Can verdi məhəbbətində ol pir,
Yad eyləmədin, nədir bu təqsir?
Yoxdurmu cibillətində azərm?
Allahdan eyləməzmisən şərm?"

## BU, MƏCNUNUN ATASININ VƏFATINDAN XƏBƏR TUTDUĞUDUR VƏ ONUN QƏBRİNİN ÜSTÜNƏ YOLLANMASIDIR

1. Saqi, lalərəng meyin yoxmu? Bu xumarlığa dözəmmirəm, cam yoxmu? Gizli dərdim məni öldürdü, ərğəvan rəngli şərabın yoxmu? Durma, çarə elə; qəmimi dağıt, əlindən gələni əsirgəmə.

2. Dünya ki, qəlbi məftun edən gözəldir, saqın, inanma ona, vəfasızdır. İndi ki, ona vurulubsan, bil ki, alıb aparacağı sənsən. Sən ona cəhalətində vurğunsan, o səni elm ilə dəstəkləyəcək.

3. Necə ki, sən onun qonağısan sevinc axtarırsan. Elə ki, dünyadan köçməli oldun və üzünü haqqa tərəf tutub getdin gözün torpaqla sürmələnəcək və qiyamətə tapşırılacaqsan.

4. Sənin yolunda özündən keçər, saxlayar, aparıb səni əbədi dünyaya tapşırar. Kim ki, fələyin bu incə işini bilir, çərxin dövranından küsmür. Nə dirilikdə əzab, nə də ölüm qorxusu çəkir.

5. Məcnun bir gün qanlı göz yaşı tökərək Nəcddə oturmuşdu. Bir zalım ovçu o ağlara yetişib min tə'nə ilə fəryad elədi.

6. "Ey el içində ardan uzaq! Ey işinin me'yarı naqis! Səndə namus əsər-əlaməti yoxdur. Əfsus ki, arsızsan, əfsus! Zülm etməkdə də insaf gərək. İnsafsızlığına sənin yazıqlar olsun!

7. Dirilikdə atanı şad etmədin, barı öləndə onu bir yada sal! O qoca sənin məhəbbətinlə can verdi, sən onu yad eləmədin, bu nə naqislikdir? Təbiətində şəfqət yoxdurmu? Allahdan utanmırsanmı?

8. Məcnunə buraxdı ol səda suz,
Artırdı fəğanın ol siyəhruz.
Baran kimi daşə urdu başın,
Mey kimi əyağə tökdü yaşın,
Qəbrin sorub istədi nişanə,
Oldu gözü yaşı tək rəvanə.
9. Çün gördü atasının məzarın,
Şəm eylədi ona cismi-zarın.
Tari-tənə dərdi tab verdi,
Dil atəşü didə ab verdi.
Lövh eylədi köksünü məzarə,
Dırnaq ilə qıldı parə-parə.
10. Bağrına basıb məzari-pakin,
Gül yaprağı etdi lövhi-xakin.
Əfğan ilə tazə qıldı matəm,
Əfğanı içində derdi hər dəm:
11. - "Key baniyi-bünyeyi-vücudim!
Üsyani ziyan, rizası sudim!
İrşadını bilmədim ğənimət,
Yüz vay ki, fövt olundu fürsət.
Yüz heyf ki, tutmadım təriqin,
Bir neçə gün olmadım rəfiqin.
12. Feyzin mənə olmadı müyəssər,
Sən xeyr dedin, mən eylədim şər.
Cövr ilə sənə cəfalər etdim,
Yanlış vardım, xətalər etdim.
Ey dövlətim, olma dur məndən!
Vey şəm", götürmə nur məndən!
13. Olsam ğəmi-aləmə giriftar,
Ancaq sən idin ənisü ğəmxar!
Həmrazim idin şikayətimdə,
Dəmsazim idin hekayətimdə.
14. Noldu ğəmimə gətirmədin tab?
Qorxutdu məgər səni bu girdab?
Noldu səbəb eylədin əzimət?
Məndənmi idi sənə həzimət?
Ey mənşəi-cövhəri-həyatım!
Xoşnudluğundadır nəcatım.
Bildim işimi günahkarəm,
Gəldim sənə xarü şərmsarəm.

8. Bu sözlər Məcnunu yandırdı. O qaragün fəryadını daha da artırdı. Yağış kimi başını daşa döydü. Mey kimi yaşını ayağa tökdü. Qəbrin yerini soruşdu, nişanını istədi, gözünün yaşı kimi yola düşdü.

9. Elə ki, atasının məzarını gördü, ağlar cismini ona şam elədi. Yanğısından canına güc gəldi, ürək odu gözünü yaşla doldurdu. Köksünü sinə daşına çevirib, dırnaqları ilə daradı, para-para elədi.

10. Atasının pak məzarını bağrına basıb, torpağını gül yarpağı kimi qana boyadı. Əfğan içində təzə bir yas tutub, fəğan içində durmadan deyirdi:

11. - "Ey vücudumun bünövrəsinin banısi, üsyanı ziyanım, razılığı faydam olan! Sənin məni doğru yola çağırmağını qənimət bilmədim. Yüz vay ki, fürsəti qaçırdım. Yüz heyf ki, sənin yolunu tutmadım, bir neçə gün dostun olmadım.

12. Feyzin mənə qismət olmadı. Sən xeyir dedin, mən şər törətdim, yanlış gəzdim, səhv etdim, sənə zülm ilə cəfalar etdim. Ey dövlətim, məndən uzaq olma! Ey şam, məndən işığını alma.

13. Dünyanın qəmində batanda mənim yeganə dostum, qəmxarım sən idin. Mənim şikayətimdə sirdaşım, hekayətimdə dəmsazım idin.

14. Nə oldu qəmimə dözə bilmədin? Səni bu fırtına məgər qorxutdumu? Niyə bu səfərə çıxdın? Mənmi səni yıxdım? Ey həyatımın cövhərinin mənşəi, sənin xoş olmağın mənim qurtuluşumdur! Bildim işimi, günahkaram! Sənin yanına xar və xəcalətli gəlmişəm.

15. Dünyadə səni mən eylədim zar,
Üqbadə məni sən eyləmə xar!
Yaxdın məni ataşi-cəfayə!
Saldın ğəmü möhnətü bəlayə!
Sən meyli-fəraqü rahət etdin!
Bir küncü tutub fərağət etdin!
Kim eylədi həll müşkülatın?
Kim verdi bu ğüssədən nəcatın?"
16. Şəb ta səhər ol əsiri-hicran,
Matəm tutub etdi ahü əfğan.
Çün mişkə töküldü gərdi-kafur,
Zülmatə buraxdı pərtövün nur;
Ehya qalıban mərasimi-vəcd,
Tutdu rəhi-gurxanəyi-Nəcd.

15. Bu dünyada səni mən ağlar elədim. Sən o dünyada məni xar eləmə! Məni cəfa oduna yaxıb, qəm-möhnətinə, bəlasına saldın! Sən ayrılığı seçib bir küncdə rahatlandın. Çətin işini kim asanlaşdırdı? Səni bu qüssədən kim qurtara bildi?"

16. O hicran əsiri gecə-gündüz matəm tutub əfğan etdi. Elə ki, mişkə bənzər qara saçlar kafur kimi ağardı - sübh açıldı, işıq zülməti qovdu, yenidən cuşə gəlib Nəcd qəbiristanlığına yollandı.

## TƏMAMİYİ-SÜXƏN

1. Ərbabi-kəmalə ol əyandır
Kim, hüsn ilə eşq tovəmandır.
Hüsn ayineyi-cahannümadır,
Keyfiyyəti-eşq ona ciladır.
Hüsn olmasa eşq zahir olmaz;
Eşq olmasa hüsn mahir olmaz.
2. Hüsn olmasa eşqdən nə hasil?
Mə'şuq edər əhli-eşqi kamil.
Olmaz isə eşq hüsn olur xar,
Eşq ilədir əhli-hüsnə bazar.
3. Məcnun idi şəm'i-məclisəfruz,
Leyli ona ateşi-cigərsuz.
Məcnun idi cami-rahətəfza,
Leyli ona badeyi-müsəffa.
Leylidən idi kəmali-Məcnun,
Hüsn ilə olurdu eşqi əfzun.
Məcnundan idi cəmali-Leyli,
Eşq idi edən cəmalə meyli".
4. Bir gün Məcnuni-dilşikəstə
Səhradə gəzirdi zarü xəstə,
Bir səfhədə gördü iki peykər,
Leyli Məcnun ilə müsəvvər.
Məhv eylədi nəqşi-dilsitanın,
Qoydu özünün həmin nişanın.
5. Sordular ona həqiqəti-hal:
- Kim, nişə bir oldu iki timsal?
Dedi: - "Bizə birdürür həqiqət,
Birlikdə yaraşmaz iki surət.
Olmaq gərək əhli-daniş agəh
Kim, biz ikilikdəniz münəzzəh".
6. Sail dedi: - "Bu deyilmidir ar
Kim, yar ola yox, sən olasan var?
Sən netə qılırsan, ol olur həkk?
Bari onu qoy, sənə qələm çək!"
7. Dedi: - "Rəhi-eşqdə nə layiq,
Mə'şuqə ola niqabi-aşiq.
Üşşaq tənü həbib candır,
Tən zahirü təndə can nihandır,
Mə'şuqə, nə bak, olursa məstur,
Aşiq gərək el içində məşhur
Kim, aləmə aşiq axıdan yaş
Mə'şuq kim olduğun qılır faş".

## SÖZÜN SONU

1. Bütün kamal sahibləri bilir ki, gözəlliklə eşq əkizdir. Gözəllik dünya güzgüsüdür, eşq onun cilasıdır. Hüsn olmasa eşq üzə çıxmaz, eşq olmasa hüsn mahir olmaz.

2. Hüsnsüz eşqdən nə çıxar? Eşq əhlini mə'şuqə kamil edər. Eşq olmasa, hüsn xar olar. Hüsn əhlinin bazarı eşqlədir.

3. Məcnun məclisi işıqlandıran şam, Leyli onun yanan ciyərinin oduydu. Məcnun can rahatlığının camı, Leyli isə saf badəydi. Məcnunun camalı Leylinin gözəlliyindəydi və gözəllik onun eşqini artırırdı. Leylinin gözəlliyi Məcnundan idi. Camala meyli eşq yaradırdı.

4. Bir gün ürəyi üzgün Məcnun səhrada ağlar və xəstə gəzirdi. Daş üzərində Məcnunla Leyliyə oxşar iki şəkil gördü. Sevgilisinin əksini silib özününkünü saxladı.

5. Soruşdular ki, bu nə deməkdir, niyə iki şəkli bir etdin, dedi: "Bizim həqiqətimiz birdir. Birliyin iki şəkli olmaz. Ağıllılar bilməlidirlər ki, ikilikdən irağıq".

6. Sail dedi:-"Ayıb deyilmi ki, yarın yox ola, sən qalasan, niyə özünü saxlayıb onu silirsən? Heç olmasa o qalsın, özünü sil".

7. Dedi: "Eşq yolunda heç layiqdirmi, mə'şuqə aşiqin niqabı ola. Aşiq təndir, dost isə candır. Tən zahirdir, can isə tən içində gizlidir. El içində mə'şuqə namə'lum, aşiqsə məşhur olmalıdır. Aşiqin gözündən dünyaya axan yaşdan mə'şuqənin kim olduğu bilinməlidir".

## BU, MƏCNUNUN ŞƏMMEYİ-KEYFİYYƏTİ-HALIDIR VƏ BƏ'Zİ SİFATİ-KƏMALIDIR

1. Məcnun idi mülki-dərd şahi,
Xeyli-dədü dam onun sipahi.
Ahunun alırdı mişk bacın,
Rubah səmurunun xəracın.
Bir sərvər idi kərimü adil,
Cümlə dədü damə ədli şamil.
2. Xuni-cigərindən ol vəfadar,
Xunxarları qılırdı xunxar.
Xunabi-cigər töküb dəmadəm,
Qılmazdı siba' rizqini kəm.
Dövründə dirəndələr olub ram,
Tutmuşdu biri-birilə aram.
3. Gur olmuş idi pələngə həmraz,
Gürg olmuş idi gəveznə dəmsaz.
Şir olmuş idi ənisi-nəxcir,
Nəxcir əmərdi şirdən şir.
Yanında tutardı mur xanə,
Göz yaşından yığardı danə.
4. Gahi olub əşk seyli qaim,
Seylabə gedərdi min bəhaim,
Gəh odunu təndə tab edərdi,
Min canəvəri gəbab edərdi.
Bel olmuş idi əlində dırnaq,
Yerdən sovurardı başə topraq.
5. Muyində ğübar olub fərahəm,
Əşk ilə çəkib zaman-zaman nəm,
Ahubərə səbzə zari oldu,
Gülzari-cünun bəhari oldu.
Gər tutsa idi gəvəzn ilə xu,
Axardı gözündən ol qədər su
Kol sudan olurdu tazəvü tər,
Həm bərg verərdi şaxi, həm bər.
6. Hər ləhzə alıb əlinə bir mar,
Xürsənd oluban deyirdi ol zar:
- "Kol sünbüli-mişkbuyi tutdum,
Sərrişteyi-arizuyi tutdum".
7. Qaplan kimi canə urdu min dağ,
Arslan sifəti uzatdı dırnaq,
Arslanların oldu pişvası,
Qaplanların oldu müqtədası.

## BU, MƏCNUNUN HALININ QISACA TƏSVİRİDİR VƏ KAMALININ BƏ'Zİ KEYFİYYƏTİDİR

1. Məcnun dərd mülkünün şahı, bir yığın heyvanat onun qoşunu idi. Ahulardan müşk (ətir) samurdan rübah xərac olardı. Böyük ədalət sahibi və bütün heyvanata ədalətlə baxan başçı idi.

2. O vəfadar ciyərinin qanı ilə qaniçənləri qanla doydururdu. Gözündən hey qan-yaş axıdıb, heyvanatın azuqəsini azalmağa qoymurdu. Vəhşilər də ona ram olub, sakitcə dövrəsində dolanırdılar.

3. Qulan pələngin sirdaşı, canavar maralın dostu olmuşdu. Şir dağ dağ keçisinin dostuydu, dağ keçisi şirdən süd əmirdi. Qarışqalar onun yanında ev tikib, göz yaşını danə-danə içirdi.

4. Gah gözünün yaşı selə dönüb vəhşiləri aparırdı. Gah canının odu min heyvanı kəbab edərdi. Belə dönmuş dırnaqları ilə başına torpaq eləyirdi.

5. Məcnunun saçında yığılmış toz gözünün yaşından nəm çəkib yaşıllaşırdı. Ceyran balaları ac qalmırdı. Maralla dostluq tutardısa, gözündən də' o qədər yaş axıdardı ki, cismi həm təzə və tər yarpaqlar açır, həm bar verirdi.

6. Hər ləhzə əlinə bir ilan alıb şadlanar kimi o ağlar deyərdi: "Əlimdəki yarımın müşk ətirli süsən-sünbül hörüyüdür, azulrımın sapıdır

7. Qaplan an cana min dağ vururdu, arslan kimi dırnaqlarını uzadırdı. Onlara da, bunlara da başçılıq edirdi.

## BU, MƏCNUNUN SİDQ İLƏ MÜNACAT ETDİYİDİR VƏ NAVƏKİ-DUASI HƏDƏFİ -İÇABƏTƏ YETDİYİDİR

1. Bir gecə ki, zülməti-ziyasuz
Zülfi-şəbi etdi bürqeyi-ruz;
Bir lə'li edib sipehr nayab,
Göstərdi yerinə min düri-nab;
Bir sancağı eyləyib nigunsar,
Min məhçeyi-rə'yət etdi izhar.
2. Qətrə-qətrə həkimi-əflak,
Xəşxaşlarında tutdu tiryak.
Danə-danə ərusi-gərdun
Qaftanına tikdi dürri-məknun.
Girdabə düşüb səfineyi-mah,
Qıldı özünə Məcərrədən rah.
3. Saçıldı Ütaridin midadı,
Artırdı bu səfhəyə səvadı.
Zöhrə dağıdıb siyah keysu,
Geysusi içində gizlədi ru.
Xurşid nihan olub sitarə,
Göz açdı təriqi-intizarə.
4. Tərpəndi səri-sinani-Bəhram,
Fəth oldu ona vilayəti-şam.
Bərcis girib siyəh libasə,
Xurşid ğəmində batdı yasə.
Ayinə olub sipehri-gərdan,
Baxdı ona, əks saldı Keyvan.
5. Gərdunə səvabit oldu mismar,
Ta tökməyə dün büsati pərkar.
Göydə Həməl oldu aşikarə,
Ahubərə çıxdı səbzəzarə.
Gavi-fələk oldu gavi-ənbər,
Doldurdu cəhanə ənbəri-tər.
6. Cövza kəməri mürəssə oldu,
Gərdun bədəni müləmmə oldu.
Xərçəng qılıb səhər yelin dəf,
Xasiyyəti verdi zülmətə nəf.
Oldu Əsəd afitabdən dur,
Pür dud misali-şəm'i-binur.

## BU, MƏNCNUNUN SƏMİMİ-QƏLBDƏN ALLAHA YALVARMASIDIR VƏ DUA OXUNUN HƏDƏFƏ DƏYDİYİDİR

1. Gecə qara zülmət pərdəsi ilə gündüzün işıqlı üzünü bağlayıb, ləl-günəş qoşun başçısını gizlədib yerinə dürr-əsgər göstərib, bir ölkəni alt-üst eyləyib, minlərlə ulduz-bayrağını üzə çıxardı.

2. Göylərin həkimi ulduzların xaş-xaşından tiryək çəkdi. Fələyin gəlini qaftanına (paltarına) danə-danə dürr tikdi. Ayın gəmisi kəhkəşanın burulğanına düşüb, özünə yol tutdu.

3. Ütarid öz adını göylərə yazdı. Zöhrə qara saçlarını dağıtdı, üzünü onların içərisində gizlədi. Günəş gizləndi, ulduzlar gözlərini açıb intizar yoluna düşdülər.

4. Bəhramın nizəsi tərpənən kimi Şam vilayəti fəth olundu. Bürceys qara geyinib günəşin yasını tutdu . Göylərin qübbəsi ayna kimi cilalandı. Keyvanın əksi göründü.

5. Gecənin pərdəsi göylərə tikildi ki, gecə öz büsatını dağıtmasın. "Həməl" üzə çıxdı. Ahubərə* çəmənliyi dolaşdı, Öküz* bürcü Ənbər* bürcünə çevrildi və dünyaya ətir saçdı.

6. Cövzanın* (əkizlərin) kəməri daş-qaşla bəzəndi, göylər rəngarəng oldı. Xərçəng* səhər yelini yox etdi, qaranlığın mülkü gücləndi. Əsəd* (Şir) Günəşdən uzaqlaşdı, sönmüş şamın tüstüsünə döndü.

7. Geysusinə verdi Sünbülə tab,
Mişk üstünə tökdü ənbəri-nab.
Mizani edib fələk tərazu,
Sərrafi-zəminə çəkdi lö'lu.
Əqrəb buraxıb kəməndi-pürxəm,
Divi-şəbə qıldı qeydi möhkəm.

8. Qövsini qurub sipehri-laib,
Atıldı xədəngi-Nəcmi-saqib.
Büzğaleyi-asiman töküb mu,
Göy səfhəsin eylədi siyəhru.
Dəlvi dəlib afəti-zəmanə,
Min qətrə saçıldı asimanə.

9. Hut eylədi həbsi-Yunisi-ruz,
Bərqi-şəfəq oldu asimansuz.
Ərz eylədi Əxbəşə cinasın,
Cəbhə dəxi cəbhəsin ziyasın.
Həm həq'ə cəmalə verdi ziyvər,
Həm hən'ə-mükəlləl etdi əfsər.

10. Şərteynü Büteyn, Səmakü Əklil,
Nur etdilər asimanə təhvil,
Ta Sadirü Varidə, Nəaim
Sərf eyləyə sərf ilə dəaim.
Təzyin üçün etdilər mühəyya,
Lə'lin Dəbəran, dürün Sürəyya.
Verdi rəvişi-sipehrü əxtər,

11. Tərtibi-Müqəddəmü Müəxxər,
Məcnun mütəhəyyirü pərişan,
Qalmışdı sipehr işində heyran.
Gərdunə açardı dideyi-tər.
Yer üzünə doldurardı əxtər.

12. Hər əxtərə ərzi-hal edərdi,
Min arizuyi-məhal edərdi.
Əvvəl olub asimanə mail,
Şərh etdi Ütaridə ğəmi-dil:

13. - "Key əhli-hesabə karfərmay!
Müstövfiyi-əqlü məşrəfi-ray
Ey nasixi-nüsxeyi-məani!
Fehristi-rümuzi-asimani!
Qəssami-məqasidü mətalib,
Rəssami-mənasibü məratib!

14. Dərdi-dilimin hesabı çoxdur,
Səndən özgə dəbir yoxdur.
Bir naməyə dərdimi rəqəm ğıl,
Sultanıma ərzə et, kərəm qıl!
Şayəd əsər edə feyzi-xamən,
Tə'vizi-cünunim ola namən".

7. Sünbülə* saçlarına sığal verdi elə bil müşk üstünə ənbər tökdü. Fələk Mizanı* Tərəzi* edib, sərraf kimi yerlər üçün lə'l çəkdi. Əqrəb* kəməndin atdı, gecə divini möhkəm bağladı.

8. Qövsün* yayından atılan ox axar ulduza döndü. Göylərin Buzqaləsi* - (Çəpiş) saçlarını dağıdıb asimanın üzünü qaraltdı. Dəlvi* (Dolça) göyləri dəlik-deşik edib min işıq qətrəsi saçdı.

9. Hut* (Balıq) gündüzün Yunisini həbs elədi, şəfəqlərin parıltısı göyləri odlandırdı. Əxbəş* mətahını sərdi, Cəbhə* alnının işığından pay vedi. Həq'ə camalına ziynət verdi, hən'ə əksin özünə tac elədi.

10. Şərteyn*, Büteyn*, Səmak* və Əklil* nurlarını asimana saçdılar ki, Sadir*, Varid* və Nəaim*, Sərf* və Dəaim* bolluca o işıqdan faydalansınlar. Sürəyya* dürrünü, Dəbaran* öz lə'lini göyləri bəzəmək üçün hazırladı.

11. Müqəddəm* və Müəxxər* göylərə və ulduzlara nizam verdilər. Məcnun heyrət içində göylərin işinə heyran qalmışdı. Yaşlı gözlərini göylərə açıb, yer üzünü ulduzlarla doldurdu.

12. Hər ulduza min əlçatmaz arzusunu deyirdi. Əvvəl Ütaridə* mail olub, ona ürək qəmindən söz açdı:

13. "Ey mö'təbərlərə iş buyuran, ağlın mirzəsi, müdrikliyin sahibi, göy rəmzlərinin kitabı, məqsədlərin və mətləblərin bölüşdürəni.

14. Ürəyimin dərdinin hesabı çoxdur. Səndən başqa yazanı yoxdur. Dərdimi bir naməyə yaz, Sultana yetir, kömək göstər! Bəlkə sənin qələminin feyzi ona tə'sir etsin və məktubum məni delilikdən qurtarsın.

15. Gördü ki, Ütarid anlamaz raz,
Bir özgə tərənnüm etdi ağaz.
Döndərdi üz ondan, ağlayıb zar,
Mərrixə niyazın etdi izhar:
16. - "Key valiyi-məsnədi-şücaət!
Şəmşirinə aləm əhli-taət!
Sən sahibi-nüsrətü zəfərsən,
Ərbabi-silahə taci-sərsən!
Mən acizəmü qəvidir əğyar,
Mən bikəsü xəsmdir sitəmkar.
17. Acizlərə lütf edib mədəd qıl!
Bikəslərdən bəlanı rəd qıl!
Çək tiğini, eylə dəf'i-düşmən,
Ta dusta həmnişin olam mən!"
Çün gördü büłənd yerdədir kam,
Nə Tir yetər ona, nə Bəhram.
18. Tiğ ilə qələmdən oldu nomid,
Tutdu rəhi-barigahi-tovhid,
Dərgahə tutub rüxi-niyazın,
Mə'budinə ərzə qıldı razın:
19. - "Key tiğə müinü kilkə rəhbər!
Bəhram ğülamü Tir çakər.
Ey fərqi-əməl külahduzi,
Sahibrəqəmi-bərati-ruzi!
Rəhm et məni-zarü binəvayə!
Dərdi-dilimi yetir dəvayə!
20. Leyliyi sən eylədin pərivəş
Kim, canə cəmali urdu ataş.
Sən qıldın onu bəlayi-aləm,
Ol etdi məni şikəsteyi-ğəm.
Verdin ona hüsni-aləməfruz,
Saldı mənə ateşi-cahansuz.
21. Dərd ilə məni sən eylədin zar,
Mən qandanü Leyliyi-cəfakar.
Leyli ki, məni bəlayə saldı,
Bir görmək ilə qərarım aldı,
Yoxdur rəvişində ixtiyarı
Kim, döndərə aldığı qərarı.
22. Biçarədir öz işində ol həm,
Səndən bulunur bu zəxmə mərhəm.
Həm sən kərəmindən et əlacım,
Kəs ğeyri-kişidən ehtiyacım!
Ey dərdə qılan məni giriftar
Kimdir mənə səndən özgə ğəmxar?

15. Gördü ki, Ütarid sirr anlamır, başqa bir nəğmə qoşmağa başladı. Ağlayaraq ondan üz döndərib "Mərrixə" yalvarmağa başladı.

16. Ey şücaət bəxtinin valisi! Bütün aləm sənin qılıncına tabedir! Qələbə və zəfər sahibisən, silah əhlinin başının tacısan! Mən acizəm, düşmənim güclüdür, mən kimsəsizəm, yağı sitəmkardır.

17. Lütf elə, acizlərə kömək ol! Bəlanı kimsəsizlərdən uzaqlaşdır! Qılıncını çək, məni düşməndən qoru ki, yarıma həmnişin olum!" Gördü ki, kam çox uca yerdədir və nə "Tirin", nə də "Bəhramın" əli ona çatmır.

18. Qılıncla "Qələmdən" ümidini kəsib, yeganə Allahın dərgahına üz tutdu, yalvarışını və sirrini sitayiş elədiyinə dedi:

19. Ey qılınca yardımçı, qələmə rəhbər olan! Qulamı Bəhram*, nökəri Tir* (ox) olan. Ey arzu başına papaq tikən. Ey ruzi fərmanı yazan! Mən yazığa, ağlara rəhm elə. Ürək dərdimə şəfa ver!

20. Leylini pəriyə sən bənzətdin ki, o da canıma od vurdu! Sən onu aləmin bəlası etdin, o məni qəm şikəsti elədi. Sən ona aləmi işıqlandıran gözəllik verdin, o da məni dünyanı yandıran oda saldı.

21. Sən məni dərd ilə ağlar elədin, mən hara, cəfakar Leyli hara. Leyli məni bəlaya saldı, bir görmək ilə səbr-qərarımı aldı. Davranışı öz ixtiyarında deyil ki, qərarı dəyişdirsin.

22. O da öz işində çarəsizdir, onun da yarasının dərmanı səndədir. Sən kərəmində əlac elə, özgələrə ehtiyacı olmasın. Ey məni dərdə salan! Səndən başqa qəmxarım kimdir?

23. Çox-çox hükəmayə söylədim hal,
Təşxisi-mərəzdə oldular lal;
Bildim ki, həkimi-fərd sənsən!
Danayi-cəmii-dərd sənsən!
Gər dərd və gər dəva sənindir!
Hakim sənsən, riza sənindir!

24. Yə'ni ki, gətir kəmalə zövqüm,
Gündən-günə qıl ziyadə şövqüm!
Sal çeşmimə lə'linin xəyalın,
Ver təb'imə hüsnünün kəmalın.
Daim onu məndə zahir eylə,
Lütf et, iki surəti bir eylə!

25. Qədrim ğəmi içrə mö'təbər qıl!
Dərdin mənə ruzi, ol qədər qıl
Kim, kimsəyə ol olub müyəssər,
Kimsə mənə olmaya bərabər!

26.Görmək rüxün olmaz olsa məqdur,
Xunbar gözümdə olmasın nur.
Zövqi-ələmi olursa nayab,
Məcruh tənimdə olmasın tab.?

23. Çox həkimlərə halımı danışdım, təşxis edə bilmədilər, lal oldular. Bildim ki, dərdimin yeganə həkimi sənsən! Bütün dərdlərin bilicisisən! Dərd də sənindir, dərman da sənindir! Hakimsən, razılıq da sənindir!

24. Zövqümü kamala gətir, şövqümü gündən-günə artır! Gözümə lə'linin xəyalını sal, tə'bimə hüsnünün kamalını ver. Daim onu məndə zahir eylə. Lütf et, iki surəti bir eylə!

25. Qədrimi onun qəmində mö'təbər elə! Dərdini mənə o qədər ver ki, heç kəsə bunca pay düşməsin və heç kəs mənə tay ola bilməsin!

26. Əgər onun üzünü görmək mümkün olmasa, mənim qan ağlayan gözümdə nur olmasın. Onun dərdinin zövqü mənə qismət olmasa, qoy yaralı canımda güc olmasın.

## BU QƏZƏL MƏCNUNİ-HƏZİN-DİLİNDƏNDİR

Ya rəb, kəmali-mərtəbeyi-Mustafa həqi!
Sidqü səfayi-silsileyi-ənbiya həqi!

Səndən yetər vəlilərə tə'yidü iqtidar,
Sən müqtədayi-aləm edən rəhnüma həqi!

Düşməz hərimi-qürbünə biganələr yolu,
Ol barigahə məhrəm olan aşina həqi!

Qəhrindəki siyasətü asib xövf üçün,
Lütfündəki lətafətü-feyzü rəca həqi!

Üşşaqə yar qıldığı cövrü cəfa üçün,
Mə'şuqə aşiq etdiyi mehrü vəfa həqi!

Leylidə zahir eylədiyin feyzi-hüsn üçün,
Məcnunə verdiyin ğəmü dərdü bəla həqi!

Fəğrü fəna səadəti lütf et Füzuliyə,
Onda olan səadəti-fəqrü fəna həqi!

## BU QƏZƏL MƏCNUN YAZIĞIN DİLİNDƏNDİR

Allahım, Mustafa ucalığının kamilliyi eşqinə!
Peyğəmbərlər silsiləsinin sədaqət və həqiqəti eşqinə!

Sənsən böyüklərin qüdrətini artıran,
Sənin aləmdə başqalarına göstərdiyin yol eşqinə!

Sən yaxın olan müqəddəs yerə biganələrin yolu düşməz,
O uca mərtəbəyə mərhəm olan dost eşqinə!

Qəhrindəki cəza siyasət, zülm və qorxu eşqinə!
Rəhmindəki mərhəmət və lütf eşqinə!

Aşiqlərə yarın göstərdiyi zülm və cəfa üçün,
Mə'şuqəyə aşiqin etdiyi mehribanlıq və vəfa eşqinə!

Leylidə üzə çıxardığın gözəllik feyzi üçün,
Məcnuna verdiyin qəm, dərd, bəla eşqinə!

Füzuliyə kasıblıq və heçlik səadəti bəxş eylə,
Onda olan kasıblıq və heçlik səadəti eşqinə!

## TƏMAMİYİ-SÜXƏN

1. Eylərdi bu suz ilə münacat,
Möhnətlərə istəyib mükafat,
Kaçıldı güli-hədiqeyi-ruz,
Göstərdi günəş cəmali-firuz,
Mürği-dəmi-sübh çəkdi avaz,
Zaği-şəbi-tirə qıldı pərvaz.
2. Həm səfheyi-aləm oldu rövşən,
Həm daneyi-əncüm oldu xərmən;
Gün ayinədarı oldu gərdun,
Tökdü qədəminə dürri-məknun.
Sübh urdu səfayi-sidqdən dəm.
Açıldı güli-nişati-aləm.
3. Tə'siri-səfayi-cami-xurşid
Göy gülşənin etdi bəzmi-Cəmşid.
Lalə kimi dağə çıxdı Məcnun,
Nəzzarəyə açdı çeşmi-pürxun,
Gördü ki, gəlir nədimi-kamil,
Həmrazi-qədim Zeydi-qabil.
4. Ruxsarında nişatdən nur,
Bəhcət gözünə cəmalı mənzur.
Yox zərrəcə qüssəvü məlali,
Məcnunə əcəb göründü hali.
5. Sordu ki: - "Nədəndir inbisatın?
Adətcə görünməyən nişatın?
Məqsudinə dəstrəsmi oldun?
Dildarinə həmnəfəsmi oldun?
Nə qədr ilə sərbüलənd olubsan?
Noldu ki, nişatmənd olubsan?
6. Zeyd açdı dəri-xəzaneyi-raz:
- "Key türfə hümayi-övci-e'zaz!
Dün tövfi-diyari-yar qıldım,
Ol sərv yana güzar qıldım,
Tə'viz vəsiləsilə bir dəm,
Oldum hərəmi-visalə məhrəm.
7. Gördüm məhi-arizin ziyasız,
Ayineyi-təl'ətin cilasız.
Nə lə'li-ləbində qətreyi-ab,
Nə mah rüxündə zərreyi-tab.
Lə'li-tərə əşki gövhərəngiz,
Bərgi-gülə nərgisi gühərriz,

## SÖZÜN SONU

1. Bu yanğı ilə Allaha yalvarıb möhnətinin mükafatını diləyirdi ki, günəş qalib camalını göstərdi, gündüzün bağçasında güllər açıldı. Sübh dəminin quşu oxudu, gecənin qara qarğası uçub getdi.

2. Öncə üfüqlər qızardı, sonra göylərin üzü işıqlandı. Göylər günəşi alıb əlinə dürr saçmağa başladı, ulduz dənələri söndü, göylər günəşin ayinədarı oldu, onun qədəminə dürr saçdı. Sübh sədaqətin səfasından danışdı, dünya sevincinin külü açıldı.

3. Günəş camının tə'sirinin işığından göyün gülşəni Cəmşid məclisi tək bəzəndi. Məcnun lalə kimi dağa çıxdı, yaşlı gözlərini tamaşa üçün açdı. Gördü ki, ağıllı və köhnə sirdaşı qabiliyyətli Zeyd gəlir.

4. Onun üzü sevincdən yanırdı, şadlıq, gözlərinə də gözəllik vermişdi. Zərrəcə qüssəsi, dərdi yox idi. Halı Məcnuna çox qəribə göründü.

5. Soruşdu ki, - "Nədəndir bu fərəhlənmək? Adətən nəş'əli olmazdın? Arzunamı çatıbsan? Dildarınamı həmnəfəs olubsan? Nədən belə başıucasan, sevinirsən belə?"

6. Zeyd sirr xəzinəsinin gapısını açdı: - "Ey hamıya xoşbəxtlik paylayan Hüma quşu! Dünən sənin yarın tərəfə baş çəkdim. O sərv ilə görüşdüm. Dua bəhanəsilə bir anlığa hərəmə keçib, onunla danışdım.

7. Aya bənzər yanağını işıqsız, üzünün aynasını cilasız gördüm. Yaqut dodaqlarında su əsəri, ay üzündə taqət nişanəsi yox idi. İslaq dodaqlarına göz yaşları gövhər saçırdı. Gül ləçəklərinə bənzər yanaqlarına nərgiz gözlərindən dürr saçırdı.

8. Gördü məni etdi naləvü zar,
Raz açdı mənə ki: - "Ey vəfadar!
Düşdü ola Nəcdə rəhgüzarin,
Gördün ola halın ol fikarin,
Məcnunumu gördün isə, billah!
Eylə məni-zari ondan agah!
9. Necə keçər ola məhü sali?
Kim ola rəfiqi, nola hali?
Billah, güzər etsən ol yanayə,
Rəhm et, məni-zarü mübtəlayə!
Məndən ona şərhi-zə'fi-hal et!
Halın məni-xəstədən sual et!
0. Söylə necəsən hücumi-ğəmdən?
Tüğyani-məşəqqətü sitəmdən?
Matəmzədə olduğun eşitdim,
Qıldım yaxa çakü şiyvən etdim.
Ol sərv ki, çıxdı bu çəməndən,
Məndən getdi, deyil ki, səndən.
1. Ancaq bir ol idi kim, çəkib ğəm,
İstərdi məni səninlə həmdəm,
Çox gördü bizə sipehri-ğəddar
Yüz min əğyar içində bir yar.
Bir zülmdürür bü aşikarə,
Əldən nə gəlir, buna nə çarə?!
2. Bu dərdi ki, az deyil, yöküşdür,
Həm səbr edəlim ki, səbr xoşdur.
Mən, tut ki, müqəyyədi-həsarəm,
Məhbusi-hicabi-nəngü arəm.
Gər şəm'ə açılsa şərhi-razim,
Sayəmdən olur min ehtirazim.
3. Gər sayəmə söyləsəm ğəmi-dil,
Şəm'in həsədi gəlir müqabil.
Nə yazmağa namə ixtiyarim,
Nə etməyə ərz razdarim.
Qönçə kimiyəm məni-pərişan,
Ağzım dutulu, içim dolu qan.
4. Sən kim, şəhi-kişvəri-rizasan,
Hər kimə dilərsən aşinasan.
Yox hökmü sənə çü xamə ğeyrin,
Öz başınadır həmişə seyrin.
Aya, nə üçün qılırsan ehmal,
Hali-dilin eyləməzsən irsal?

8. Məni görüb nalə çəkdi. Sirrini açıb dedi: - "Ey vəfadar, bəlkə yolun Nəcd təpələrinə düşüb və o yaralının halını görübsən. Məcnunumu görübsənsə, and verirəm Allaha, mən ağlara ondan bir xəbər ver!

9. Ayı-günü necə keçir? Rəfiqi kimdir, halı necədir? Allah eşqinə, o yana gedib çıxsan, mən ağlar gözlüyə rəhm elə! Mənim zəif halımı ona anlat!

10. Mən xəstənin adından halını soruş! Söylə, qəmin hücumundan necəsən, sitəm və məşəqqətin tüğyanından necəsən? Matəmli olduğunu eşitdim, yaxamı cırdım, şivən elədim. O sərv ki, bu dünyadan köçdü, səndən deyil məndən getdi.

11. Ancaq tək bircə o qəm çəkib mənim səninlə həmdəm olmağımı istəyirdi. Qəddar fələk yüz min düşmən içində bir dostu bizə çox gördü. Bu açıq-aşkar zülmdür, əlimizdən nə gəlir, buna nə çarə?

12. Bu dərd az deyil, çoxdur, amma səbr edək ki, səbr xoşdur. Mən, bil ki, hasar içində bağlıyam, töhmət və həya dustağıyam. Əgər sirrim şama açılsa, kölgəmdən min dəfə ehtiyat edirəm.

13. Əgər ürək qəmimi kölgəmə söyləsəm, qarşısında şam həsəd aparır. Nə məktub yazmağa ixtiyarım, nə də sirrimi söyləməyə bir sirdaşım var. Mən pərişan, qönçə kimiyəm-ağzım bağlı, içim dolu qandır.

14. Sən ki, razılıq ölkəsinin şahısan, kimin ilə istəsən aşinasan. Sənə qələm kimi başqasının hökmü yoxdur, gəzməyin həmişə öz əlindədir. Axı niyə ləngiyirsən, ürəyinin halını mənə bildirmirsən.

15. Öz nəzmi-lətifü dilkəşindən
Məzmuni-ibarəti-xoşundan,
Lütf ilə qılıb həmişə təhrir,
Göndərmədiyin deyilmi təqsir?
Səndən degiləm bu işdə razi,
Hala kərəm et xilafi-mazi,
Nəzm eyləyibən bəyani-halın,
Şərhi-rüxi-zərdü əşki-alın,
İrsal edə gör məni-həzinə,
Kol cövhərə can edim xəzinə.

15. Öz zərif, ürəkaçan şe'rindən, xoş ibarələrdən, lütf edib həmişə yazıb göndərmədiyin günah deyilmi? Bu işdə səndən razı deyiləm. Keçmişlərin əksinə indi kərəm öz halının bəyanını, saralmış üzünün al göz yaşını şer'lə mən yazığa yaz göndər ki, o cövhərə canımı xəzinə edim.

16. Əlfazi olub həmişə zikrim,
Bu kargəh içrə bikri-fikrim,
Tərzi ğəm edəndə canə təsvir,
Ol nəqşdən ola çaşnigir".
Həm hali-dilin qılırdı izhar,
Həm bu ğəzəli qılırdı təkrar:

16. Burada fikrim odur ki, qəm canıma yük olanda o şe'rini oxuyub təskinlik tapam." Həm ürəyinin halını anladırdı, həm də bu qəzəli təkrar-təkrar deyirdi:

## BU ĞƏZƏL
## LEYLİYİ-DİLPƏZİRİNDİR

Neçün ol şəm" kafur üzrə kilkin mişkbar etməz?
Yazıb bir rüq'ə min lütfə bizi ümmidvar etməz?

Mənimlə dust lütfün az edib, çox tə'n edər düşmən,
Neçün lütf eyləyib düşmənləri bir şərmsar etməz?

Gəl, ey göz, yar xəttin namədə görmək həvəs qılma
Ki, xətti-namə dəf'i-dərdi-hicri-xətti-yar etməz!

Kəbutərdən umardım naməsin, gör zə'f-tale kim,
Görüb ahım odun məndən yana ol həm güzar etməz.

Füzuli, nameyi-dildar bir tə'vizdir guya
Kim, onsuz xəstədillər xatiri bir dəm qərar etməz.

## BU QƏZƏL
## SEVİMLİ LEYLİNİNDİR

Nə üçün o   qələmin ağ səhifəyə  ətir saçmaz?
Bir məktub ilə bizi min mərhəmətə ümidvar etməz?

Dost mənə mərhəmətini az, düşmənsə tə'nəsini çox edər,
Niyə mərhəmət göstərib düşmənləri bir utandırmaz?

Gəl, ey gözüm, yar xəttini məktubda görmək həvəsinə düşmə
Çünki,  məktubun xətti yarın üzündən ayrılıq dərdini yox etməz?

Göyərçindən məktubunu umurdum, taleyimin gücsüzlüyünə bax ki,
Ahımın odunu görüb, o da mən tərəfə hərlənməz.

Füzuli, sevgili məktubu guya bir duadır ki,
Onsuz ürəyi xəstələrin xatiri bir dəm rahat olmaz.

## TƏMAMİYİ-SÜXƏN

1. Məcnun ki, eşitdi ol pəyami,
Bəxti-mütəmərrid oldu rami.
İqbalına e'tiqadı oldu,
Dildarına e'timadı oldu.
Xunabi-sirişkdən çəkib nəm,
Gülzari-zəmiri oldu xürrəm.
Həm güldü üzü çirağlar tək,
Həm könlü açıldı dağlar tək;
2. Zeydə dedi: - "Ey rəfiqi-sadiq!
Mən vəhşiyə həmdəmi-müvafiq!
Çün müjdeyi-mərhəmət yetirdin,
Yarım xəbərin mənə gətirdin,
Məndən həm ona yetir sənalər,
Ərz eylə dürudlər, dualər.
Xaki-dərinə yetir niyazım,
Dərgahinə ərz eylə razım:
3. "Key canimə dadlu dərdü dağı,
Könlüm fərəhi, gözüm çirağı!
Lillahülhəmd yar imişsən,
Mən istədiyimcə var imişsən.
Əhdində vəfa bulundu axir,
Şəhdində şəfa bulundu axir.
4. Bildim ki, məni sevirsən, ey mah!
Əhsənt, əhsənt, barəkallah!
Lütfün xəbəri qərarım aldı,
Şirin sözün ixtiyarım aldı.
Lütfün eşidib olur cigər tab,
Şirin sözünə gətirməzəm tab.
5. Ah, ər qılıb özgə rəsm bünyad,
Nagəh tutasan təriqi-bidad,
Təlx ola sözün misali-badə,
Lütf olmaya, qəhr ola aradə...
Xuban işi cövr ilə cəfadir,
Səndən görünən mənə vəfadir.
6. Qurban sənə özgə nazəninlər,
İdrakınə yüz min afərinlər.
Kimsə çü sənə vəfadə yetməz,
Canın sənə kimsə versə itməz.
Mə'şuqə ikən olub vəfadar,
Aşiqliyini həm etdin izhar.

## SÖZÜN SONU

1. Məcnun bu sözləri eşidən kimi dönük bəxti rahatlandı, iqbalına ümid, dildarına inam yarandı. Gözünün qan-yaşından su içib, könlünün gülzarı sevindi. Üzü çıraq kimi güldü, könlü dağlar kimi açıldı, Zeydə dedi:

2. "Ey sadiq dostum! Mənim kimi vəhşiyə həmdəm, mərhəmət müjdəsi gətirdin, yarımdan mənə xəbər yetirdin. Mənim də alqışlarımı ona çatdır, salam-duamı yetir, arzu-istəyimi ayağının torpağına sər və qapısında söylə ki:

3. "Ey dağı canıma dadlı olan, könlümün fərəhi, gözümün çırağı! Şükürlər Allaha yar imişsən, mənim istəyimcə var imişsən. Axır ki, əhdində vəfa tapıldı, şəhdində şəfa tapıldı axır.

4. Bildim ki, məni sevirsən, ey ay üzlüm! Əhsən, əhsən sənə, barəkallah! Lütfünün xəbəri - qərarımı, şirin sözün - ixtiyarımı əlimdən aldı.

Rəhmini eşidəndə ciyərimə güc gəldi, şirin sözünə sə döze bilmirəm.

5. Vay o gündən ki, özgə bir şəklə düşüb zalımlığın yolunu tutasan, sözün şərab kimi acı ola, aramızda lütf yox, qəzəb ola! Gözəllərin işi zülm və əzabdır, səndən isə gördüyüm vəfadır.

6. Qurban sənə özgə nazəninlər. İdrakına yüz min afərinlər. Kimsə vəfada sənə çata bilmədiyi üçün, canını sənə qurban verən heç nə itirməz. Mə'şuqə ikən vəfadar olub, aşiqliyini bildirdin.

7. Aşiq der imiş mənə xəlayiq,
Görmən buna həm özümü layiq.
Mən naqisəm, ey hərifi-qabil,
Sənsən rəhi-eşq içində kamil.
Təhsin ki, yeganeyi-zəmansan,
Can vermək olur sənə ki, cansan.
8. Hər şuxdə gər olaydı bu tövr,
Sən olmaz idin yeganeyi-dövr.
Gər ğeyrə bu hal olaydı məqdur,
Sən olmaz idin cahanda məşhur.
Yad eyləməyindən olmuşam şad,
Sən şad olasan həmişə, mən yad.
9. Ha böylə məni-həzini şad et!
Gah-gah tərəhhüm eylə, yad et!
Ey sərvi-səmənbəri-güləndam,
Taraci-mətai-səbrü aram!
Ey xosrovi-kişvəri-məlahət!
Məhtabi-şəbi-nişatü rahət!
10. Çün bəndəyə rəhmət eylər oldun,
İzhari-məhəbbət eylər oldun,
Minbə'd təriqi-mehr tutğıl,
Əvvəlki təriqini unutğıl!
Qoyma çıxa həsrət ilə canım,
Həddən ötə naləvü fəğanım!
11. Meyli-məni zarü biqərar et,
Gahi bu yanayə bir güzar et!
Həmdərdim isən, mənimlə yar ol!
Həmdərdliyin yox isə, var ol!
Sən - öylə müqimi-məsnədi-naz,
Mən - böylə bəlavü dərdə dəmsaz;
Sən - məhfili eyş kamikarı,
Mən - guşeyi-dərd dilfigarı.
12. Eşq içrə, gözüm, rəvamıdır bu,
Rahü rəvişi-vəfamıdır, bu?
Gər doğru isə vəfadə lafın,
Məndən nə üçündür inhirafın?
Gəl, rəf edəlim ğəmi-fəraqi,
Yandıralım oda iştiyaqi.
13. Olsun dünü gün mənimlə seyrin.
Çün mən səninəm, sən olma ğeyrin!
Vər İbni Səlam mane olsa,
Səddi-rəhi-vəsl vaqe olsa,
Bildir, qılayın siyah bəxtin,
Bir ah ilə tarümar təxtin".
14. Çün razi-dilin tükətdi ol yar,
Zeyd eylədi əzmi-kuyi-dildar.
Pərvanə sözün deyib çırağə,
Bülbül xəbərin yetirdi bağə.

7. El mənə aşiq deyirmiş, mən heç özümü buna layiq görmürəm. Mən naqisəm, ey ləyaqətli dostum. Sən eşq yolunda kamilsən. Əhsən sənə! Zəmanənin bir dənəsisən, cansan, sənə can vermək olar.

8. Bütün gözəllər belə olsaydı, sən zəmanənin yeganəsi olmazdın. Başqasında da bu hal görünsəydi, sən dünyada məşhur olmazdın. Məni yad eləməyindən şad olmuşam; mən həmişə yad olum, sənsə şad.

9. Bax beləcə mən yazığı şad et! Rəhm elə, hərdən yada sal! Ey sərv-yasəmən boylu güləndam, səbrimi, rahatlığımı tarac eyləyən! Ey məlahət ölkəsinin şahı! Rahatlıq və sevinc gecəsinin ayı!

10. İndi ki, bəndənə rəhmin gəldi, məhəbbətindən söz açdın, bundan sonra bu mərhəmət yolunu tut, əvvəlki yolunu unut! Qoyma canım həsrət ilə çıxsın, fəğanım-naləm həddən ötsün!

11. Mən ağlar səbirsizə meyl et, hərdən bu yana da güzar sal! Həmdərdimsənsə, mənə yar ol, həmdərdliyin yoxdursa, yaşa, var ol! Sən həmişəlik naz taxtında əyləşən-sən, mən isə belə bir dərdə, bəlaya dəmsa-zam. Sən şadlıq məclisindən kam alansan, mən dərd-qəm küncünün yaralısıyam.

12. Gözüm, eşqdə bu rəvadırmı, bu davranış vəfa yoludurmu? Əgər vəfada sözün doğrudursa, bəs məndən bu dönüklüyün nə üçündür? Gəl ayrılıq dərdini yox edək, şövqümüzə od verək.

13. Gecəli-gündüzlü seyrin mənimlə olsun, əgər mən səninəmsə, sən də başqasının olma! Əgər Ibn Səlam mane olsa, vüsal yolunda hədd yaransa, bildir. Bəxtini qara eyləyim, bir ah ilə təxti tarmar olsun".

14. Məcnun ürək arzusunu deyib qurtaran kimi Zeyd dildar yurduna tərəf yol tutdu. Pərvanənin sözünü çırağa, bülbülün xəbərini bağa yetirdi.

**BU, İBNİ SƏLAMIN KEYFİYYƏTİ-VƏFATIDIR VƏ LEYLİNİN OL BƏLADAN NƏCATIDIR**

1. Saqi, fələkin gör inqilabın!
Göstər qədəh içrə mey hübabın!
Mey ayineyi-cahannümadır,
Xaki zər edən bu kimiyadır.
2. Bu faidə bəs deyilmi ondan
Kim, fariğ edər ğəmi-cahandan?
Bir xabü xəyal imiş bu aləm,
Bu xabü xəyalə olma xürrəm!
Əhvali-zəmanə münqəlibdir,
Ondan xirəd əhli müctənibdir.
3. Ğəm matəmin eyləyəndə bünyad,
Neyyah bu növ çəkdi fəryad
Kim, İbni yanar Səlami etdi gərdun
Amaci-xədəngi-ahi-Məcnun.
4. Ol səddi götürməyə aradən
Əşk oldu rəvan iki yanadən.
Ol növrəsi-natəvan dəmadəm
Şövq ilə çəkərdi möhnətü ğəm.
Həsrət ələmi yaman ələmdir,
Ğəm bədriqeyi-rəhi-ədəmdir.
5. Dərdü ğəmi-həsrəti-nihani
Sərvi-qədin etdi xizərani.
Üz urdu pozulmağa tilismi,
Bir ğayətə yetdi zə'fi-cismi
Kim, peykəri nəqşi-bəstər oldu,
Rə'na qədi bəstər istər oldu.
6. Gün-gündən olub xərab halı,
Qalmadı sağalmaq ehtimalı.
Dərdinə dəva bulunmaz oldu,
Rəncinə şəfa bulunmaz oldu.
Əndişeyi-ömrü oldu batil,
Can verdivü həqqə oldu vasil.
7. Kimdir ki, gəlib cəhanə getməz?
Kim kamil olur zəvalə yetməz?
Budur rəhü rəsmi ruzigarın
Kim, ola xəzani hər baharın.
8. Leylini gətirməyə fəğanə
Ol vaqeə oldu bir bəhanə.
Matəm tutub etdi ol giriftar
Dırnağı ilə üzünü əfgar.
Çak etdi fərağət ilə camə,
Faş etdi fəğani xasü amə.

**BU, İBN SƏLAMIN ÖLÜMÜNÜN TƏSVİRİDİR VƏ LEYLİNİN O BƏLADAN QURTARMASIDIR**

1. Saqi, fələyin inqilabını gör! Qədəh içində meyin köpüklərin göstər! Mey dünyanı göstərən bir güzgüdür, torpağı qızıla çevirən kimyadır.

2. Ondan bu fayda azdırmı ki, hələ insanı dünya qəmindən də azad etsin?! Aləm bir yuxu və xəyal imiş, bu yuxu və xəyalla sevinmə! Zəmanənin halı dəyişəndir, ağıllılar ona aldanmazlar.

3. Qəm matəm quranda, növhəxan belə fəryad çəkdi ki, İbni Səlamı göylər Məcnunun ahının oxuna hədəf etdi.

4. Aradakı səddi götürmək üçün göz yaşı iki yandan yola çıxdı. O natəvan gənc arası kəsilmədən yanaraq şövqlə qəm, əzabını çəkirdi. Həsrət dərdi yaman dərddir. Qəm heçlik yolunun bələdçisidir.

5. Gizli həsrətin dərdi-qəmi onun sərv qəddini naziltdi. Tilsimi pozulmağa başladı və canı elə bir hala düşdü ki, bəxt ulduzu onu yatağa saldı. Rə'na qəddi yataq istər oldu.

6. Günü-gündən halı pisləşdi. Sağalmaq umudu qalmadı. Dərdinə dava, xəstəliyinə əlac tapılmadı. Ömrünün qayğılaryı batil oldu, can verib haqq evinə köçdü.

7. Dünyaya gəlib ancaq getməyən kimdir? Hansı kamil bu zavala yetmir? Dünyanın yolu, qaydası budur — hər baharın payızı var.

8.Leylini fəğana gətirmək üçün bu hadisə bir bəhanə oldu. O dərdə düşmüş matəm tutub, dırnağı ilə üzünü cırdı, paltarını parçaladı, dərdini sadələrə və seçilmişlərə göstərdi.

9. Yandırdı evin, qopardı təxtin,
Taraci-fənayə verdi rəxtin.
Geysuyi-müənbər etdi bərbad,
Əflakə yetirdi ahü fəryad.
Gərdun kimi rəxti niylə urdu,
Ataş kimi başa kül sovurdu.

10. Derlər bu idi ərəbdə adət
Kim, ər əgər ölsə, qalsa övrət,
Bir il-iki il tutardı matəm,
Fəryadü fəğan edib dəmadəm.
Xoş gəldi bu adət ol nigarə,
Fəryadü fəğanə buldu çarə.

11. Matəmkədə eylədi məqamın,
Matəmdə keçirdi sübhü şamın.
Bir neçə gün onda ağlayıb zar,
Həm ata evinə döndü naçar.
Əmma dünü gün fəğan edərdi,
Xunabi-ciyər rəvan edərdi.

12. Fəryadə gələndə gahü bigah,
Öz könlündə deyərdi ol mah
Kim: - "İbn Sələmə rəhməti-həq,
Eşqim rəvişinə verdi rövnəq.
Rəf eylədi pərdeyi-müdara,
Pünhan ğəmim etdi aşikara".

13. Ol vaqeədən olub xəbərdar,
Tutdu rəhi-dəşt Zeydi-ğəmxar.
Gördü ki, şikəstəhal Məcnun
Durmuş dədü dam içində məhzun.
Çün verdi sələm, qıldı e'lam
Kim, İbn Sələmə netdi əyyam.

14. Verdi bu qəziyyədən bəşarət
Kim: - "Qıldı müarizin xəsarət,
Dəhr İbn Sələmi qıldı pamal,
Leyli öz evinə döndü xoşhal".
Məcnun çəkib ah, qıldı nalə,
Əfğan edib ağladı bu halə.

15. Heyrətlərə düşdü Zeydi-ğafil,
Bu halət ona göründü müşkil
Kim, fövti-rəqib eşitsə aşiq,
Gülmək gərək, ağlamaq nə layiq?
Təhqiqi-bəyani-hal qıldı,
Ol vaqeədən sual qıldı.

9. Evini yandırdı, təxtini uçurdu, pal-paltarını yox etdi. Ənbər ətirli saçlarını dağıtdı, ahını göylərə yüksəltdi. Göylər kimi göy geyindi, od kimi başına kül ələdi.

10. Deyirlər ərəbdə belə bir adət varmış ki, ər öləndə arvad, bir-iki il matəm tutarmış, fəryad-fəğan edərmiş. O gözələ bu adət xoş gəldi, ah-fəğan etməyə çarə tapdı.

11. Yurdunu yas yerinə çevirdi, gecəsini, gündüzünü matəmdə keçirdi. Bir neçə gün orada ağlayıb, əlacsız ata evinə döndü. Amma yenə də gecəli-gündüzlü fəğandaydı, ciyərinin qanlı yaşını axıdırdı.

12. Vaxtlı-vaxtsız fəryad elədikcə o ayüzlü ürəyində deyərdi: "İbn Sələma Allahın rəhməti, eşqimin yoluna işıq saldı. Sün'i yola getmək pərdəsini aradan götürdü, gizli qəmimi aşkara çıxardı".

13. Zeyd qəmxar bu hadisədən xəbərdar olub səhraya üz tutdu. Gördü ki, üzgün Məcnun vəhşilər arasında dərd-bəla içində dayanıb. Salam verib, İbn Sələmın ölüm xəbərini e'lan etdi.

14. Bu qəziyyəni söyləyərək dedi ki: "Rəqibin xəstələndi və zaman İbn Sələmı məhv elədi, Leylisə əhvalı xoş öz evinə döndü". Məcnun ah-nalə çəkdi, fəryad qopardı, bu hala ağladı.

15. Qafil Zeyd heyrətləndi və bu haldan heç nə anlamadı. Çünki rəqibinin ölümünü eşidən aşiq gülməlidir, ağlamaq nə üçündür? Bu işi başa düşmək istədi və Məcnundan soruşdu:

16. Məcnun dedi: - "Ey vəfalı yarım!
Yoxdurmu bu yolda nəngü arım?
Cananəyə can verən yetibdir,
Can verməyən arada itibdir.
Ol dostum idi, degildi düşmən,
Həm ol ona aşiq idi, həm mən.
17. Ol canını verdi, vasil oldu,
Öz mərtəbəsində kamil oldu.
Nəqsim mənim ermədi kəmalə,
Eyb eyləmə ağlasam bu halə".

16. Məcnun dedi: - "Ey vəfalı dostum! Heç bu yolda abrım-həyam yoxdurmu? Canana can verən tapılıb, can verməyən arada itibdir. O mənim dostum idi, düşmənim deyildi. Leyliyə həm o aşiq idi, həm də mən.

17. O, canını tapşırıb öldü və öz yolunda kamil çıxdı. Mən bu kamala çata bilmədim, ağlamağımı eyib tutma.

## ĞƏZƏL

Aşiq oldur kim, qılır canın fəda cananına,
Meyli-canan etməsin hər kim ki, qıymaz canına.

Canını canana verməkdir kəmali aşiqin,
Verməyən can e'tiraf etmək gərək nöqsanına.

Vəsl əyyamı verib canana can rahət bulan,
Yeydir ondan kim, salır canın ğəmi-hicranına.

Eşq rəsmin aşiq öyrənmək gərək pərvanədən
Kim, yanar gördükdə şəm'in atəşi-suzanına.

Fani ol eşq içrə kim, bənzər fənasi aşiqin
Feyzi-cavid ilə Xizrin çeşmeyi-heyvanına!

Eşq dərdinin dəvasi qabili-dərman deyil,
Tərki-can derlər bu dərdin mö'təbər dərmanına.

Hiç kim canan üçün can verməyə laf etməsin
Kim, gəlibdir bu sifət ancaq Füzuli şanına.

## QƏZƏL

Aşiq odur ki, canını cananına qurban verir,
Kim ki, canına qıymayacaq canana meyl göstərməsin.

Aşiqin yetkinliyi onun canını cananına verməyindədir.
Bunu eyləyə bilməyən nöqsanını boynuna almalıdır.

Vüsal günlərində canana can verib rahatlıq tapandan
O kəs yaxşıdır ki,canını hicran qəminə salır.

Sevməyin qaydasını aşiq gərək pərvanədən öyrənsin,
O, şamı görən kimi onun alovunda-atəşində yanar.

Eşqdə məhv ol ki, aşiqin heçliyi
Əbədi ne'mətiylə Xızrın dirilik suyuna bənzəyir!

Eşq dərdinin əlacı dərmana qabil deyil,
Bu dərdin inanılmış dərmanına candan keçmək deyərlər.

Heç kəs canan üçün can verməkdən söz açmasın,
Bu sifət qismət olub ancaq Füzuli şanına.

## BU, LEYLİNİN İBN SƏLAMDAN SONRA MACƏRASIDIR VƏ ZAVİYEYİ-MÖHNƏTDƏ VAQE OLAN BƏLASIDIR

1. Çün ata evinə döndü Leyli,
Əfğanə olub həmişə meyli,
Tutmuşdu təriqi-əhli-matəm,
Təcdidi-əza qılıb dəmadəm,
Hər qanda bilirdi var bir zar,
Ənduhü müsibətə giriftar,
Cəm edib olurdu əncümənsaz,
Eylərdi sürudi-növhə ağaz.

2. Gər İbn Səlam idi bəhanə,
Məcnun idi bais ol fəğanə.
Ağzında idi bir özgə zikri,
Könlündə idi bir özgə fikri.
İzhar qılırdı özgə adın,
Pünhani edərdi özgə yadın.

3. Bu rəng ilə daim ol pərizad,
Eylərdi fərağət ilə fəryad.
Suzi-dilinə gətirməyib tab,
Bir gecə dağıldı yarü əshab,
Ancaq ona şəm' qaldı həmdəm,
Söndürdü bir ah ilə onu həm.

4. Yə'ni nə rəva şəbi-siyahim,
Şəm' istəyə ğeyri-bərqi-ahim.
Tənha qalıb etdi naleyi-zar,
Dərdü ğəmə qıldı əczin izhar:

5. - "Key dərdü ğəmi-zəmanə, billah!
Olman bu gecə mənimlə həmrah!
Tənhalıq ilə mən eylərəm xu,
Siz özgə müsahibə tutun ru!"
Gördü ğəmü dərdə yox nihayət,
Qıldı şəbi-tirədən şikayət:

6. - "Key bəxti-siyahımın nəziri,
Aşüftə qılan məni-əsiri!
Əvvəl yox idi sənin qərarın,
Seyr ilə keçərdi ruzigarın.
Hala nə üçün qərar edibsən,
Tərki-reviş ixtiyar edibsən.

7. Sərmənziləmi özün yetirdin?
Ya zülmət içində yol itirdin?
Matəmzədəsən, siyəh libasın,
Kimdən ola, nişədir bu yasın?

## BU, LEYLİNİN İBN SƏLAMDAN SONRA MACƏRASIDIR VƏ MÖHNƏT KÜNCÜNDƏ ÜZ VERƏN BƏLASIDIR

1. Leyli ata evinə döndükdən sonra meyli həmişə fəğandaydı. Matəmlilərin yolunu tutaraq, gündən-günə harada bir ağlayan, qəm-qüssəyə düşmüş var idisə, bir yerə toplayıb başçılıq edirdi, növhə oxuyurdu.

2. Bəhanəsi İbn Səlam idisə də, fəryadının baisi Məcnun idi. Ağzında bir özgəsini yad edirdi, ürəyində bir başqa fikir idi. Birinin adını deyib, başqasını yada salırdı.

3. Bu qayda ilə o pərizad daima sakitcə fəryad edirdi. Bir gecə ətrafındakılar Leylinin ürək yanğısına dözə bilməyib dağılışdılar və onun yeganə həmdəmi şam oldu. Bir ah ilə onu da söndürdü.

4. Yə'ni rəvadırmı ki, mənim bu qara gecəm ahımın işığından başqa, bir şam da istəsin. Təkcə qalıb, naləylə ağladı və çəkdiklərini dərd və ğəmə danışdı:

5. "Ey zamanın dərdi, qəmi, Allah adına! Bu gecə mənimlə olmayın! Mən tənhalığımla bir yerdə qalmaq istəyirəm, siz özgə həmsöhbətə üz tutun". Gördü ki, dərd-qəm sona yetmir, başladı qaranlıq gecədən şikayətə:

6. "Ey qara bəxtimin tayı, mən əsiri pərişan edən! Əvvəl sənin sakitliyin yox idi, vaxtın gəzməkdə keçərdi. İndi niyə bir yerdə qərar tutubsan, adəti yolunu atıbsan.

7. Menzil başına özünü yetiribsən və ya qaranlıqda yolunu itiribsən? Yaslısan, libasın qaradır. Kimdəndir, niyədir bu yasın?

8. Dərdü ələmim dənizi daşdı,
Seylabi-bəla başımdan aşdı.
Tiri-fələkə nişanə oldum,
Tahuneyi-çərxə danə oldum.
Matəmkədədir bu gecə aləm,
Mən bəxti qara bir əhli-matəm.
Nə səbr qalıbdurur, nə aram,
Bilmən ki, nolur mənə sərəncam.
9. Olmuş bu gecə təmam kövkəb
Azarım üçün fələkdə Əqrəb.
Sübh ayinəsini jəng tutmuş,
Feyzi-səhəri fələk unutmuş.
Ey sübh, sənin nə oldu halın?
Dəm urmağa qalmamış məcalın?
10. Könlün xoş isə, təbəssüm eylə!
Mehrin var isə, tərəhhüm eylə!
Fəryadıma həmdəm et xorusu,
Avazıma qoş sədayi-kusu,
Mürği-səhəri gətir zəbanə,
Göstər dəmi-sübhdən nişanə!"
11. Çox ağladı, etdi naləvü zar,
Dərdi-dili-zarın etdi təkrar.
Gördü mədədinə sübh yetməz,
Şəb dərdi-dilinə çarə etməz.
Üz tutdu ona ki, feyzi-ami,
Çəkmiş bu mədarə sübhü şami.
12. Razi-dili-zarın etdi ağaz:
- "Key vaqifi-halü arifi-raz!
Yoxdur ğəmi-dərdimə nihayət,
Ğəmdən kimə eyləyim şikayət?
Ğəm bihədü mən bəsi zəifəm,
Mən böylə ğəmə qaçan hərifəm.
13. Ya ver mənə möhnətimdə taqət,
Ya taqətim olduğunca möhnət.
Gər cameyi-səbrim eyləsəm çak,
Hökmün yolu görünür xətərnak.
Vər könlümə versəm istimalət,
Taqətcə deyil ğəmü məlalət.
14. Namusdan eyləsəm cüdalıq,
Məcnun ilə qılsam aşinalıq,
Qorxum bu ki, ismət ola pamal,
Fərmanə müvafiq olmaya hal.
Qılsam bu həvadə hifzi-namus,
Mə'mureyi-vəslim ola məhrus.

8. Dərdimin, ələmimin dənizi daşdı, bəla seli başımdan aşdı, fələyin oxuna nişan oldum, çərxin dəyirmanına danə oldum. Bu gecə aləm yasxanadır, mən bəxti qarasa bir matəm əhliyəm. Nə səbrim qalıb, nə qərarım, bilmirəm ki, mənim sonum nə olacaq.

9. Bu gecə göylərdəki bütün ulduzlar mənə əzab vermək üçün "Əqrəb" olublar. Səhərinin güzgüsünü pas tutmuş, fələk səhərin feyzini unutmuş. Ey sübh, sənin halın niyə belə oldu? Danışmağına imkanın qalmamış?

10. Könlün xoşdursa, gülümsə! Rəhmin vardırsa, mərhəmət elə! Fəryadıma xoruzu həmdəm elə, təbillərin səsini səsimə qoş, səhər quşunu dilə gətir, dan yerinin nişanını göstər!"

11. Çox ağladı nalə-zar elədi, ağlar ürəyinin dərdini dönə-dönə dedi: Gördü ki, sübh köməyinə yetmir, gecə də ürək dərdinə çarə etmir, üzünü tutdu bütün feyzləri, sübh və axşamı yaradana.

12. Ağlar ürəyinin sirrini belə söylədi: - "Ey ariflərin halından, sirrindən xəbərdar! Dərdimin, qəmimin sonu yoxdur, qəmimdən kimə şikayət eləyim? Qəmimin həddi yoxdur, mənsə olduqca zəifəm, mən belə qəmə necə dözə bilərəm!

13. Ya mənə möhnətimdə taqət ver, ya da taqətimə görə möhnət ver. Əgər bütün səbrimin libasını cırsam, qorxuram hökmün qəzəbinə gələm. Əgər ürəkdən qəmimi desəm, dərdim qəmim taqətimə görə deyil.

14. Namusdan üz çevirsəm, Məcnunla aşinalıq etsəm, qorxuram ismətim tapdalana və halım fərmana uyğun olmaya. Bu həvəsdə ikən namusumu gözləsəm, vəsl gərdəyim o dünyada qurulacaqdır.

15. Qorxum bu ki, dudi-ahi-Məcnun
Əhvalımı eyləyə digərgun.
Sadiqlərin ahi mö'təbərdir,
Ondan həzər etməmək xətərdir.
Ol öylə, bu böylə, neyləyim, vay!..
Bilmən məni-acizə nədir ray?
16. Ya rəb, mütəhəyyirəm məni-zar,
Möhnətlərə olmuşam giriftar!
Sərmənzili-əmnə rah bilmən,
Səndən özgə pənah bilmən.
Gör badeyi-ğəflət ilə mədhuş,
Qıl pərdeyi-lütfünü xətapuş!
17. Derlər ki, sitəmrəsidə Məcnun
Olmuş məni-mübtəlayə məftun.
Mən bisərü pa ona nə layiq?
Kim hüsnümə ola kimsə aşiq?
Mən zərreyi-xarü xaksarəm,
Gərdi-rəhi-xaki-rəhgüzarəm.
18. Ruhum ki, bədəndədir, - sənindir,
Hər nəş'ə ki, məndədir, - sənindir.
Gəncineyi-hüsnünə əminəm,
Sənsən səbəbim ki, nazəninəm.
Ya rəb, məded et ki, bu əmanət
Məhfuz ola ta dəmi-qiyamət!
Ta qürbə təvəccöh etdiyim çağ,
Alnım açıq olavü üzüm ağ!"

15. Qorxuram ki, Məcnun ahının tüstüsü halımı poza. Sadiqlərin ahı mö'təbərdir, ondan qorxmamaq xətərlidir. Orası elə, burası belə, vay, bəs neyləyim! Bilmirəm, mən acizə məsləhət nədir?

16. Ya rəb, çaşmışam, mən yazıq, möhnətlərə düşmüşəm! Sonuncu rahatlıq mənzilinin yolunu bilmirəm. Səndən başqa pənahım yoxdur. Bilməzlik badəsilə mənim huşumu apar. Öz lütfünün pərdəsilə mənim xətalarımın üstünü ört.

17. Deyirlər ki, məzlum Məcnun mən əsirin məftunu olmuş. Mən başsız və ayaqsız ona nə layiqəm, hüsnümə kiminsə aşiq olmasına layiqəmmi? Mən tikanam, çör-çöpəm, yol torpağının tozuyam.

18. Bədəndəki ruhum sənindir, hər məndə olan nəş'ə sənindir. Sənin gözəlliyinin xəzinəsinə inanıram. Mənim zərifliyimin də səbəbi sənsən. Ya rəbb, bu əmanəti qiyamətə kimi qorumada mənə kömək ol ki, vüsal yoluna qədəm qoyarkən alnım açıq, üzüm ağ olsun!"

## BU ĞƏZƏL LEYLİ DİLİNDƏNDİR

Ya rəb, kəmali-bargəhi-kibriya həqi!
Yə'ni füruği-nuri-rüxi-Mustəfa həqi!

Qıl ğərqə bəhri-eşqə vücudim səfinəsin,
Fərmani-Xizrə Musa edən iqtida həqi!

Sübhi-vüsalə eylə bədəl şami-hicrimi,
Sübhün dəmindəki nəfəsi-dilgüşa həqi!

Dərdü bəlamı rahi-məhəbbətdə qılma kəm,
Rahi-məhəbbətindəki dərdü bəla həqi!

Əhli-zəlalətəm, mənə göstər hidayətin,
Ehdayi-rahi-rast qılan rəhnüma həqi!

Ənduhü dərdə könlümü sahib-təhəmmül et,
Dərdə təhəmmül eyləyən əhli-riza həqi!

Ixlasım et duayə Füzuli kimi dürüst,
Dərgahdə icabətə layiq dua həqi!

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Tanrım, müqəddəslər sarayının kamalı haqqına
Yə'ni Mustafa üzünün nurunun parıltısı haqqına!

Vücudumun gəmisini eşq dənizində batır,
Xızrın fərmanı ilə Musanın getdiyi yol haqqına!

Mənim ayrılıq gecəmi vüsal sübhü ilə dəyişdir,
Dan yerinin könül açan nəfəsi haqqına!

Məhəbbət yolunda dərdimi, bəlamı az eləmə,
Sənə məhəbbətin yolundakı dərd və bəla haqqına!
Yolunu azmışlardanam, məni düz yola qaytar,
Doğru yol bağışlayan rəhbər haqqına!

Dərd və qəm üçün ürəyimə dözüm ver,
Dərdə dözən doğru yol əhli haqqına!

Məni Füzuli kimi sədaqətlə dua elətdir,
Dərgahında qəbula layiq dua haqqına!



## TƏMAMİYİ-SÜXƏN

1. Əcz ilə dua qılırdı ol mah,
İzhari-niyaz edib ki, nagah
Çəkdi cərəs ərrəhilə avaz,
Rəsmi-hüdi etdi sariban saz.
Köç oldu, açıldı bargəhlər,
Bəxtilərə məhd çəkdi məhlər.
2. Bir məhmilə girdi Leyliyi-zar,
Kuhi-ğəmin etdi naqəyə bar.
Əfğani edib cərəs ünün pəst,
Eşqi meyi etdi naqəni məst.

## SÖZÜN SONU

1. O ay aciz-aciz dua edib, arzusunu söylədiyi vaxt gözlənilmədən köç zəngi çalındı və sariban köç yolunu tutdu. Köç başladı, barigahlar açıldı, gəcavələrdə gözəllər əyləşdi.

2. Ağlar Leyli də bir kəcavəyə mindi və dişi dəvəyə öz qəm dağını yüklədi. Onun fəryadı zınqırovun səsini batırdı və eşqinin meyi dəvəni də məşt elədi.

## BU, LEYLİNİN NAQƏYƏ ƏRZİ-RAZIDIR VƏ ZƏBANİ-HAL İLƏ İZHARİ-NİYAZIDIR

1. Çün naqədə gördü nəş'əyi-hal,
Qıldı ona həm bəyani-əhval:
- "Key ğaliyə muyü ənbərinbuy,
Gülçöhrəvü xar-xar, xoşxuy.
Ey başı açıq, ayağı yalın,
Bulmuş neçə gəz hərəm visalın.
2. Sövdazədə nişədir dimağın?
Köksündə nədir bu əsgi dağın?
Kimdən sənə yetdi zülmü bidad,
Hər ləhzə nədir fəğanü fəryad?
Üşşaq təriqidir təriqin.
Gər aşiq isən mənəm rəfiqin.
3. Nalan ğəmi-eşqi-yardansan,
Sən dəxi bizim qətardansan.
Mən kimi, yox əldə ixtiyarın.
Bir özgə əlindədir məharın.
Çün düşdü səninlə ittifaqım.
Rəhm eylə mənə, gör iştiyaqım
4. Lütf eylə, binayi-kari-xeyr et,
Məcnunum olan diyarə səyr et!
Bu şiyftəyi yetir ol ayə,
Bu dərdi yetişdir ol dəvayə".
Nagah, gedərdi, oldu bihuş,
Mütləq özün eylədi fəramuş.
5. Bihuşluğunda düşdü ol nur,
Həmrahi olan güruhdən dur.
Ol növ idi zülməti-şəbi-tar
Kim, olmadı sariban xəbərdar.
Çün gəldi özünə ol pərivəş,
Oldu bu qəziyyədən müşəvvəş.
6. Göz açdı, özünü gördü itmiş,
Həmrahi buraxmış onu getmiş.
Dərd üzrə müzaəf oldu dərdi,
Tərpətdi həyuni-rəhnəvərdi.
Çox cəhd ilə eylədi təkapu,
Çox yol arayıb yügürdü hər su,
Nə rah, nə rahibər bulundu,
Nə qafilədən əsər bulundu.

## BU, LEYLİNİN DƏVƏYƏ SİRRİNİ AÇMASIDIR VƏ HAL DİLİYLƏ YALVARIŞIDIR

1. Dəvənin halını görüb Leyli öz halından ona söz açdı: "Ey tükləri ənbər ətirli, çöhrəsi gül, tikan yayən, xasiyyəti xoş! Ey başıaçıq, ayağı yalın, nə qədər qadınlar səninlə yol getmiş!

2. Eşq vurğunusan, keyfin necədir? Köksündəki bu köhnə dag nədir? Kim sənə zülm edib, hər ləhzədə bu fəğanın nədir? Yolun aşiqlər yoludur. Əgər aşiqsənsə, dostun mənəm.

3. Sən də yar eşqindən, qəmindən ağlayırsan, sən də bizim cərgədənsən. Mənim kimi sənin də ixtiyarın özündə deyil. İpin başqasının əlindədir. İndi ki, səninlə bir yolun yolçusuyuq, rəhm elə, mənə, şövqümü gör.

4. Lütf eylə, xeyir iş gör, Məcnunum olan yerə üz tut! Bu vurğunu o aya yetir, bu dərdi o davaya yetir". Birdən yol gedə-gedə huşunu itirdi, özünü unutdu.

5. Bihuş halda o işıq, yol, yoldaşlarından aralı düşdü və gecənin qaranlığı elə idi ki, heç sariban da xəbər tutmadı.

6. Elə ki, o pəri özünə gəldi, bu qəzanı bildi. Gözünü açıb özünü itmiş gördü. Yoldaşları onu qoyub getmişdilər. Dərdinin üstünə dərd gəldi. Yol gedən dəvəni tərpətdi, özünü o tərəfə, bu tərəfə vurdu, yol axtardı, nə yol, nə yolçu tapıldı, nə də karvandan bir əsər göründü.

7. Tənha yürür oldu ol səmənbər,
Zülmətdə misali-mahi-ənvər.
Çün seyri-fələkdə Leyliyi-mah
Şəb qafiləyi itirdi nagah,
Leyli sifətində gün çıxıb fərd,
Cəmmazəyə çəkdi məhmili-zərd.
8. Düşdü güzər ol səmən üzarə,
Məcnuni-həzin olan diyarə.
Hər yan nigəran gəzərdi ol mah,
Bir şəxsi-həzin göründü nagah,
Sormağa əlameyi-mənazil,
Ol şəxsi-həzinə oldu mail.
9. Lütf ilə təkəllüm etdi ağaz:
- "Kimsən" - deyibən yetirdi avaz.
Baş qaldırıb ol əsiri-məhzun,
Döndərdi cavab ona ki: - "Məcnun!"
Leyli dedi: - "Ey özünə məğrur,
Haşa deyə əjdəha sözün mur!
Haşa deyə zağ, bülbüləm mən,
Ya laf ura xar kim, güləm mən!"
10. Məcnun dedi: - "Ey düri-yeganə,
Məcnuna bilirmisən nişanə?
Ol şiyftənin nədir nişani,
Gördükdə nədən bilirsən ani?"
11. Leyli dedi: - "Ol pəriliqadır,
Rüxsarlə qəddi dilrübadır.
Sən şiyftəsən, əsiri-matəm,
Rüxsarı şikəstə, qaməti xəm.
Sən xarsən, ol əzizi-aləm,
Sən bisərü pasən, ol müəzzəm".
12. Məcnun dedi: - "Əhli-eşq olur xar,
Hüsn əhlinədir səfa səzavar".
13. Leyli dedi: - "Ey bəhanəpərdaz!
Qeydi-dili-zarimə füsunsaz!
Peykər, tutalım, töküldü ğəmdən,
Ya qamətin oldu xəm sitəmdən,
Məcnunu deyərlər əhli-idrak,
Əş'ari lətifü ləhcəsi pak,
Səndə ğanı ol ədayi-dilsuz,
Əş'ari-hekayəti-diləfruz?"

7. O gözəl təkcə getməli oldu. Elə bil zülmətdə qızıldan yaranmış ay gedirdi. Ay üzlü Leyli göylərə tamaşa etdiyi üçün qaranlıqda karvanı itirmişdi. Leylinin sifəti gün kimi yanıb dəvəni sarı işığa qərq etdi.

8. Yol yazıq Məcnunun diyarına gəlib çıxdı. Nigaran o yanı-bu yanı gəzərkən ayüzlünün gözünə birdən bir zəif şəxs göründü və ona mail oldu.

9. Yol-iz soruşmaq lütflə mərhəmətlə xəbər aldı ki, "kimsən?" O yazıq, dərd əsiri, başını qaldırıb cavab verdi ki, "Məcnun"! Leyli dedi: - "Ey özündən razı!" Qarışqa özünə əjdaha deyə bilməz! Qarğa özünü bülbül adlandırmaz, ya da tikan "güləm" deyə bilməz!"

10. Məcnun dedi: - "Ey yeganə inci! Sən Məcnunun bir nişanını bilirsənmi? O aşiqin nişanı nədir ki, gördükdə onu tanıyasan?"

11. Leyli dedi: - "O pərisifətdir. Üzü də, qəddi də dilrübadır. Sən tikansan, o dünyanın əzizidir, sən səfil və sərgardansan, o əzəmətlidir.

12. Məcnun dedi: - "Eşq əhli xar olur, səfa gözəllərə yaraşır".

13. Leyli dedi: - "Ey bəhanəçi! Ağlar ürəyimi ovsunlayan! Tutaq ki, görünüşün-yaraşıqın qəmdən tökülüb, ya qamətini zülm əyib. Məcnun idrak əhli sayılır. Şe'rləri incə, dili pakdır, hanı səndə o ürək yandıran əda, ürək işıqlandıran şe'r və hekayətlər?"

14. Məcnun dedi: - "Əhli-hal olur lal,
Bəsdir nəmi-əşk şahidi-hal.
Tərtibi-ibarətü fəsahət,
Eşq əhlinədir dəlili-rahət.
Rahətdən olan mənim kimi dur,
Gər samit ola, deyilmi mə'zur?"

15. Leyli dedi: - "Çün sənə şəkim var,
Məcnun isən eylə halın izhar;
Leyliyi sevərsən eylə bünyad
Bir şe'r, keçən zamanın et yad!"

14. Məcnun dedi: - "Hal əhli lal olur. Göz yaşlarının onların halına şahid olmağı bəsdir. İbarələr və gözəl sözlər eşq əhli üçün sadəcə sübutdur. Rahatlıqdan mənim kimi uzaq olanın lal olması üzürlü deyilmi?"

15. Leyli dedi: — "Sənə şübhə edirəm, Məcnunsansa, halını anlat, Leylini sevirsənsə, danış və bir şe'rlə keçmişləri yad et".

## BU, MƏCNUNUN LEYLİYƏ İZHARİ-HALİ-ZAR ETDİYİDİR

1. Məcnuni-həzin eşitdi sövgənd,
Gördü onu şe'rə arizumənd,
Təfsili-ğəminə verdi icmal,
Qıldı ona ərzi-sureti-hal:
2. "Key səbzəyi-dərdimə verən ab!
Sərriştəyi-razdan açan tab!
Sorma necə keçdi ruzigarın,
Eşq içrə nə oldu hali-zarın?
Dildar ğəminmi söyləyim, ah,
Ya pəndi-mühibbü tə'ni-bədxah.
3. Çəkdim neçə gün cəfayi-məktəb,
Hər ruz məşəqqət ilə ta şəb.
Axır ki, çox oldu tə'ni-əğyar,
Ayrıldı məni-şikəstədən yar.
Faş oldu çü aləmə fəsanəm,
Tədbirimə düşdü atəm, anəm.
4. Gəh değdeğeyi-təbib gördüm,
Gəh sə'y ilə Kə'bəyə yügürdüm.
Açılmadı hiç babdən bab,
Tədbirimə aciz oldu əhbab.
Gəh Novfələ eylədim təzərrö,
Feyzində bulunmadı təvəqqö.
5. Gəh ibn Səlamə yar olub yar,
Verdi dili-mübtəlayə azar.
Ğəh Zeyd pəyamına inandım,
Hər və'də ki, verdi, doğru sandım,
Ümmid ilə ömrüm oldu zayə,
6. Halım betər etdi zə'fi-talə.
Əlqissə, vücudim oldu bərbad,
Bir ləhzə fələkdən olmadım şad".
Könlünə qılıb fəraq tə'sir,
Bir türfə ğəzəl həm etdi təqrir:

## BU, MƏCNUNUN LEYLİYƏ ÖZ AĞLAR HALINDAN DANIŞDIĞIDIR

1. Yazıq Məcnun and eşitdi və onun şe'r dinləmək arzusunu gördü, müfəssəl qəmini qısaca təsvir edərək əhvalından ona danışdı:

2. - "Ey dərdimin çəməninə su səpən! Sirrimin kələfinin dolaşığını açan! Günlərimin necə keçdiyini, eşqdən halımın necə olduğunu sorma. Dildarımın qəmindənmi, sevənlərin nəsihətindənmi, ya da düşmənlərin tə'nəsindənmi danışım.

3. Neçə günlərlə məktəb cəfası keçdim, hər günüm gecəyə qədər zülm, əzab oldu. Axırda düşmən tə'nəsi güc gəldi, yarım mən xəstədən ayrıldı. Əfsanəm aləmə aşkar oldu, atam-anam mənə çarə axtardı.

4. Gah həkim çildağı gördüm, gah sə'y ilə Kə'bəyə getdim, lakin heç yandan bir qapı açılmadı, dostlarım əlacımda aciz oldu. Gah Novfələ yalvardım, arzuma çatmadım.

5. Gah yarım İbn Səlama yar olub, bəlalı ürəyimə ağrı verdim. Gah Zeydin sözlərinə inandım, verdiyi və'dləri doğru sandım.

6. Ümid ilə ömrüm zaya getdi, taleyin hökmü halımı xarab etdi. Qısası, vücudum oldu bərbad, bir an fələkdən şad olmadım". Ayrılıq könlünü sıxdı bir gözəl qəzəl söylədi:

## ĞƏZƏL

Ah kim, bir dəm fələk rə'yimcə dövran etmədi,
Vəsl dərmanilə dəf'i-dərdi-hicran etmədi.

Yardən min dərdi-dil çəkdim, bu həm bir dərd kim,
Bildi min dərdi-dilim, bir dərdə dərman etmədi.

Vadiyi-ğürbətdə can verdim, məni ol şahi-hüsn
Bir gecə xani-vüsali üzrə mehman etmədi.

Dustlar, çaki-giribanım görüb eyb eyləmən!
Kol gülü kim gördü kim, çaki-giriban etmədi!

Fəqr mülkün tut gər istərsən kəmali-səltənət
Kim, bu mülkün fəthini fəğfurü xaqan etmədi.

Tiği-bidad ilə hər dəm qanımı tökmək nədir?
Ey fələk, hər kim dəm urdu eşqdən qan etmədi.

Əhdü peyman etdi yarım kim: "sənə yaram", vəli
Yarlıq vəqti vəfayi-əhdü peyman etmədi.

Əql meydanını zindani-bəla bilməz hənuz
Kim ki, bir müddət cünun mülkünü seyran etmədi.

Sirri-eşqin etmədi ancaq Füzuli aşikar,
Bu mübarək işi hər kim etdi, pünhan etmədi.

## QƏZƏL

Ah ki, fələk bir an rə'yimcə dövran etmədi,
Vəsl dərmanı ilə, ayrılıq dərdimi yox etmədi.

Yardan min ürək dərdi çəkdim, bu da bir dərd ki,
Ürəyimin min dərdini bildi, bir dərdə dərman etmədi.

Qürbət vadisində can verdim, o gözəllik şahı
Məni bir gecə vüsal süfrəsində qonaq etmədi.

Dostlar, yaxamı yırtılmış görüb eyb tutmayın!
O gülü kim gördü ki, yaxasını yırtmadı!

Kamal dövlətinə yetmək istəsən, fəgr mülkündən yapış!
Çünki bu mülkü nə fəğfur, nə də xaqan fəth etmədi!
Zülm xəncəri ilə hər dəm qanımı tökmək nədir?
Ey fələk, kim eşqdən danışdı, o qan etmədi.

Yarım əhd və peyman elədi ki, "sənə yaram", amma
Yarlıq vaxtı əhd-peymanına vəfa etmədi.
Əql meydanını bəla zindanı tək bilməz heç vaxt
Kim ki, dəlilik mülkünü bir müddət seyran etmədi.
Ancaq Füzuli eşqinin sirrini aşkar etmədi,
Bu mübarək işi kim gördüsə, pünhan etmədi.

## BU, LEYLİNİN MƏCNUNDAN XƏBƏRDAR OLDUĞUDUR VƏ MƏTAİ-VƏSLİNƏ NƏQDİ-CANLA XİRİDAR OLDUĞUDUR

1. Cün bildi kim olduğunu Leyli,
Rüxsarına axdı əşk seyli.
Giryan dedi: - "Ey gözüm çirağı,
Vəhşilərə el, mənimlə yağı.
Sən mən dediyim həbib imişsən,
Dərdi-dilimə təbib imişsən.
2. Sənsən dünü gün dilimdə zikrim,
Könlümdə olan xəyalü fikrim.
Gər tanıya bilmədim rəvadır,
Məstəm mənü məst işi xətadır.
Kimsə ki, özündən ola ğafil,
Bir özgəyi bilməyə nə qabil.
3. Ol dəm ki, dimağa yetdi buyin.
Göz gördü şüai-mahi-ruyin,
Can bixəbər oldu, əql şeyda,
Tən qıldı min iztirab peyda,
Dəryayi-təhəyyürə olub ğərq,
Əğyardən etmədim səni fərq
4. Mə'zur tut, ey sənəm, bu halım,
Tə'n eyləmə, vermə infialım.
Sənsiz mən idim şikəstəxatir,
Yüz şükr, sənə yetişdim axir.
Gülzari-ümidim oldu siyrab,
Ya rəb, bu xəyaldırmı, ya xab?
5. Eyşü tərəbim çirağı yandı,
Bəxtim yuxudan məgər oyandı?
Ey dil ki, edərdin ahü- nalə,
Daim nigəran olub vüsalə,
Ha, dövləti-vəslü zövqi-didar!
Billah, dəxi etmə naləvü zar!
6. Ey didə, töküb sirişki-gülgun,
Hər dəm der idin ki: - "Qanı Məcnun?"
Mənzurun olubdur ol səmənbər,
Qıl məqdəminə nisar gövhər!
Ey can ki, çəkərdin intizarı,
Görmək diləyib həmişə yarı;
7. Yetdin ona, gəl çıx indi təndən,
Get yarə, kəs ixtilatı məndən".
Dərdini deyirkən ol pərizad
Suz ilə bu şe'ri etdi bünyad:

## BU, LEYLİNİN MƏCNUNDAN XƏBƏRDAR OLDUĞUDUR VƏ CANIN QİYMƏTİ BAHASINA VƏSLƏ ÇATMAQ İSTƏMƏSİDİR

1. Elə ki, Leyli onun kim olduğunu bildi, gözlərindən üzünə yaş seli axdı, ağlayaraq dedi: "Ey gözümün çırağı! Vəhşilərlə el, mənimlə yad olan! Sən mən dediyim dostum imişsən, ürək dərdimin təbibiymişsən.

2. Gecəli-gündüzlü dilimin sözü, könlümün xəyalı, fikri sənsən. Səni tanıya bilmədiyim üzürlüdür, məstəm mən, məstin işi xətadır. Özündən xəbərsiz birisi özgəni necə tanısın?

3. Onda ki, ətrini duydum, gözlərim ay üzünün şüasını seçdi, canım bixəbər oldu, əqlim aşiq oldu, canımdan min əzab oyandı, heyranlıq dəryasında batdım, səni yadlardan seçə bilmədim.

4. Bu halımı ey gözəlim, bağışla, tə'nə vurma, halımı pozma. Sənsiz mən ürəyi sınıq idim, yüz şükr axır ki, sənə yetişdim. Ümid gülşənimə su çiləndi. Ay Allah, bu xəyaldırmı, yuxudurmu?

5. Şadlığımın çırağı yandı, yoxsa yatmış baxtım oyandı? Ey ürəyim, vüsal həsrətilə nalə çəkirdin, buyur, bu da ürək zövqünün vəsl dövləti! Allah eşqinə daha nalə çəkib ağlama!

6. Ey gözüm, gül rəngli yaş töküb, hər dəm "hanı Məcnun?" deyirdin. O yasəmən sənins qarşındadır, qədəmlərinə gövhər yağdır! Ey intizar çəkən canım, həmişə yarı görmək istəyirdin.

7. Ona yetişmisən, gəl indi bədənimdən çıx get, yarımın ol, məndən əl çək". O pərizad dərdini deyərkən yanğı ilə bu şe'ri qoşdu:

## BU ĞƏZƏL LEYLİ DİLİNDƏNDİR

Açmadı könlüm fələk, ta bağrımı qan etmədi,
Qılmadı xürrəm məni, ta zarü giryan etmədi.

Qılmadan bidad ilə yüz parə pürxün könlümü,
Bu çəməndə gül kimi bir ləhzə xəndan etmədi.

Şükr kim, verdi fələk kamım, məni nomid edib,
Şiveyi-mehrü məhəbbətdən peşiman etmədi.

Dərd yoxdur kimsədə, yoxsa təbibi-feyzi-eşq,
Kimdə gördü dərd kim, ol dərdə dərman etmədi.

Səbr yoxdur mərdümi-aləmdə, vər nə ruzigar,
Qansı müşküldür ki, tədric ilə asan etmədi.

Tutdu seylabi-dü çeşmim yer üzün, amma xoşa
Kim, binasın səbrimin ol seyl viran etmədi.

Eşq sevdasında sud etdin mətai-vəsldən,
Ey Füzuli, can verən canana nöqsan etmədi.

## BU QƏZƏL LEYLİNİN DİLİNDƏNDİR

Fələk bağrımı qan etməyincə ürəyimi açmadı,
Məni ağlar, gözü yaşlı qılmayınca şad etmədi.

Zülm ilə qanla dolu könlümü yüz para qılmadan
Bu çəməndə gül kimi bir anlığa da gülər etmədi.

Şükr ki, fələk məni naümid eləmədi, kamıma yetirdi.
Mehr-məhəbbət nazından peşman etmədi.
Heç kəsin dərdi yoxdur, yoxsa eşq feyzinin təbibi,
Kimdə dərd gördü ki, dərdinə dərman etmədi.
Dünyanın insanlarında səbr yoxdur, yoxsa ruzigar,
Hansı çətinlikdir ki, tədriclə asan etmədi.
Göz yaşımın seli yer üzünü tutdu, amma xoşdur ki,
O sel səbrimin binasını viran etmədi.
Eşq sevdasında sənin qazancın vəsl oldu,
Ey Füzuli, canana canını verən heç vaxt səhv etmədi.

## BU, MƏCNUNİ-HEYRANIN NİHAYƏTƏ-HEYRƏTİDİR VƏ LEYLİDƏN İSTİĞNA İLƏ ĞƏFLƏTİDİR

1. Məcnun dedi: - "Ey açan mənə raz,
Lütfilə qılan məni sərəfraz!
Kimsən? Mənə zahir eylə adın!
Bu badiyədə nədir muradın?
Can tazələnir fəsahətindən,
Bu ləhceyi-pürməlahətindən.
2. Xülqi xoşü ləfzi canfəzasən,
Böylə görünür ki, aşinasən.
Billah, nə diyardən gəlirsən?
Nə rahigüzardən gəlirsən?
Gər lalə isən, nə dağdansan?
Vər susən isən, nə bağdansan?
3. Şirin-şirin təkəllümün var,
Hali-dilimə tərəhhümün var.
Biganədən ummazın bu hali,
Bir ülfətdən deyil bu xali.
Bihudə deyil bu könlüm almaq,
Gəlmək, başım üzrə sayə salmaq.
4. Əql olsa idi mənimlə həmrah,
Əhvalından olurdum agah.
Ğəm könlümü etməseydi bitab,
Göz pərdəsi olmayaydı xunab,
Ğəflət xələlindən ayrılardım,
Əlbəttə, kim olduğun bilərdim.
Çün məndə yox ehtimali-idrak,
Sən söylə özün ki, kimsən, ey pak?"

## BU HEYRAN MƏCNUNUN HEYRƏTİNİN SON DƏRƏCƏSİDİR VƏ LEYLİYƏ BİGANƏLİYİDİR

1. Məcnun dedi: - "Ey sirrini mənə açan, lütf ilə başımı ucaldan, kimsən? Adını mənə de! Bu səhrada axtardığın nədir? Gözəl və aydın danışığından, məlahətli nitqindən canım təzələnir.

2. Xasiyyətinin xoşluğundan, sözlərinin gözəlliyindən görürəm ki, mənə dostsan. Allaha and verirəm, söylə nə diyardan, hansı yoldan gəlirsən? Laləsənsə hansı dağdansan? Süsənsənsə, hansı bağdansan?

3. Şirin-şirin söyləməyin var, ürəyimin halına rəhmin var. Biganədən belə hal ummazdım, bu bir ülfətsiz deyil. Könlümü almağın, gəlib başım üstünə kölgəni salmağın boş yerə deyil.

4. Ağlım başımda olsaydı, sənin əhvalını anlayardım. Könlüm qəmdən gücünü itirməsəydi, gözlərimi qan-yaş tutmasaydı, qəflət zindanından ayrılardım, əlbəttə, kim olduğunu bilərdim. Görürsən ki, məndə anlamaq ehtimalı yoxdur, özün kim olduğunu söylə, ey pak".

**BU ĞƏZƏL MƏCNUN DİLİNDƏNDİR**

Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, meyü səhba nədir.

Gərçi canandan dili-şeyda üçün kam istərəm,
Sorsa canan, bilməzəm kami-dili-şeyda nədir.

Vəsldən çün aşiqi müstəğni eylər bir vüsal,
Aşiqə mə'şuqdən hərdəm bu istiğna nədir?

Hikməti-dünyavü mafiha bilən arif deyil,
Arif oldur bilməyə dünyavü mafiha nədir?

Ahü fəryadın, Füzuli, incidibdir aləmi,
Gər bəlayi-eşq ilə xoşnud isən, ğovğa nədir?

**BU QƏZƏL MƏCNUNUN DİLİNDƏNDİR**

Elə sərməstəm ki, dərk etmirəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, mey və qədəh nədir.

Hərçənd canandan aşiq ürəyim üçün kam istərəm,
Canan soruşsa deyə bilmərəm ki, vurğun ürəyimin kamı nədir?

Aşiqi vəsl ilə doyuran təkcə vüsaldırsa,
Mə'şuqdan hərdəm aşiqə bu e'tinasızlıq nədir?

Dünyanın varlığının hikmətini bilən arif deyil,
Arif o kəsdir ki, heç bilməyə dünya və varlıq nədir?

Ahın, fəryadın, Füzuli, incidibdir aləmi,
Əgər eşq bəlası ilə halın xoşdursa, qovğa nədir?

## CƏVABİ-LEYLİ

1. Leyli dedi: - "Ey qərineyi-ruh,
Kami-dili-mübtəlayi-məcruh!
Müjdə ki, zəmanə verdi kamın,
Doldu meyi-işrət ilə camın,
Müjdə ki, müyəssər oldu məqsud,
2. Sevda ilə axır eylədin sud.
Müjdə ki, muradın oldu hasil,
Məqsudə səni həq etdi vasil.
Leyli mənəm, arizuyi-canın,
Kami-dili-zarü natəvanın.
3. Müştaqi-cəmal idin həmişə,
Möhtaci-vüsal idin həmişə,
Hala ki, müyəssər oldu didar,
Təqsirü-təəllül etmə zinhar!
Gör dövləti-vəslimi ğənimət,
Gəl yanıma, fövt qılma fürsət!
4. Dil nəzri-vüsali-qamətindir!
Vər canım isə, əmanətindir!
Çün düşdü məcalı, etmə ehmal,
Gəl nəzrini tut, əmanətin al!
Gər xəstə isən, mənəm təbibin,
Vər aşiq isən, mənəm həbibin.
5. Gəl bəzmi-vüsalə məhrəm olğıl!
Bir ləhzə mənimlə həmdəm olğıl!
Ver nərgisə lalə ilə rövnəq,
Reyhani-tər ilə ziybi-zənbəq!
Firuzəyi et qərini-yaqut,
Qıl tutiyə qəndi-nabdən qut!
Peyvəndi-gül eylə ərğəvani,
Xizrə yetir abi zindəgani.
6. Vər aşiqi-mübtəla deyilsən,
Məcruhi-ğəmü bəla deyilsən,
Təqlid ilə göstərib əlamət,
Qılma özünü, məni məlamət!
Bir əqlü fərasət eylə peyda,
Ancaq bizi etmə xəlqə risva!
Mə'şuqinə aşiq eyləmək naz".
Təqrib ilə ol büti-dilara
Bir türfə ğəzəl həm etdi inşa:

## LEYLİNİN CAVABI

1. Leyli dedi: "Ey ruhumun bərabəri, vurğun və yaralı qəlbin kamı! Mücdə ver, zəmanə səni kama yetirib, camın sevinc şərabı ilə dolub. Müjdə ver, məqsədinə çatıbsan.

2. Axır ki, sevdandan faydalanıbsan. Müjdə ki, muradına yetibsən, haq səni məqsədinə çatdırıb. Canının istəyi, ağlar ürəyinin diləyi natəvan Leyli mənəm.

3. Həmişə gözəlliyimin aşiqi və vüsal möhtacı idin. Indi ki, sevdiyinə çatıbsan, saqın, bəhanə axtarma, yubanma! Vəslimin dövlətini qənimət bil, gəl yanıma, fürsəti əldən vermə!

4. Ürəyim sənin qamətinin visalının nəzridir. Canım isə, sənin əmanətindir. Fürsət düşdüsə, ləngimə gəl, nəzirini tut, əmanətini al! Əgər xəstəsənsə - həkimin mənəm, əgər aşiqsənsə - sevgilin mənəm.

5. Gəl vüsal məclisinə məhrəm ol! Bircə anlığa mənimlə həmdəm ol! Nərgizə lalədən bəzək ver, təzə reyhanla zanbaqı bəzə! Füruzəni yaquta cala. Eşq tutisini şərbətlə doyuzdur! Ərğəvanın ilə qızıl gülü peyvənd elə! Dirilik suyunu Xızıra yetir.

6. Yox əgər başı bəlalı aşiq deyilsənsə, dərd-bəla yaralısı deyilsənsə, oyunbazlıq edib özünü də, məni də danlama! Bir əql-fərasət göstər, amma bizi də el içində rüsvay eləmə!

7. Ey gül, bu mənə deyilmidir nəng
Kim, olmayasan mənimlə həmrəng?
Mən ərz edəm afitabi-rüxsar,
Sən qılmayasan hərarət izhar?
Mən cam tutam, diyəm ki, "gəl, al!"
Sən durmayasan ayağə filhal!
8. İzhari-cəmalın eyləmək gül,
Bülbül görüb eyləmək təğafül?
Çox təcrübə etmişəm, olur az,

7. Ey gül, mənimlə həmrəng olmamağın mənə eyib deyilmi? Mən danışam, üzüm günəş kimi yana, sən isə heç bir istilik göstərməyəsən? Mən cam tutam, deyəm ki, gəl al - sən dərhal ayağa qalxmayasan?

8. Gül öz camalını göstərə, bülbül isə özünü görməzliyə qoya! Çox az görmüşəm ki, aşiq mə'şuqəsinə naz eləsin". O gözəl büt burada hala münasib türfə bir qəzəl də dedi:

### BU ĞƏZƏL LEYLİ DİLİNDƏNDİR

Ey qılan şeyda məni, məndən bu istiqna nədir?
Nişə sormazsan ki, əhvali-dili-şeyda nədir?

Gər mənə xəlq İçrə pərva qılmadın, mə'zursan,
Böylə tənhalıqda qılmazsan mənə pərva, nədir?

Səhldir gər bilməyib halım, tərəhhüm qılmamaq,
Halımı bilmək, tərəhhüm qılmamaq əmdə nədir?

Gül təmənnasında derlər bülbülün qovğaları,
Çün gülü gördükdə qılmaz meyl, bu qovğa nədir?

Ol pəri mütləq məni-rüsvayə qılmaz iltifat,
Ey Füzuli, bilməzəm cürmi-məni-rüsva nədir?

### BU QƏZƏL LEYLİNİN DİLİNDƏNDİR

Ey məni aşiq eyləyən, məndən bu üz döndərmək nədir?
Niyə soruşmursan ki, vurğun ürəyimin halı nədir?
Mənə xalq içində yanaşmırsansa, üzürlüsən,
Belə təklikdə mənə can atmadığın nədir?

Halımı bilməyib mənə rəhm etməmək asandır,
Halımı bilib mənə rəhmin gəlmədiyinin səbəbi nədir?
Deyirlər bülbülün bütün qovğaları gül təmənnasilədir.
Əgər gülü gördükdə meyl eləmirsə, bu qovğa nədir?
Yəqin ki, o pəri mən rüsvaya iltifat eləmir,
Ey Füzuli, bilmirəm mən rüsvayın günahı nədir?

## BU, LEYLİYƏ MƏCNUNUN ISTİĞNASIDIR VI İSBATI-SƏFAYİ-İMLASIDIR

1. Məcnun dedi:- "Ey büti-pərivəş!
Xaşaki-zəifə urma atəş!
Yandırmağıma yetər xəyalın,
Yoxdur mənə taqəti-visalın.
Zinhar gətirmə, ey səmənbər,
Ayineyi-arizin bərabər.
Bir zərrəyə kim, vücud yoxdur,
Ayinədən ona sud yoxdur.

2. Ol gün ki, gözümdə var idi nur,
Gözdən üzünü yaşırdın, ey hur!
Hala ki, nəzarən oldu müşkil,
Durmaq nə üçün mənə müqabil?
Eşq etdi binayi-vəsli möhkəm,
Mə'nidə məni səninlə həmdəm.

3. Rəf oldu bu e'tibari-surət,
Haşa ki, olam şikari-surət.
Ləzzət rüxi-yari-dilsitandan,
Candır bulan, ey diriğ candan!..
Canım gedəli bəsi zamandır,
Cismimdəki indi özgə candır.

4. Sənsən hala tənimdə canım,
Gözdə nurim, ciyərdə qanım.
Məndən bəri eylədin məni sən.
Ərzə kimə eyləyim səni mən?
Məndə olan aşikar sənsən,
Mən xud yoxam, ol ki var, sənsən!

5. Daim sənə məndədir təcəlli,
Mən ğeyrdən olmuşam təsəlli.
Gər mən mən isəm, nəsən sən, ey yar?
Vər sən sən isən, nəyəm məni-zar?
Çün mən olubam səninlə məmlu,
Vəhdət rəvişində xoş deyil bu
Kim, dişrədə istəyəm nişanın,
Bir özgə məkan biləm məkanın.

6. Əvvəl bu işi edəndə bünyad,
Mən tifl idimü zəmanə ustad.
Etmişdi sənə məni müqəyyəd,
Guya oxudurdu dərsi-əbcəd.
Hala qılıbam kəmal hasil,
Əbcəd səbəqin oxurmu kamil?

## BU, LEYLİYƏ MƏCNUNUN E'TİNASIZLIĞIDIR VƏ ONUN DEDİKLİRİNİN SAFLIĞINA SÜBUTDUR

1. Məcnun dedi: - "Ey pəriyəbənzər sənəm! Bu zəif çör-çöpə od vurma! Məni yandırmaq üçün xəyalın da bəsdir. Məndə sənin vüsalına taqət yoxdur. Saqın, ey yasəmən üzlüm, üzünün güzgüsünü göstərmə. Bir zərrənin ki, vücudu yoxdur, ona güzgüdən fayda olmaz.

2. Gözlərimdə nur olan günlərdə üzünü məndən gizləyirdin, ey huri! indi sənə baxmağım çətin olan vaxt qarşımda dayanmağın nə üçündür? Eşqim vəsl binasını möhkəm eyləyib, mə'nada mən sənə bağlanmışam..

3. Mənim artıq surətə e'tibarım yoxdur, heç istəmirəm də surətə ov olam. Ürəyimin məskəni olan yarın üzündən ləzzət alan canım idi. Canım əfsus ki, çoxdan əlimdən gedib. İndi cismimdəki özgə candır.

4. Sənsən indi bədənimdə canım, gözümdə nurum, ciyərimdə qanım. Sən məni məndən aldın, səndən kimə şikayət eyləyim mən? Mən özüm yoxam, məndə var olan sənsən.

5. Sən daima məndə görünsən, mən ondan da təsəlli alıram. Əgər mən mənəmsə, sən nəsən, ey yar? Əgər sən sənsənsə, onda mən yazıq nəyəm? Mən səninlə dolu olduğum halda, heç birlik yolunda doğru olardımı sənin nişanını içimdən kənarda axtaram, sənin özgə bir yerdə olduğunu düşünəm?

6. Əvvəl bu işin binası qoyulanda mən uşaq idim, zəmanə ustad. O məni sənə bağlamışdı və elə bil ki, əlifba oxudurdu. İndi böyüyüb ağıllanmışam. Kamil də əvcəd dərsi oxuyarmı?

7. Çün yetdi kəmalə sərxəti-eşq,
Sərxət görüb ancaq eylərəm məşq.
Risvalığa çün mən etmişəm ad,
Sən həm bu süluki etmə bünyad.
Tut pərdeyi-ismət içrə aram,
Risvay mənəm, sən ol nikunam!
8. "Məcnun" mənə derlər əhli-aləm,
Ancaq mənədir cünun müsəlləm.
Sən olma fəsaneyi-xəlayiq,
Məcnun işi Leyliyə nə layiq?
Məcnun mənəm, ey vəfalı dildar!
Divanəliyə mənəm səzavar!
9. Sən eyləmə halını digərgun,
Leyli nə rəva ki, ola məcnun?
Ğəmxarsan, ey büti-pəriru,
Ğəmxarlığın həmin yetər bu.
Kim, pərdənişin olub həmişə,
Daim qılasan hicab pişə.
10. Gün kimi çıxıb müdam seyrə,
Göstərməyəsən cəmal ğeyrə
Kim, səndə nə olsa rəsmü adət,
Ətvarımadır mənim şəhadət.
Mən eşq güzərgəhində xakəm,
El cümlə bilir məni ki, pakəm.
11. Rəhm et mənə, ey büti-vəfadar,
Tə'n əhlinin ağzın açma, zinhar!
Çün mən rəhü rəsmi-eşq tutdum,
Namus təriqini unutdum.
Namusunu saxla hər xələldən,
Sən əql ətəyini qoyma əldən.
Təqrib ilə ol əsiri-məhcur".
Bu nadirə şe'ri etdi məzkur:

7. Eşqimin başlanğıcı kamala yetib, indi mən ancaq baş hərfələrlə məşğulam. Mən rüsvayçılıqda ad çıxarmışam, sən də bu yolu tutma. İsmət pərdəsi içində aram ol. Rüsvay mənəm, sənin adın yaxşı qalsın.

8. Əhl aləm məni "Məcnun" çağırır. Dəlilik məndə yurd salıb. Sən el-aləmin dilinə düşmə. Məcnunluq işi Leyliyə nə layiq? Məcnun mənəm, ey vəfalı dildar! Divanəliyə mən layiqəm!

9. Sən halını dəyişmə. Heç rəvadırmı, Leyli də Məcnun ola? Qəmxarımsan, ey pərisifət, elə qəmxarlığın da mənim bəsimdir. Yetər ki, sən həmişə pərdənişin olub daima pərdədə qalasan!

10. Gün kimi hər dəm seyrə çıxıb camalını özgələrə göstərməyəsən. Sən nəyi adət eləsən, mənim varlığımdan o xəbər verəcək. Mən eşq səhrasının torpağıyam, ancaq bütün el bilir ki, pakam.

11. Mənə yazığın gəlsin, vəfalı yarım, tə'nə əhlinin ağzını açma, saqın! Çünki mən eşqin qaydasını, yolunu tutmuşam, yaşayış qaydalarını unutmuşam. Namusunu hər ləkədən saxla, sən əqlin ətəyini əlindən buraxma". Tədriclə o yaralı əsir bu nadir şe'ri söylədi:

## BU ĞƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Xəyalilə təsəllidir, könül meyli-visal etməz,
Könüldən dişrə bir yar olduğun aşiq xəyal etməz.

Həqiqi eşq çün müstövcibi-nöqsan degil mütləq,
Özün əhli-həqiqət valehi-hüsnü cəmal etməz.

Kəmali-eşqə talib möhtərizdir hüsni-surətdən
Ki, qeydi-hüsni-surət aşiqi sahibkəmal etməz.

Dəlili-cəhldir eşq əhlinə surətpərəst olmaq
Ki, aqil iftiraqi mümkün ilə ittisal etməz.

Könüldə dust təmkin bulsa olmaz gözdə cövlanı,
Məhəbbət sabit olsa, öz yerindən intiqal etməz.

Səvadi-masivadən lövhi-dil xali gərək daim,
Müvəhhid səfheyi-idrakə nəqşi-xəttü xal etməz.

İradət zaye etməz əhli-mə'na, surətən hərgiz,
Həqiqət cövhərin cəhli-məcazə payimal etməz.

Müqəyyəd olmaz əhli-surətin rənginə hal əhli,
Füzuli, kim müqəyyəddir məgər idraki-hal etməz?

## BU QƏZƏL MƏCNUNUN DİLİNDİNDİR

Xəyalıyla təsəlli tapıb, könlüm vüsala meyl etməz,
Könüldən kənarda bir yar olduğunu aşiq xəyal etməz.

Həqiqi eşqə qəti nöqsan tutula bilməz,
Həqiqət əhli heç vaxt özünü üz gözəlliyinə valeh etməz.

Kamil eşq tələbində olan surət gözəlliyindən çəkinər,
Çünki gözəl surət qayğısı çəkmək aşiqi kamal sahibi etməz.

Eşq əhlinin surətpərəst olması onun cəhalətinin sübutudur,
Çünki aqil ayrılığı mümkün olanla yaxınlıq etməz.

Dost könüldə təmkin tapsa, gözdə cövlanı olmaz,
Məhəbbət möhkəm olsa, öz yerini dəyişməz.

Könül lövhəsi başqa yazılardan gərək azad olsun,
Allahın birliyinə inanan idrak səhifəsinə xətt və xal nəqş eləməz.

Mə'na əhli heç vaxt surətə vaxtını zay etməz,
Həqiqət cövhərini məcazın cəhlinə dəyişməz.

Hal əhli surət əhlinin rənginə bağlanmaz,
Füzuli, kim bağlanıbdırsa, o hal dərk etməzmi?

**BU, LEYLİNİN MƏCNUN ƏTVARINA TƏHSİNİDİR VƏ HÜSNİ-E'TİQADİNA HÜSNİ-YƏQİNİDİR**

1. Leyli dedi: - "Ey vücudi-kamil!
Qürbi-heqe ismet ile qabil!
Me'raci-kemalını sınardım,
Keyfiyyeti-halını sınardım,
Oldum nece olduğundan agah,
Xoş mertebedir bu, barekallah!
2. Əhsente ki, zati-pak imişsen,
Pakize vücudi-xak imişsen.
İnsaf hemin ola qenaet,
Teskini-hevaye istitaet.
Eşqinde riya güman ederdim,
Ətvarını imtehan ederdim.
3. Əlminnetü lillah oldu me'lum,
Vesl olduğu meşrebinde mezmum.
Ğemnak idim, eyledin meni şad,
Bu qeyd teellüqünden azad.
Bir ğafili-xudperest idim men,
Cehl ile müdam mest idim men.
4. Arayişi-zülfü xal ederdim,
Peyveste munu xeyal ederdim.
Kim, sen telebi-vüsal edersen,
Nezzareyi-zülfü xal edersen.
Hala mene rövşen oldu halın,
5. Me'racı-heqiqeti-kemalın,
Men beslediyim bu zülfü xalı,
Çeşmi-siyehü üzari-alı.
Öz canım üçün deyil şebü ruz,
Nezri-nezerindir, ey dilefruz!
6. Ta eyleyesen demi nezare,
Teskin veresen dili-figare.
Hem sen olasan murade vasil,
Hem ola mene sevab hasil.
Yoxdur çü nezare meyli sende,
Neyler bu cemali-xub mende.
7. Ten dürcünedir düri-revanım,
Genci-bedenimde neqd-canım.
Derdim ola serfi-rehgüzarın,
Gördükde revan qılam nisarın,
Tövfiqü vüsalın edem idrak,
Əndişeyi-hicrden olam pak.

**BU, LEYLİNİN MƏCNUNUN HƏRƏKƏTİNİ TƏQDİR ETMƏSİDİR VƏ ONUN E'TİQADININ GÖZƏLLİYİNƏ ƏMİN OLMASIDIR**

1. Leyli dedi: "Ey kamil vücud! Öz ismətində haqqa yaxınlığa qabil! Sənin əqlinin yüksəlişini sınayırdım. Əsl halını sınayırdım. Necə olduğunu bildim. Çox gözəl səviyyədəsən. Barəkallah!

2. Əhsənlər ki, pak zat imişsən, torpaqdan yaranmış gözəl varlıq imişsən. İnsafla deyə bilərəm ki, sən öz şəhvətini söndürməyə özündə qüvvə tapmısan. Eşqində riya olduğunu güman edirdim, sənin davranışını imtahana çəkirdim.

3. Allaha şükr olsun, mə'lum oldu ki, sənin varlığında vəsl qəbahətdir. Qəmliydim, məni şad elədin. Asılılıq zəncirindən məni azad elədin. Mən qafil bir özünüsevər idim, nadanlıqla daim məst idim.

4. Daima saçımı darayıb xalımı bəzəyirdim, daima bunu düşünərdim. Həmişə elə bilirdim ki, sən vüsal tələbindəsən, hüsn, zülf, xal tamaşasındasan.

5. İndi mənə sənin əsl halın, həqiqi kamalının ucalığı mə'lum oldu. Mən bəslədiyim bu saç, xal, al yanaqlar və qara gözlər özüm üçün deyildi. Gecə-gündüz sənin baxışının nəzriydi, ey diləfruz!

6. Hərdən baxıb yaralı ürəyində rahatlıq tapasan. Həm sən murada çatasan, həm mən savaba yetəm. Səndə ki baxmaq meyli yoxdur, onda bu gözəllik mənim nəyimə gərəkdir.

7. Canımın sandıqçasındakı saf incim, tənim xəzinəsindəki canım istəyirdim sənin olsun, sənin yolunda sərf olsun, səni görcək qurbanlığın olam. Vüsalını dərk eyləyəm, ayrılıq əzabından qurtaram.

8. Hala ki, müyəssər olamaz kam,
Olmaq nə rəva arada bədnam?
Nəsxi-xəti-e'tibar qıldım,
Rahi-ədəm ixtiyar qıldım.
Ta necə verə ğübari-surət,
Ayineyi-zatimə küdurət.

9. Vəqt oldu ki, rövşən ola mir'at,
Müstəğni ola süfatdan zat.
Vəqt oldu bu qönçə ola xəndan,
Tə'sir edə sübhi-feyzi-canan.
Xunab ğəmilə doldu könlüm,
Ğönçə sifəti tutuldu könlüm.

10. Fərz oldu ki, tey qılam büsatım,
Qət edəm özümdən ixtilatım.
Sətri-tən edəm ədəm hicabın,
Rüxsarə çəkəm fəna niqabın.
Ta hüsni-rüxüm ki, istəməz yar,
Olmaya nəsibi-çeşmi-əğyar.

11. Zira ki, nəsibi-hüsni-qabil
Oldur, ona aşiq ola mail.
Hüsnümdə çü yox qəbuli-aşiq,
Nöqsan ilə olmağım nə layiq".
Bu halə münasib ol pərizad
Filhal bu şe'ri etdi bünyad:

8. İndi ki, bu kam almaq mümkün deyil, arada bədnam olmaq rəvadırmı? Xətti-xalımı pozmağı qərara aldım. Yoxluğun yolunu seçdim ki, surətimin tozu zatımın güzgüsünü paslatmasın.

9. Güzgünün işıqlanmaq vaxtı artıq gəldi ki, surət mahiyyətdən asılı olmasın. Qönçənin canan sübhünün feyzindən açılmaq vaxtı gəldi. Könlüm qan-yaş qəmilə doldu. Qönçə kimi ürəyim qapandı.

10. Yerimi yığışdırmaq vaxtı gəldi, özüm-özümlə aranı kəsməliyəm. Yoxluq pərdəsi içində bədənimi gizlətməli və üzümə heçlik örtüyü çəkməliyəm. İndi ki, üzümün gözəlliyi yarıma gərək deyil, qoy yadların da gözünün qisməti olmasın.

11. Mənim gözəlliyimə mail olmaq sevgilimin qisməti idi. İndi ki, hüsnümü aşiqim qəbul eləmir, onda bu nöqsanla qalmaq nəyimə lazımdır". O pərizad bu hala münasib bir şe'r dedi:

## BU ĞƏZƏL LEYLİ DİLİNDƏNDİR

Nə dilbər kim, dəmadəm aşiqə ərzi-cəmal etməz,
Qılır naqis, bulub feyzi-nəzər kəsbi-kəmal etməz.

Deyil cəzb etməyən üşşaqi mə'şuq olmağa qabil,
Nə hasil hüsni-surətdən ki, cəzbi-əhli-hal etməz.

Gərək rüxsareyi-mə'şuq məxfi ğeyri-arifdən
Ki, arif olmayan idrak sün'i-zülcəlal etməz.

Həvayi-vəsldir kim, xublar vəslinə talibdir
Və gər nə eşqi-kamil fərqi-hicranü vüsal etməz.

Olan nəqdi-həyatın aşiqin mə'şuqə sərf eylər,
Bu zülmü, ah, əgər mə'şuqinə aşiq həlal etməz.

Məcaz əhlinə xublar cilveyi-naz eyləsinlər kim,
Özün əhli-həqiqət mübtəlayi-xəttü xal etməz.

Füzuli, aləmi-surətdə sərgərdan gəzər zahid,
Zəhi ğafil, bu sövdanın sərəncamın xəyal etməz.

## BU QƏZƏL LEYLİNİN DİLİNDƏNDİR

O gözəl ki, daim aşiqə öz camalını göstərməz,
Naqis qalar, baxmağın feyzini tapmaz, kamal kəsb etməz.

Aşiqləri özünə çəkməyən mə'şuqəliyə qabil deyil,
Hal əhlini özünə çəkməyən gözəl surətdən nə fayda.

Gərək mə'şuqun gül üzü arif olmayandan gizli qala
Çünki, arif olmayanlar calal allahının yaradıcılığının anlaya bilməz.

Gözəllərə qovuşmaq istəyən vəsl həvəsidir.
Əgər eşq kamildirsə, o, ayrılıqla vüsalın fərqini bilməz.

Aşiq olan həyatının nəqdini mə'şuquna sərf edər,
Zülmdür əgər bunu aşiq mə'şuquna halal etməz.

Məcaz əhlinə gözəllər gərək naz-qəmzə eləsin ki,
Həqiqət əhli özünü zülfə, xala bağlı hesab etməz.

Füzuli, zahid surətlər aləmində avara gəzər,
Amma gör necə qafildir ki, bu sevdanın sonunu xəyalına gətirməz.

## TƏMAMİYİ-SÜXƏN

1. Xətm eyləmədən sözünü ol mah,
Bir naqənişin göründü nagah.
Naqə ilə bir nəfər səbükxiz,
Gördü ki, gəlir nəsim tək tiz.
2. Bildi büti-gülrüxi-səmənbuy,
Kim, özü üçündür ol təkü puy.
Bildi ki, rəqib bədgümandır,
Ənduhi-dilü bəlayi-candır.
Ol mahivəş olduğunda ğaib,
Olmuş ona sür'ət ilə talib.
Gülzarə hənuz yetmədən xar,
Gül qıldı vidai-səhni-gülzar.
3. Ol halına vaqif olmadan ğeyr,
Tərpətdi cəmazeyi-səbükseyr.
Cuyəndə görüb ol afitabi,
Tərk etdi şitabü iztirabi.
Tovfiqi-muradə oldu xoşdil,
Düşdü önə qıldı əzmi-mənzil.
Şəhbazı yetirdi aşiyanə,
Tapşırdı nihalı bağibanə.
4. Məcnun yenə qaldı zarü məhcur,
Həmsöhbəti marü həmdəmi mur.
Nə durmağa taqətü qərarı,
Nə gəzməyə əldə ixtiyarı.

## SÖZÜN SONU

1. O ayüzlü sözünü tamamlamamış qəflətən bir dəvəçi göründü. Bir nəfər iti ayaqlı yel kimi dəvəsiylə ox kimi tək gəlirdi. Bu gülüzlü yasəmən ətirli bildi ki, tək-tənha gələn onun üçün gəlir.

2. Bildi ki, rəqib şübhələnib və bu ürəyə dərddir, başa bəladır. Gözəlin yox olduğunu duyub, tez onu tapmağa yönəlmiş. Tikan gülşənə çatmadan, gül gülşənlə vidalaşdı.

3. O yad adam sevgililərin halından xəbər tutmamış Leyli öz itiayaqlı dəvəsini tərpətdi. Axtaran adam o günəşi tapanda tələsməkdən əl çəkdi. Murada yetdiyindən xoşhal olub önə düşdü, mənzil yoluna düzəldi. Tərlanı yuvasına çatdırdı, fidanı bağbana tapşırdı.

4. Məcnun yenə də tənha, yaralı halda, həmsöhbəti qarışqalar və ilanlarla qəldi. Nə durmağa qərarı, nə gəzməyə gücü vardı.

## BU, MƏCNUNUN ME'RACİ-FƏZAİLİDİR VƏ BƏYANİ-MƏRTƏBEYİ-HÜSNİ-XƏSAİLİDİR

1. Şahinşəhi-mülki-möhnətü dərd,
Yə'ni Məcnun dərdpərvərd
Bir pak idi kim, bu ərseyi-xak
Onun kimi görməmişdi bir pak,
Mə'mureyi-qürbi-həq məqami,
Ərvahə fərizə ehtirami.

2. Çün nifrəti-şərri-nəsli-adəm
Qıldı ona vəhşəti müsəlləm,
Hər vəhşi donunda bir fəriştə,
Yar oldu ol adəmi-sirişte.
Zahirdə rəfiqi vəhşlə teyr,
Batində məlaik ilə həmseyr.

3. Qılmışdı kəmali-e'tidali,
Kəsrət eləmindən onu xali.
Çəkməzdi cəhanda ol cahangərd
Əndişeyi-gərmü-ğüsseyi-sərd.
Bilmişdi cəhanın e'tibarın,
Yox yerinə satmış idi varın.

4. Tutmuşdu təriqi-əhli-tovhid,
Bulmuşdu kəmali-tərkü təcrid.
Olmuşdu vücudi-paki pürnur,
Alayişi-əklü şürbdən dur.
Təhsil qılıb səfayi-siyrət,
Görmüşdü məcazdən həqiqət,
Əyanə yox idi e'timadı,
Nəqqaş idi nəqşdən muradı.

5. Mövzun idi təb'i-nüktədani,
Hər nüktədə vaqifi-məani.
Avazi idi bəsi mülayim,
Üslubu dürüst, üsuli qaim.
Təhrir ilə hər çəkəndə avaz,
Quşlara tutardı rahi-pərvaz.

6. Gahi ğəzəlü gəhi qəsidə
İnşa qılıb ol sitəmrəsidə.
Suz ilə oxurdu gahü bigah,
Bir neçə əziz onunla həmrah;
Yazarlar idi təmam şe'rin,
Oxurlar idi müdam şe'rin.
Aləmlərə ol ğəribü məhcur,
Əksər bu səbəbdən oldu məşhur.

## BU, MƏCNUN FƏZİLƏTİNİN ƏN UCA ZİRVƏSİDİR VƏ ONUN YÜKSƏK, GÖZƏL XASİYYƏTLƏRİNİN TƏSVİRİDİR

1. Möhnət və dərd mülkünün şahənşahı, yə'ni dərdsevər Məcnun elə pak idi ki, yer üzü onun kimi bir pak görməmişdi. Həqq sarayının qulluqçusu idi və ruhlar aləminə hörməti vardı.

2. İnsan nəslinə xas olan kin və küdurət onu vəhşilik həyatını seçməyə məcbur etmişdi. Hər vəhşi donunda bir mələk bu adəm oğluna dost olmuşdu. Zahirdə onun yoldaşları vəhşilər və quşlar idi, həqiqətdə isə mələklərlə dolanırdı.

3. Mülayim kəmalı, onu qələbəlik-kütlə dərdindən uzaq eləmişdi. O dünyanı dolaşanın dünyada nə isti və soyuq dərdi var idi.Dünyanın e'tibarını bilmişdi, varlığını yox yerinə satmışdı.

4. Allahın birliyi yolunu seçib tənhalığın və təkliyin kamilliyinə qovuşmuşdu. Vücudu təmizlənib nur ilə dolmuşdu. Yemək-içmək qayğısından uzaq idi. Əxlaq saflığını özündə cəmləşdirib məcazda həqiqəti görmüşdü. Gördüklərinə e'timadı yox idi. Naxışda nəqqaşı axtarırdı.

5. İstəkləri anlamaq təb'i geniş idi və hər incə nöqtənin mə'nasını dərk edirdi. Səsi mülayim, davranışı düzgün, yolu düz idi.Avazla səsini ucaldanda quşlar pərvaza gəlirdi.

6. O başıbəlalı gah qəzəl, gah qəsidə yazırdı. Vaxtdan-vaxta yanıqlı-yanıqlı oxuyurdu, bir neçə yanında olan əzizləri bu şe'rləri yazıb müdam təkrarlayırdılar. O yazıq yaralı bu səbəbdən aləmdə məşhur olmuşdu.

7. Avaziyü zehniyü cəmali
Qılmışdı müqəyyəd əhli-hali,
Kim olsa bu üç kəmalə qabil,
Deməк olur ona zati-kamil.
Peyvəstə qılıb kəmalın izhar,
Bu beytləri qılırdı təkrar:

7. Avazı, zehni, gözəlliyi hal əhlini ona bağlamışdı. Kimdə bu üç kamal varsa, ona kamallı insan adı vermək olar. Aramsız kamalını göstərərək bu beytləri təkrarlayırdı:

## BU ĞƏZƏL MƏCNUN DİLİNDİNDİR

Biz cahan mə'murəsin mə'nidə viran bilmişiz,
Afiyət gəncin bu viran içrə pünhan bilmişiz.

Gər özün dana bilir təqlid ilə surətpərəst,
Aləmi-təhqiqdə biz onu nadan bilmişiz.

Bixəbərlər şərbəti-rahət bilirlər badəyi,
Biz həkimi-vəqtiz, onu tökmüşüz, qan bilmişiz.

Bilmişiz kim, mülki-aləm kimsəyə qılmaz vəfa,
Ol zamandan kim, onu mülki-Süleyman bilmişiz.

Ayrı bilmişsən, Füzuli, məscidi meyxanədən,
Səhv imiş ol kim, səni biz əhli-irfan bilmişiz.

## BU QƏZƏL MƏCNUNUN DİLİNDƏNDİR

Biz dünya mülkünü, mə'na aləmində viran bilmişik,
Sağlıq xəzinəsini bu viranədə gizlin bilmişik.

Əgər surətpərəst özünü təqlidlə alim bilirsə,
Həqiqət aləmində biz onu nadan bilmişik.

Xəbərsizlər badəni rahatlıq şərbəti sanar,
Biz vaxtın həkimiyik, onu atıb qan bilmişik.

Bilmişik ki, dünya mülkü heç kəsə qılmaz vəfa
O zamandan ki, onu Süleyman mülkü bilmişik.

Füzuli, məscidi meyxanadan ayrı bilmişsənsə,
Səhv etmişik ki, biz səni arif adam bilmişik.

## BU, LEYLİNİN BAHARİ-ÖMRİ XƏZANƏ İRDİYİDİR

1. Saqi, gözə gəldi neş'əyi-mey,
Bir neçə qədəh yerit peyapey!
Əzmi-tərəb etdin, ehtimam et,
Zövqün tərəb əhlinin təmam et!
Bəzm əhlinə cami-lalegun tut,
Əmma mənə cümlədən füzun tut!
Zira ki, hənuz nimməstəm,
Ğəm silsilesinə paybəstəm.
Xoşdur tərəb əhlinin bu bəzmi,
Dağılmağa olmasaydı əzmi.
2. Tarixnəvisi-hali-əyyam,
Bu qissəyə böylə verdi itmam
Kim, vəsldən olmayıb təsəlli.
Məcnundan olanda dur Leyli,
Kəsmişdi təəllüqün cahandan.
Qət'i-nəzər eyləmişdi candan.
3. Bir fəsl ki, dəsti-ğarəti-dey,
Gülzar büsatın eylədi tey,
Matəmkədə oldu ərsəyi-bağ,
Matəmdə sürud naleyi-zağ.
Leyli kimi oldu lalə məstur,
Məcnun kimi şaxi-ərğəvan ur,
Rənci-yerəğandan oldu əşcar,
Lərzənü zəifü zərdrüxsar.
4. Söndü gülü lalənin çirağı,
Sərsər yeli zülmət etdi bağı.
Gül bimi-təərrüzi-həvadən,
Lalə sitəmi-dəmi-səbadən,
Rəxtini yaşırdı bağlarda,
Lə'lini itirdi dağlarda.
5. Bir mar misali oldu hər nəhr,
Hər lərzədə su məsabeyi-zəhr.
Göydən yerə endigində baran,
Hər qətrə olub misali-peykan,
Guya ki, yetirdi bağa bidad
Kim, şö'bədeyi-təhərrüki-bad
Bir səhr ilə abi ahən etdi,
Ondan təni-bağa cövşən etdi.

## BU, LEYLİNİN ÖMÜR BAHARININ XƏZANA YETDİYİDİR

1. Saqi, meyin nəş'əsi gözə gəldi, dalbadal bir neçə qədəh ver! Sevinc məclisi qurmusan, sə'y elə ki, şadlıq əhlini doydurasan! Məclis əhlinə lalə rəngli cam tut! Mənə isə hamıdan çox tut! Ona görə ki, yarısərxoşam, qəm zəncirinə bağlanmışam. Şadlıq əhlinin bu məclisi çox xoşdur, heyf ki, dağılmaq üzrədir.

2. Zamanın halının tarixçisi bu hissəni belə tamamladı: Vəsldən təsəlli tapmayıb Məcnundan uzaqlaşandan sonra Leyli dünyadan əl çəkib canını gözdən salmışdı.

3. Elə bil gış fəsliydi, çillənin talançı əli gülzarların büsatını dağıtmışdı. Bağlar matəm yerinə çevrilmişdi, qarğaların sədası matəm nəğməsiydi. Lalə Leyli kimi qapandı, ərğəvan budağı Məcnun kimi soyundu. Ağaclar sarılıq gətirib zəifləyib saralmışdılar, tir-tir əsirdilər.

4. Qızılgülün, lalənin çırağı sönmüşdü, qasırğa bağı zülmətə çevirmişdi. Güllər hava hücumunun qorxusundan, küləyin zülmündən bağlarda gizlənmişdilər, lalələrsə dağlarda qızıl rənglərini itirmişdi.

5. Hər çay bir ilan misalı olmuşdu, sular zəhər axan kimi axırdı. Göydən yağan yağışın damlalarının hər biri bir ox kimi bağa zülm edirdi. Küləyin hərəkətinin hoqqası bir əfsunla suları dəmirə çevirmişdi, bağı zireh içinə almışdı.

6. Bir gün bu həvadə Leyliyi-zar
Ğəm də'finə etdi meyli-gülzar.
Gördü gülü lalədən əsər yox,
Ənvai-şəcərdə bərgü bər yox.
Səhni-çəmənin səfası getmiş,
Nöqsani-səfa kəmalə yetmiş.
Nə səbzə tənində tab qalmış,
Nə bərk üzündə ab qalmış.
Matəmkədə gördü busitanı,
Riqqət oduna tutuşdu canı.

7. Suzi-cigərilə yanə-yanə,
Şərh etdi ğəmini busitanə:
- "Key bağ, nədir bu ahi-sərdin?
Mən xəstəyə zahir eylə dərdin!
Mən dəxi sənin kimi nizarəm,
Bir güldən iraqü zərdü zarəm;
Nə dövləti-qürbünə qəbulim,
Nə rövzeyi-kuyinə vüsulim.

8. Sən gərçi xəzanəsən giriftar,
Əlbəttə, bahara yetməyin var.
Ümmidi-visal məndə yoxdur,
Səndən ğəmü ğüssə məndə çoxdur!"
Artırdı ğəm ağladıqca dərdin,
Giryan göyə tutdu ruyi-zərdin.

6. Bir gün belə bir havada ağlar Leyli qəmini dağıtmaq üçün gülzar seyrinə çıxdı. Gördü ki, güldən-lalədən əsər yoxdur. Ağacların heç birinin nə yarpağı, nə də barı var. Çəmənliyin səfası getmiş, nöqsanı kamala yetmişdi, nə yaşıllığın canında güc, nə yarpaq üzündə şeh qalmışdı. Busstanı yas yeri kimi gördü. Candan yandı, yazığı gəldi.

7. Ciyəri yana-yana qəmini bustana açdı: "Ey bağ, bu nə ah-zardır? Mən xəstəyə söylə, nədir dərdin? Mən də sənin kimi fəlakətdəyəm, gülümdən iraq düşüb solmuşam, ağlar qalmışam. Nə onun qəbuluna düşmək səadətim var, nə də cənnətəbənzər məskəninə girmək imkanım var.

8. Sən əgər payıza düşmüsənsə, ancaq qabaqda bahara yetməyin var. Mənimsə vüsala ümidim yoxdur və dərdim səninkindən daha çoxdur". Ağladıqca dərdi artırdı, saralmış üzünü ağlar göylərə tuturdu.

**BU, LEYLİNİN ANASINA VƏSİYYƏT ETDİYİDİR VƏ DUST YADI İLD DÜNYADAN GETDİYİDİR**

1. Mə'budinə ərz qıldı razın,
Bildirdi könlündəki niyazın:
—"Key hakimi-ərseyi-qiyamət!
Sultani-səriri-istidamət!
Nomidilik ateşinə yandım,
Billah, bu vücuddan usandım!
2. Çün dust yanında naqəbuləm,
Billah, bu həyatdan məluləm!
Mən şəm'i-şəbi-firaqi-yarəm,
Suzanü siyah ruzigarəm.
Yandırdı məni cəfayi-aləm,
Dinlənməzəm ölməyincə bir dəm.
3. Derdim ki, vücudum ola baqi,
Şayəd düşə vesl ittifaqi...
Pərtöv bürcündə afitabım,
Bildim ki, vücud imiş hicabım!
Ya rəb, məni et fənayə mülhəq
Kim, rahi-fəna imiş rəhi-həq".
4. Pak idi, duası etdi tə'sir,
Filhal mizacı oldu təğyir.
Tə'siri-həvayi-namünasib,
Tərkibinə qıldı zə'f ğalib.
Gəldikcə ziyadə oldu dərdi,
Təblərzə fərağətin gidərdi.
5. Məhv oldu təb içrə ol pərivəş,
Bir şəm' kimi ki, görə ateş.
Əksildi əreqdə hüsni tabi,
Bir gül kimi kim, gidər gülabi...
Zə'fi-təni ol məqamə yetdi
Kim, bəstər içində cismi itdi.
6. Bəstərdə tələb qılan nişanın,
Görməzdi vücudi-natevanın.
Rəf oldu nişaneyi-səlamət,
Mövtinə göründü min əlamət.
Əzm eylədi olmağa müsafir
Rehlət əsəri çü oldu zahir,

**BU, LEYLİNİN ANASINA VƏSİYYƏT ETDİYİDİR VƏ SEVGİLİSİNİ YAD EDƏRƏK DÜNYADAN GETDİYİDİR**

1. Tanrısına sirrini dedi, ürəyindəki yalvarışını bildirdi:

"Ey qiyamət mülkünün hakimi! Əbədi taxtın sultanı! Ümidsizlik oduna yandım, vallah, bu canımdan da usandım!

2. İndi ki dost məni qəbul etmır vallah, bu həyatdan bezmişəm. Mən yarımdan ayrılıq gecəsinin şamıyam, yanıram, qara günlüyəm. Məni dünyanın zülmü elə yandırıb ki, ölənəcən bir an dincələ bilməyəcəyəm.

3. Deyirdim, bəlkə vücudum qalaydı, bəlkə bir görüş mümkün olaydı. Görünür ki, güneşim aydınlıq bürcündə imiş, mənim pərdəm mənim varlığım imiş". Ya rəb, məni heçliyə yetir, çünki həqq yolum heçlik yoluymış."

4. Pak olduğu üçün duası tə'sir etdi və dərhal əhvalı dəyişdi. Əhvalının pozulmasının tə'siri ilə zəiflik canına üstün gəldi. Dərdi getgedə artdı. Titrəmə, qızdırma rahatlığını əlindən aldı.

5. Yanar şam kimi qızdırma içində o pəriyə bənzər məhv oldu, gülabı çəkilmiş gül kimi tər içində onun hüsnü və təravəti itdi. Zəifliyi o məqama yetdi ki, yataq içində cismi itdi.

6. Yataqda nişanını görmək istəyən onun gücsüz vücudunu görə bilməzdi. Salamatlıq əlamətləri yox oldu, ölümünün nişanələri göründü. Səfərə yığışdı, köçmə əlamətləri üzə çıxdı.

7. Rəf etdi hicab ehtirazın,
Faş etdi anaya gizli razın:
- "Key dərdi-dilim dəvası ana!
Şəm'i-əməlim ziyasi ana!
Ğəm gizləmək ilə canə yetdim,
Ta mümkün idi təhəmmül etdim.
8. Hala ki, müqərrər oldu getmək,
Fərz oldu bu sirri zahir etmək.
Olsun sənə, ey zəifə, rövşən
Kim, tiği-həva həlakiyəm mən.
Cismimdə yox özgə dərd tabi,
İlla ğəmi-eşq iztirabi.
9. Mən aşiqi-zarü binəvayəm,
Bir mahliqayə mübtəlayəm.
Sövdası ilə yox oldu varım,
Keçdi həvəsilə ruzigarım.
Çox arizu eylədim cəmalin,
Bir dəm görə bilmədim vüsalin.
10. Hala gedirəm könüldə suzi,
Əldən nə gəlir, bu idi ruzi.
Ancaq deyiləm məni-pərişan
Ol yar ğəmində zarü giryan,
Ol həm məni-zarə mübtəladır,
Sərgəştəyi-vadiyi-bəladır.
11. Məndəndir onun cünuni əfzun,
Qeys ikən olubdur adı Məcnun.
Daim keçirər ğəmimdə əyyam,
Bir gün ona hasil olmayıb kam.
Risvayi-zəmanə oldu məndən,
Afaqə fəsanə oldu məndən.
12. Bihudə deyil fəğanü ahi,
Yaxmazmı məni onun günahi!?
Mən kim, gedərəm bu xakidandan,
Dərdim bu ki, şərmsarəm ondan.
13. Ey munisi-ruzigarım ana!
Ğəmxarimü ğəmgüsarım ana!
Mən dari-bəqayə əzm edəndə,
Dünyaya vida edib gedəndə,
Mənsiz çəkib ahlar, fəğanlar,
Səhralərə düşdüyün zamanlar
Düşsə yolun ol olan diyarə,
Ərzi-ğəmim eylə ol fikarə.

7. Utanmaqdan keçib anasına gizli sirrini açdı: "Ey ürək dərdimin dərmanı ana! Əməl şamının ziyası ana! Qəmimi gizlətməkdən cana doydum. Bacardığım qədər dözdüm.

8. İndi getmək qərara alındı, sirrimi sənə açmalıyam. Mə'lumun olsun ki,ey xanımım, mən ruhuma sancılmış xəncərdən ölürəm. Canımda eşq qəmindən başqa özgə bir xəstəlik yoxdur.

9. Mən bədbəxt ağlar aşiqəm. Bir ayüzlünün vurğunuyam. Onun sevdası ilə varlığım yox oldu, ömrüm onun həvəsi ilə bitdi. Camalını çox arzuladım, amma bir an vüsalını görmədim.

10. İndi də ürəyi yanıqlı gedirəm, əlimdən nə gəlir, qismətim bu imiş. Ancaq mən o yarın qəmindən ağladığım, inlədiyim üçün peşman deyiləm. O da mənim kimi bu dərdə düşüb, bəla səhrasının avarasıdır.

11. Onun divanəliyi məndən də böyükdür. Qeys ikən adı Məcnun olub. Həmişə vaxtını mənim qəmimlə keçirir. Bircə an da olsa ona kam qismət olmayıb. Mənim ucbatımdan el-aləmdə rüsvay olub, əfsanələrə çevrilib.

12. Fəryadı, ahı səbəbsiz deyil, bəs bu günah məni yandırmazmı? Mən ki, bu dünyadan gedirəm, bircə dərdim var ki, onun yanında xəcalətliyəm.

13. Ey ömrümün munisi ana! Qəmxarım, sədaqətli dostum ana! Mən əbədiyyət diyarına üz tutanda, dünyaya vida edib gedəndə, mənsiz ah-fəğan eyləyib səhralara düşəndə, əgər yolun onun diyarına düşsə, mənim dərdimi o yaralıya yetir.

14. Zinhar ona olanda vasil,
Xoş kimsədir, ondan olma ğafil!
Damanını tut, rizasın istə,
Mən mücrim üçün duasın istə!
Ərz eylə ki: - "Ey vəfalı dildar!
Can verdi yolunda Leyliyi-zar,
Eşqində yerinə yetdi lafi,
Də'vasının olmadı xilafi".
15. Söylə məni-zarü mübtəladən:
"Key eşqdə laf edən vəfadən!
Xəlvətgəhi-ünsə məhrəm oldum,
Azadəvü şadü xürrəm oldum.
Sən həm gələ gör, təəllül etmə,
Mən müntəzirəm, təğafül etmə!
16. Gər sadiq isən bu yolda, sən həm
Səbr eyləmə, eylə tərki-aləm.
Gəl kami-dil ilə olalım yar,
Bir yerdə ki, yoxdur onda əğyar...
Daim olalım bir evdə həmraz
Kim, çıxmaya dışra ondan avaz.
17. Xoş mənzili-əmnə bulmuşam rah,
Bitə'neyi-dustü cövri-bədxah.
Məndən səni eyləmək xəbərdar,
Bismillah, əgər iradətin var!"
18. Çün qıldı vəsiyyətini axir,
Əzmi-səfər etdi ol müsafir.
Yad eylədi yari-mehribanın,
Vəsl arzusu ilə verdi canın.
Kimdir ki, cahanda fani olmaz?
Dövri-fələkin amani olmaz!
19. Dünya yeddi başlı əjdəhadır,
Əndişeyi-ülfəti xətadır.
Hər lütfünədir dəfinə min qəhr,
Hər şəhdinədir qərinə min zəhr.
Dövran üzərindədir zəmanə,
Əlbəttə, gələn gedər cəhanə.
Ərbabi-zəmanəyə verib pənd,
Bu şe'ri nə xoş demiş xirədmənd:

14. Ona tuş olarsansa, saqın, etinasız olma, bil ki, xoş insandır! Ətəyini tut, razılığını al. De ki, mənim ruhum üçün dua etsin, bir də söylə ki: - "Ey vəfalı dildar! Ağlar Leyli yolunda can verdi. Eşqdə sənə verdiyi söz yerinə yetdi. Dediklərində əyrilik olmadı.

15. Mən ağlar aşiqin dilindən de ki, "Ey eşqdən, vəfadan dəm vuran, mən xəlvət dünyasına qovuşdum, azad və şad oldum. Sən də gəl və gör, gecikmə, gözləyirəm, vaxtı itirmə.

16. Əgər sən də bu yola sadiqsənsə, səbr eyləmə, dünyanı tərk et. Gəl ürək arzumuza çatıb o yerdə yar olaq ki, orada yad yoxdur". Həmişəlik elə bir evdə olaq ki, oradan səda çıxmaz.

17. Xoş bir rahatlıq mənzilinə yola düşmüşəm - dostların tə'nəsi, düşmənlərin dədxahlığından uzaq! Məndən səni xəbərdar eləməkdir. Bismillah, əgər iradən çatırsa!"

18. Vəsiyyətini sona yetirdi və o qonaq səfər yolunu tutdu. Mehriban yarını yad elədi və vüsal arzusu ilə canını tapşırdı. Kim bu cahanda fəna olmur! Fələyin dövründə aman olmaz!

19. Dünya yeddibaşlı əjdəhadır, dostluqu da xətadır. Hər lütfü min zülmün xəzsinəsidir. Hər damcı balında min zəhər payı var. Zəmanə dolanır, əlbəttə dünyaya gələnlər gedir. Zəmanə əhlinə nəsihət verib, ağıl sahibi bu şe'ri necə də gözəl demiş:

## ĞƏZƏL

Bu aləm kim, könül, qeydin çəkərsən möhnətü ğəmdir,
Fəna sərmənzilin seyr eylə kim, bir xoşca aləmdir.

Anıb tənhalığı qəbr içrə nifrət qılma ölməkdən,
Təriqi-üns tut kim, hər ovuc torpaq bir adəmdir.

Deyil möhkəm cahan mülkündə bir bünyad kim, qılsan,
Bəqa mülkündə tut mənzil kim, ol bünyad möhkəmdir.

Əcəl alayişi-xövfü xətərdən qurtarar nəfsi,
Bu cövhər kimiyayi-nəfsə bir iksiri-ə'zəmdir.

Kəmali-eşqi-insan mövt iləndir rahi-hikmətdə,
Bəli, mücra qılan hökmün misalın nəqşi-xatəmdir.

Bahar əyyami girsən laləzarə, xak əczasın
Müheqqər görmə kim, hər zərrə bir cam ilə bir Cəmdir.

Əsiri-nəfsdir əhli-cahan, bilməz fəna qədrin,
Füzuli, tərk təcridi sənə ancaq müsəlləmdir!

## QƏZƏL

Bu aləm ki, könül, qeydin çəkirsən-qüssədir, qəmdir,
Fəna mənzilini gəz ki, bir xoşca aləmdir.

Qəbr içində təkliyi yada salıb ölməkdən nifrət eləmə
Ünsiyyət yolunu tut - hər ovuc torpaq bir adamdır.

Cahan mülkündə hər nəyi ucaltsan, o möhkəm deyil,
Əbədiyyət mülkündə məskən tut ki, o bina möhkəmdir.

Əcəl, nəfisi ziyana uğramaq təhlükəsindən qurtarır,
Bu cövhər nəfs kimyasında bir böyük əzəli iksirdir.

Hikmət yolunda insan eşqinin kamilliyi ölümdədir,
Bəli bu hökmün fərmanını icra edən son əmri yerinə yetirir.

Bahar vaxtı laləzara girsən, hər torpaq zərrəsini əskik bilmə ki,
hər zərrə bir cam və Cəmşiddir.

Dünya əhli nəfsin əsiridir, ona görə də fəna qədrini bilmir,
Füzuli, dünyanı tərk edib ayrılmağı bacarmaq ancaq sənə qismət olmuşdur

## TƏMAMİYİ-SÜXƏN

1. Leyli güli-gülşəni-lətafət,
Çün gördü xəzan yelilə afət,
Pamalı-xəzan olub bahari,
Əncamə yetişdi ruzigarı,
Biçarə anası açdı başın,
Başından aşırdı qanlı yaşın.
2. Kafurini tökdü zə'ferane,
Suzi-dil ilə gəlib fəğanə,
Çox ağladı, etdi ahü nalə,
Ağlar kim olursa böylə halə.
3. Əlqissə, tutub təriqi-matəm,
Ol vaqeəyə yığıldı aləm.
Tə'zim ilə tutdular əzasın,
Qəbrin düzüb urdular binasın,
Tən oldu müqimi-ərseyi-xak,
Ruh oldu qərini-övci-əflak;
Şövq əhlinə qürb hasil oldu,
Dəryasına qətrə vasil oldu.

## SÖZÜN SONU

1. Leyli-lətafət gülşəninin gülü xəzan yelinin fəlakətini gördüyü üçün, xəzan onun baharını tapdaladı, ömrü sona yetdi. Biçarə anası başını açdı, qanlı göz yaşını başından aşırdı.

2. Ağ saçlarını zə'fəran kimi saralmış üzünə tökdü. Bu hala ağlayanların hamısı ürək odu ilə fəğana gəlib nalə çəkdilər.

3. Qısası, bütün aləm bu hadisəyə yas tutdu. Hörmətlə əzası tutuldu, qəbri götürüldü. Təninin daimi yeri torpaq, ruhununku, isə göylər oldu. Şövq əhli tanrıya yaxınlaşdı, damcı dəryasına qovuşdu.

**BU, MƏCNUNUN LEYLİ VƏFATINDAN XƏBƏRDAR OLDUĞUDUR VƏ DUST YADI İLƏ DÜNYADAN GETDİYİDİR**

1. Möhnət çəmənində gül dərənlər,
Aləmdə yaman xəbər verənlər
Ğəm nüsxəsin eyləyəndə təhrir,
Vermişlər ona bu növ' təşhir
Kim, Zeydi-sitəmrəsideyi-zar
Ol vaqeədən olub xəbərdar,
Filhal qılıb əziməti-rah,
Məcnuni-həzini etdi agah:

2. - "Key şiyfteyi-şikəstətale!
Əfsus ki, sə'yin oldu zaye!
İdbari-tilismin oldu batil,
Bu məşğələdən dəxi nə hasil?
Bazar pozuldu, yığ büsatın!
Bu silsilədən kəs irtibatın!

3. Leyli sənə verdi zindəgani,
Sən ol baqi, ol oldu fani!
Sən sədqəsi olduğun pərivəş
Sədqə sənə oldu, ey bəlakeş!
Əzmi-rəhi-cənnət etdi ol hur,
Firdovs məqamın etdi mə'mur".

4. Məcnun ki, xəbərdən oldu agah,
Suzi-cigərilə çəkdi bir ah.
Kim, ğülğüləsin həm ol zamanda,
Cananı eşitdi ol cahanda.
Az qaldı ki, naləsilə dildar
Ol xabi-əcəldən ola bidar.

5. Bir ləhzə büləndolub xüruşi.
Düşdü yerə, getdi əqlü huşi.
Çün gəldi özünə, qıldı nalə.
Yağdırdı xəzani üzrə jalə.
Tə'nə sözün etdi Zeydə bünyad;

6. - "Key saqiyi-bəzmi-zülmü bidad!
Nətdim sənə, qəsdi-canım etdin!
Qəsdi-dili-natəvanım etdin!
Qıydın məni-zarü natəvanə,
Urdun sitəm atəşini canə!
Zəhr idi məgər bu verdiyin cam
Kim, mərg pəyamın etdi e'lam?

**MƏCNUNUN LEYLİ VƏFATINDAN XƏBƏRDAR OLDUĞUDUR VƏ SEVGİLİSİNİ YAD EDƏRƏK DÜNYADAN GETDİYİDİR**

1. Möhnət çəmənində gül dərənlər, aləmdə yaman xəbər verənlər, qəm dəftərini yazanda belə şərh eləmişlər: çox zülmlər çəkmiş ağlar Zeyd bu hadisəni biləndə dərhal yol tutub, Məcnun yazığa xəbər çatdırdı:

2. "Ey xəstə, taleyi bədbəxt! Əfsus ki, sə'yin zay oldu. Bəxtinin tilsimi pozuldu, daha bu işdən nə çıxa bilər? Bazarın pozuldu, malını yığışdır və bu zəncirdən qurtar.

3. Leyli dünyanı sənə tapşırdı. Sən həmişəlik ol, o, isə fənaya uğradı. Sən qurbanlığı olmaq istədiyin pəri sənin qurbanın oldu, ay bəlakeş! O huri cənnətin yolunu tutub, behişti abad elədi".

4. Məcnuna bu xəbər çatanda ciyərindən elə bir ah çəkdi ki, o dünyada sevgilisi də bunu duydu. Az qaldı ki, bu nalədən dildarı o dünyada əcəl yuxusundan oyansın.

5. Bir anda fəryadı göyə ucaldı, yerə yıxıldı, huşu başından çıxdı. Elə ki, özünə gəldi, nalə çəkdi, solğun üzünü göz yaşları ilə suvardı və tə'nə ilə Zeydə dedi:

6. "Ey zülm və ədalətsizlik məclisinin saqisi! Sənə neyləmişdim ki, canıma qəsd elədin! Mən ağlar natəvana qıydın, canıma sitəm odu vurdun! Mənə verdiyin bu cam zəhərmiydi ki, mənə ölüm xəbərini gətirdi?

7. Bir murçəyə nədir bu kinə,
Fulada dözərmi abiginə?
Tə'siri-sitəmdən ictinab-et,
Bari bu günahə bir səvab et!
İlət məni yar olan diyarə,
Şəm' eylə məni məzari-yarə!"

8. Düşdü yola, oldu Zeydə həmrah,
Bir hal ilə kim, nəuzü-billah.
Çün gördü məzari-gül'üzarın,
Düşdüvü qucaqladı məzarın.
Köksünü qılıb ləhəd kimi çak,
Mərqəd kimi saçdı başına xak.
Qəbr üzrə axıtdı qanlı yaşın,
Lə'l eylədi yaşı qəbri daşın.

9. Yer üzün edib sirişki məmlu,
Keçdi yerə ol sirişkdən su,
Oldu düri-əşki-biqərarı
Qəbr içrə nigarının nisarı.

10. Göz yaşını eylədi müxatəb:
- "Key tirə şəbi-fəraqə kövkəb!
Çıxmaq sənə oldu indi vacib
Kim, oldu ol afitab ğaib!
Bir bürci məqam tutmuş ol mah
Kim, olmaz ona nəsim həmrah.

11. Sən durma əgər mürüvvətin var,
Gir torpağa, istə onu zinhar!
Gör qandadır ol düri-yeganə,
Netmiş ona afəti-zəmanə!
Pabus edibən yetir niyazım,
Bildir bu təzərrö ilə razım:

12. - "Key şəm", nədir bu ictinabın?
Mən bəxti siyahdən hicabın?
Cami-meyi-ğəm tutanda aləm,
Həm sən içdin bu camı, mən həm,
Məst etdi məgər səni bu badə
Kim, bəzmdə durmadın ziyadə?

13. Bir nadirə şəm' idin şəbəfruz,
Düşdü sənə zövqi-əşqdən suz,
Bir neçə zaman əgərçi yandın,
Suzi-dilə dözmədin, usandın,
Bidarlığa gətirmədin tab,
Şəhla gözün oldu maili-xab.

14. Həmrahım idin bu yolda ey mah!
Həmrahı qoyub gedərmi həmrah?
Əflakə təfaxür eylə, əy xak!
Kim, oldu rəfiqin ol düri-pak.
Zülfünə müariz olma, əy mar!
Kim, onda müqimdir dili-zar.

7. Bir qarışqaya bu düşmənlik nədir? Şüşə polada dözərmi, zülmdən əl çək! Barı bu günah qarşısında bir savab iş gör! Məni yar olan diyara apar, yarın məzarına şam elə!"

8. Zeydlə bərabər yola düşdü. Elə bir gündəydi ki, Allah göstərməsin, elə ki, gülzarının məzarını gördü, yıxılıb qəbri qucaqladı. Köksünü məzar kimi qazıb, qəbir kimi üstünə torpaq ələdi. Gözündən qan-yaş axıdıb, qəbir daşını lə'lə çevirdi.

9. Göz yaşları qəbirin torpağının üstünü doydurdu və altını da suladı. Gözündən axan incilər məzardakı nigarının üstünə şabaş kimi çiləndi.

10. Göz yaşına xitabən dedi: - "Ey qara ayrılıq gecəsinin ulduzu! İndi sənin çıxmağın vacibdir! Çünki o günəş yox oldu! O ay elə bir bürcün küncündə məqam tutub ki, ona küləklər belə çatmaz.

11. Əgər insafın varsa, sən də dayanma. Gir torpağa, onu xəbər al! Gör haradadır o yeganə inci? Zamanın odu ona nə edib?! Onun ayağını öp, arzumu, yalvarışımı yetir:

12. "Ey şam, bu qaçmağın nədir? Mən bəxtiqaradan gizlənməyin nədir? Aləm bizə qəm şərabının camını tutanda bu camdan həm mən içdim, həm sən. Bu badədən məstmi olub məclisi tərk etdin?

13. Gecələri işıqlandıran nadir bir şam idin. Eşq zövqündən od aldın. Bir neçə vaxt əgər yandınsa da, ürək oduna dözmədin, usandın. Oyaqlığa tab gətirmədin, ala gözlərinə yuxu doldu.

14. Yoldaşım idin bu yolda, ey mah! Heç yoldaş da yoldaşını qoyub gedərmi? Ey torpaq, göylərin qarşısında fəxr elə! O pak dürr sənin dostun olub! Zülfünün rəqibi olma, əy ilan, axı o saçların içində inləyən ürəyim var!

15. Xalına təərrüz etmə, ey mur!
Kim, bağlıdır onda cani-məhcur!
Ey ömr, gəl indi başa sən həm
Kim, çeşmimə tirə oldu aləm!
Aləm xoş idi ki, var idi yar,
Çün yar yox, olmasın nə kim var.
16. Ey can, təni-xəstəni vida et,
Bu xəstə ilə, yetər, niza' et!
Müştaqinəm, ey əcəl, kərəm qıl,
Dəf'i-ələm ilə rəf'i-ğəm qıl!
Qurtar məni iztirabi-ğəmdən!
Ver müjdə, vücudimə ədəmdən!
17. Ayinəmi eylə jəngdən pak,
Qıl pərdeyi-e'tibarımı çak!
Rəf' et, nə isə aradə hail,
Eylə məni ol nigarə vasil!
Təklifi-visal edər mənə yar,
Bir xəlvətə kim, yoxdur əğyar.
18. Mən getməmək eyləsəm xətadır,
Səndən mənə bir məded rəvadır.
Billah, mədədimdə qılma ehmal
Kim, bəxtimə üz veribdir iqbal!
19. Yarəb, mənə cismü can-gərəkməz,
Cananımsız cahan gərəkməz!
Minbə'd zəlilü xar qılma,
Sərgəşteyi-ruzigar qılma!"
Əfğanda ikən gedib qərari,
Oldu bu ğəzəl dilində cari:

15. Xalına toxunma ey qarışqa, çünki hicranlı canım ona bağlıdır. Ey ömrüm, daha başa gəl, axı dünya gözümdə qaraldı. Nə qədər ki, yar var idi, aləm mənə xoş idi. Yar yoxdursa, var olanlar da yox olsun.

16. Ey canım, xəstə bədənimə vida et, bəsdir, bu xəstə bədəni tərk elə. Yolunu gözləyirəm əcəl, insafın olsun! Ələmimə və qəmimə son qoy! Məni bu qəm iztirabından qurtar! Vücuduma yoxluq dünyasından müjdə ver!

17. Güzgümün pasını sil! E'tibar pərdəmi parçala, arada nə varsa yox et, məni nigarıma yetir! Yarım mənə vüsal təklif eləyir, elə bir xəlvətə ki, orada yadlar yoxdur!

18. Səndən mənə kömək rəvadır. Mən getməsəm, böyük xətadır. Allah eşqinə, köməyində ləngimə, çünki bəxtimə səadət üz verib.

19. Yarəb, mənə nə cism, nə də can gərəkdir, cananımsız cahan mənə gərək deyil! Bundan sonra da məni zəlil, xar dünyanın avarası eləmə". Fəryad içində səbrini itirdi, dilindən bu qəzəl çıxdı:

## ĞƏZƏL

Yandı canım hicr ilə, vəsli-rüxi-yar istərəm,
Dərdməndi-firqətəm, dərmani-didar istərəm.

Bülbüli-zarəm, deyil bihudə əfğan etdiyim,
Qalmışam nalan qəfəs qeydində, gülzar istərəm.

Dəhr bazarında kasiddir mətai-himmətim,
Bu mətai satmağa bir özgə bazar istərəm.

Fani olmaq istərəm, ye'ni bəlayi-dəhrdən
Rahəti-cismi-zəifü cani-əfkar istərəm.

Nola gər qılsam şəbi-hicran təmənnayi-əcəl,
Neyləyim, çoxdur ğəmim, dəf'inə ğəmxar istərəm.

Çün bəqa bəzmindədir dildar, mən həm durmazam,
Bu fəna deyrində bəzmi-vəsli-dildar istərəm.

Ey Füzuli, istəməz kimsə rizasilə fəna,
Mən ki, bundan özgə bilmən çarə, naçar istərəm.

## QƏZƏL

Yandı canım ayrılıqdan, yarın üzünü görmək istərəm.
Ayrılıq xəstəsiyəm, sevgilimdən görüş dərmanı istərəm.

Ağlar bülbüləm, əfqanım səbəbsiz deyil,
Qəfəs içindəyəm, əlacsızam, gülzar istərəm.

Dünya bazarında nəcib niyyətlərimin, alıcısı yoxdur,
Bu malı satmaq üçün bir başqa bazar istərəm.

Yox olmaq istəyirəm, ye'ni zəmanə bəlasından
Zəif cismimin və yazıq canımın rahatlığını istərəm.

Əgər ayrılıq gecəsində əcəl arzulasam, nə olar ki,
Neyləyim, qəmim çoxdur, onu dəf eləməyə qəmxar istərəm.

Sevgilim əbədiyyət məclisindədir, mən də dura bilmərəm,
Bu fəna çölündə yarın məclisinə qovuşmaq istərəm.

Ey Füzuli, heç kəs öz razılığı ilə yox olmaq istəməz,
Mənsə başqa çarə görmürəm və bunu əlacsızlıqdan istərəm

## TƏMAMİYİ-SÜXƏN

1. Çün razi-dərunin etdi təqrir,
Rə'yinə müvafiq oldu təqdir!
İmdad qılıb inayəti-həq,
Qıldı onu məqsədinə mülhəq.
Gül dərdi hədiqeyi-əməldən,
Mey içdi sürahiyi-əcəldən,
2. Qəbrini qucaqladı nigarın,
Can sədqəsi etdi ol məzarın.
- "Leyli" - dedi verdi cani-şirin
Ol aşiqi-biqərarü miskin.
3. İnsaf, həmin ola məhəbbət,
Bu dairədir məqami-heyrət,
Guya ki, əlində idi canı,
Daim gözədirdi ol zəmanı,
Çün dövr ilə yetdi ol zəmanə,
Ondan bir icazət oldu canə.
4. Hər necə ki, var idi nigari,
Aləmdə idi onun qərari,
Çün qıldı nigari tərki-aləm,
Bu aləmi tərk qıldı ol həm.
5. Çün gördü bu halı Zeydi-ğəmnak,
Əfğan qılıb etdi yaxasın çak,
Fəryad ilə qıldı növhə bünyad,
Övci-fələkə yetirdi fəryad.
Zar ağladı öylə kim, həm ol dəm
Ahı oduna yığıldı aləm.
6. El cəm olub etdilər nəzarə,
Məcnuni-siyahruzigarə.
Qəbr üstünə gördülər yıxılmış,
Cananəyə can nisar qılmış.
Əhvalına ağlayıb sərasər,
Dəfn etməyin etdilər müqərrər.
7. Ğüsl eyləyibən təni-nizarın,
Dildarının açdılar məzarın,
Qoydular onu həm ol məzarə,
Ğəmnak yetişdi ğəmgüsarə.
Ruh oldu fələkdə ruhə həmraz,
Tən oldu tən ilə yerdə dəmsaz.
Rəf oldu təəllüqati-hail,
Mətlubuna talib oldu vasil

## SÖZÜN SONU

1. Ürəyindəki sirləri deyəndən sonra tale onun arzusuna müvafiq əməl elədi. Haqqın köməyi və yardımı onu məqsədinə yetirdi. Əməl bağçasından gül dərdi, əcəl qədəhindən mey içdi.

2. Nigarının məzarını qucaqlayıb canını ona qurban elədi. Zavallı və səbrsiz aşiq "Leyli" deyərək öz şirin canını verdi.

3. İnsafən, əsl məhəbbət budur, heyrət bu dərəcədə əmələ gəlir. Elə bil ki, canı əlində idi, həmişə bu anı gözləyirdi. Dövran o zamana gəlib çatan kimi canının getməsinə icazə verdi.

4. Neçə ki, nigarı var idi, dünyada onun da yeri var idi. Elə ki, nigarı dünyadan köçdü, o da dünyanı tərk etdi.

5. Dərdli Zeyd bu halı görəndə yaxasını yırtıb, fəryad qopardı, növhə dedi, səsini göylərin zirvəsinə ucaltdı. Elə zar-zar ağladı ki, bütün aləm ahının oduna toplaşdı.

6. Bütün el cəm olub Məcnun bəxti qaranı qəbr üstünə yıxılıb canını sevgilisinə qurban vermiş gördü. Onun halına ağlaya-ağlaya dəfn etmək qərarına gəldilər.

7. Zəif bədənini yuyub qüsl verdilər, nigarının məzarını açıb onu da həmin qəbrə qoydular. Nəhayət, dərdli dərdlisinə yetişdi. Ruh göylərdə ruhla görüşdü, bədən yerdə bədənə qovuşdu. Bütün çətinliklər yox oldu. İstəkli istəyinə çatdı.

8. Bir bəzm iki şahə məhfil oldu,
Bir bürc iki mahə mənzil oldu.
Qəbr üstünə qoydular nişanə,
Faş oldu bu macəra cəhanə.
9. Tövfündə qılıb murad hasil,
Ol qəbrə xəlayiq oldu mail,
Keçdikcə zaman mükərrəm oldu,
Hacətgəhi-əhli-aləm oldu.
Budur əsəri-məhəbbəti-pak,
Xoş mərtəbədir bu, qılsan idrak.

8. Bir məclisə iki şah qonaq oldu. Bir bürc iki aya mənzil oldu. Qəbrin üstünə nişan qoyuldu və bu əfsanə bütün dünyaya yayıldı.

9. Arzuları çin olmaq üçün xalq o məzarın başına dolandı. Zaman keçdikcə, qəbrin hörməti daha da artdı və el-aləmin ziyarətgahına çevrildi. Bu pak məhəbbətin əsəridir və yaxşı düşünsən, çox xoş mərtəbədir.

## BU, ZEYDİN LEYLİ İLƏ MƏCNUNU RÖ'YASINDA GÖRDÜYÜDÜR

1. Ol məşhədə Zeyd olub mücavir,
Asari-sədaqət etdi zahir.
Tə'mir üçün etdi çox ətalər,
Tədric ilə qıldı çox binalər.
2. Peyvəstə hərarəti-ciyərdən,
Qəndili-məzarın etdi rövşən.
Carub ilə ab olanda mətlub,
Müjgan ilə əşki abü carub.
Hər ləhzə qılırdı tazə matəm,
Qılmazdı fəğanü naləsin kəm.
3. Ol munisü müşfiqü müvafiq,
Bir gecə qəribi-sübhi-sadiq,
Bimar tənində qalmayıb tab,
Qılmışdı məzarə yastanıb xab;
4. Xab içrə göründü ol nizarə,
Bir bağidə iki mahparə;
Rüxsarlərində zövqdən nur,
Bimi-ğəmü dərdü ğüssədən dur.
Xoşvəqtü nişatməndü dilş ad,
Əğyar təərrüzündən azad.
5. Hər məhvəşə min firiştəsurət,
İxlas ilə olmuş əhli-xidmət.
Sordu ki: - "Bular nə mahlərdir?
Nə rütbəli padşahlərdir?
Bu rövzə nə rövzeyi-bərindir,
Bu qövm nə qövmi-nazənindir?"
6. - "Budur"-dedilər-riyazi-rizvan,
Bu qövmi-xücəstə-hurü ğilman.
Bu iki məhi-xücəstərüxsar
Məcnun ilə Leyliyi-vəfadar.
Çün vadiyi-eşqə girdilər pak,
7. Ol paklik ilə oldular xak,
Mənzilləri oldu baği-rizvan,
Çakərləri oldu hurü ğilman.
Çün bunda riza verib ğəzayə,
Səbr eylədilər ğəmü bəlayə,
Getdikdə cahani-bivəfadən,
Qurtuldular ol ğəmü bəladən.
8. Çün Zeyd yuxudan oldu bidar,
Bu nüktəyi etdi xəlqə izhar,
Xəlqin olub e'tiqadı əfzun,
Ol qəbrə ziyarət oldu qanun.

## BU, ZEYDİN LEYLİ İLƏ MƏCNUNU RÖ'YASINDA GÖRDÜYÜDÜR

1. Zeyd bu şəhidlər qəbrinə keşikçi oldu, sədaqət göstərdi. Oranı abad saxlamaq üçün çox bəxşiş verdi və tədricən çox binalar ucaltdı.

2. Daima ürək, ciyər yanğısı ilə o məzarın şamını yandırdı. Göz yaşı ilə məzarı sulayıb kirpiklərilə süpürürdü. Hər anda təzə bir matəm qururdu, naləsini azaltmırdı.

3. O mehriban və sadiq dostun xəstə canında güc qalmamışdı, bir gecə məzara sıxılıb yuxulamışdı.

4. Yuxuda yazığa bir bağçada iki ay parçası göründü: üzlərində zövqdən nur, dərd-qəm, qüssə qorxusundan uzaq, xoşbəxt, şad, ürəkləri açıq, yadların dedi-qodusundan azad idilər.

5. Gözəllərin hərəsinin qulluğunda sədaqətlə min mələk xidmət edirdi. Xəbər aldı ki, kimdir bu aylar, hansı rütbəli padşahlardır. Bu cənnət nə uca cənnətdir, bu adamlar nə qədər nazənindir.

6. Cavab verdilər ki, bura cənnət bağçasıdır, bu mübarək tayfa isə huri və qılmanlardır, iki gözəl sifətli ay vəfalı Leyli və Məcnundur.

7. Eşq vadisində pak girdikləri üçün öz paklıqları ilə də torpaq oldular, mənzilləri cənnət oldu. Qulluqçuları huri və qilmanlar oldu. Qəza ilə razılaşıb qəmə, bəlaya dözdükləri üçün vəfasız dünyadan gedən də o qəmdən və bəladan qurtardılar.

8. Zeyd yuxudan oyanıb gördüklərini xalqa danışdı. Xalqın inamı daha da artdı və məzar ziyarətgaha çevrildi.

## TƏMAMİYİ-SÜXƏN

1. Saqi, mütəğəyyir oldu halım,
Söyləşməyə qalmadı məcalım!
Minbə'd ziyadə vermə badə,
Rəhm eylə ki, sərxoşam ziyadə!
Xoş ğəflət ilə keçirdim əyyam,
Bilmən ki, nolur işim sərəncam?
2. Sərmayəyi-ömr getdi əldən,
Sud etmədim etdiyim əməldən.
Fəryad bu cövrdən ki, gərdun
Əhvalimi eylədi digərgun.
3. Dün dideyi-tər qılıb gühərbar,
Gərdunə dedim ki, - "Ey cəfakar!
Hərgiz rəvişindən olmadım şad,
Dami-ğəmü möhnətindən azad.
Əhbabə nəqiz dövr edərsən,
Ərbabi-kəmalə cövr edərsən.
4. Məcnun əgər olsa idi cahil,
Olmazdın itaətində kahil.
Fərmanına inqiyad edərdin,
Könlünü müdam şad edərdin.
Əhli-hünər olduğu səbəbdən,
Sahibnəzər olduğu səbəbdən,
Əqranı içində xar qıldın,
Biizzətü e'tibar qıldın.
5. Leyli gər olaydı bir həyasız,
Ya sən kimi mehrsiz, vəfasız,
Olmazdı ona həmişə cövrün,
Kamınca müdam olurdu dövrün.
Fəzl əhlinə mail olduğundan,
İdrak ilə kamil olduğundan,
Daim ğəm əlində zar qıldın,
Aşüfteyi-ruzigar qıldın.
6. Mən həm gər olaydım əhli-təzvir,
Etməzdin ianətimdə təqsir.
Səndən ğərəzim olub sərəncam,
Dövründə mənə olurdu aram.
Çün əhli-vüqarü nəngü arəm,
Cövrünlə həmişə xarü zarəm,
Bu üzdən imiş sənin mədarın,
Var, indi ki, yoxdur e'tibarın!"

## SÖZÜN SONU

1. Saqi, halım pozuldu, sözümü deməyə macalım qalmadı! Daha mənə şərab vermə, rəhmin gəlsin, yaman sərxoşam! Günümü xoş xəbərsizlikdə keçirdim, heç bilmirəm, işim nəylə qurtaracaq!

2. Ömrümün mayası əldən getdi, amma tutduğum əməldən fayda görmədim. Fəryad bu mənim əhvalımı pozmuş zülmün əlindən.

3. Dünən gözümün yaşını gövhər kimi saçıb fələyə dedim ki: "Ey zülmkar! Sənin davranışından heç vaxt şadlıq görmədim, dərd və qəm tələndən azad olmadım. Həmişə yaxşıların ziddinə dövr edirsən, kamal əhlinə zülm edirsən.

4. Məcnun əgər cahil olsaydı, onun itaətində ləngiməzdin, buyruğunda diz çökərdin, könlünü həmişə şadlandırardın. Hünərli və gözəgəlimli olduğu üçün onu qohum-qardaş içində xar və zəlil, e'tibarsız elədin.

5. Leyli bir həyasız və sənin kimi rəhmsiz və vəfasız olsaydı, ona da zülm etməzdin, onun kamınca dolanardın. Ağıllılara mail olduğu üçün və özü də kamallı olduğu üçün daim onu qəm içində inlətdin, dünyanın başı bəlalısı elədin.

6. Mən də riyakarın biri olsaydım, mənə kömək etməkdə ləngiməzdin. Mənə düşmənçiliyin də səbəbi sənsən, çünki mən vüqar və həya sahibiyəm və sənin zülmündən alçalmışam və ağlayıram. Sənin dövranın belə imiş və e'tibarın yox imiş".

7. Gərdun eşidib mənim itabım,
Verdi bu əda ilə cəvabım:
- " Kəy surəti-haldən xəbərsiz!
Hər hikmətə eyb edən hünərsiz!
Mən ömrə müvafiq eylərəm dövr,
Hikmətdə vəfadır etdiyim cövr.
8. Əmma sən edən əməl xətadır
Kim, piri-təriqətin həvadır.
Şairliyə iftixar edibsən,
Kizbi özünə şüar edibsən.
9. Məcnun dediyin vücudi-kamil
Hər danişə məndən oldu qabil.
Divanə ona sən eylədin ad,
Səndən ona yetdi zülmü bidad!
10. Leyli dediyin məhi-təmami
Mən pərdədə saxladım girami,
Risvayi-xəlayiq eylədin sən,
Min tə'nəyə layiq eylədin sən!
11. Gəh Ibn Səlamə zülmi ilhaq,
Gah Novfələ qədri qıldın itlaq.
Şərm et, bu nə hərzədir, nə möhməl?
Nə Ibn Səlamü qanğı Novfəl?
12. Şərh eyləmək istədin fəsanə,
Qıldın sözə onları bəhanə,
Gördü çürümüş sümüklər azar,
Töhmətlərinə olub giriftar,
Əmvat məzalimine girdin,
Asudələrə əzab verdin.
13. Cürmünə olanda xəlq mülzəm,
Lazım sorulur bu iftira həm?
Olmazmı bu baisi-əzabın?
Bu məs'ələdə nədir cavabın?"

7. Göylər mənim töhmətimi eşidib cavab verdi: "Ey işin əslindən xəbərsiz! Hər hikmətdə eyb tapan hünərsiz! Mən ömrə uyğun dolanmaqdayam. Əslində, elədiyim zülm də xeyirxahlıqdır.

8. Ancaq sənin əməlin xətadır, çünki sənin yolunun mürşidi havadır, həvəsdir. Şairliyinlə öyünürsən və yalanı özünə peşə seçibsən.

9. Məcnun dediyin kamil vücud hər elmdə məndən oldu qabil. Ona divanə adını sən vermisən və bu amansız zülmə onu sən salmısan.

10. Leyli dediyin o dolğun ayı mən həmişə pərdədə hörmətli saxladım. Onu xalq içində rüsvay edən min tə'nəyə layiq edən sən oldun!

11. Gah Ibn Səlamı zülmkar, gah Novfəli qədirbilən etdin. Utan, bu nə boş sözdür? İbn Səlam nədir? Hansı Novfəl?

12. Əfsanə yazmaq üçün onları bəhanə elədin. Çürümüş sümüklərə də rahatlıq vermədin, töhmətlərə saldın. Meyitlərə də, dirilərə də əzab verdin.

13. Xalq günahını boynuna alanda bu iftira da soruşulacaq. Bu sənin əzabına bais olmazmı? Cavabın nədir?

## CAVABİ-MƏSƏLƏ

1. Ey tutiyi-bustani-göftar,
Sərrafi-süxən, Füzuliyi-zar!
Aldanma, əgər sipehri-laib
Tə'n ilə sənə dedisə kazib.
2. Əş'arə yaman deyib usanma,
Sərmayeyi-nəzmi səhl sanma!
Sözdür gühəri-xəzaneyi-dil,
İzhari-sifati-zatə qabil!
3. Can sözdür, əgər bilirsə insan,
Sözdür ki, deyərlər, özgədir can.
Billah bu yamanmıdır ki, hala
Əmvatə söz ilə verdin əhya?
Məcnun ilə Leyliyi qılıb yad,
Ərvahlarını eylədin şad?

## MƏSƏLƏNİN CAVABI

1. Ey nitq bağçasının tutisi, söz sərrafı, ağlar Füzuli! Aldanma əgər oyunbaz fələk sənə tə'nə eləyib yalançı deyibsə.

2. Şe'rə yalan deyib usanma! Şe'r sərmayəsini asan sanma! Söz ürək xəzinəsinin gövhəridir. İnsanın əsl sifətini göstərən də odur.

3. Can sözdür, əgər bilirsə insan, sözdür ki, deyirlər özgədir can. Vallah, bu pisdirmi ki, söz ilə ölüləri diriltdim, Məcnunu və Leylini yad etdim, onların ruhlarını şadlandırdım.

**BU, BƏYANİ-ÜZRİ-TƏ'LİFİ-KİTABDIR VƏ TARİXİ-ZƏMANİ-FƏTHİ-BABDIR**

1. Ey kilki-rəvəndə, barəkallah!
Oldun məni-rəhnəvərdə həmrah!
Min sə'y ilə hacətim bitirdin,
Bir mənzilə aqibət yetirdin.
2. Rəhmət sənə kim, sən etdin imdad,
Bu əski binayi etdin abad;
Əşk ilə biruni-sim-əndud,
Ah ilə dəruni-ənbəralud;
Məxzənləri gənci-gövhəri-dərd,
Rövzənləri mənfəzi-dəmi-sərd.
3. Əlqissə, mürəttəb oldu bir bağ,
Hər lalesi bağrı üzrə yüz dağ.
Xuni-ciyər abi-cuybari,
Növki-müjə əbri-növbəhari.
4. Ol dəm ki, bu nüsxə oldu mərqum,
"Leyli-Məcnun" adıyla mövsum.
İzharə gəlib rümuzi-vəhdət,
Vəhdətdə tamam olub hekayət,
Tarixinə düşdülər müvafiq:
Bir olmaq ilə ol iki aşiq".

**BU, KİTABIN YAZILMASI ÜÇÜN ÜZRXAHLIQDIR VƏ ONUN BAŞLANĞICININ TARİXİDİR**

1. Ey yürüyən qələm! Barəkallah! Mən yolçuya yoldaş oldun. Min sə'y ilə məqsədimə çatdırdın, axırda bir mənzilə yetirdin.

2. Rəhmət sənə, çöldən göz yaşı ilə gümüşlənmiş olan, ah ilə içərisi ətirlənmiş, xəzinələri dərd gövhərinin dəfinəsi, bacaları soyuq nəfəs gələn bu köhnə binanı abad elədin.

3. Qısası, elə bir bağ salındı ki, hər lalənin bağrında yüz dağ, ciyər qanı, kipriyinin ucu təzə bahar buludu kimi dolu...

4. O vaxt ki, bu kitab yazıldı və adı Leyli-Məcnun qoyuldu, vəhdət rəmzləri göründü. Hekayət vəhdətdə bitdi və buna uyğun olaraq, o "iki aşiq bir olmaqla"* tarixi yazıldı.

## BU, ƏRBABİ-VƏFADƏN TƏVƏQQÖİ-QƏBULİ-MƏ'ZİRƏTDİR VƏ ƏSHABİ-ZƏKADƏN TƏMƏNNAYİ-DUAYİ-MƏĞFİRƏTDİR

1. İnsaf ver, ey həsud, insaf!
Tə'n etmə ki, cövhərin deyil saf!
Əhvalımı gör xərabü müztər,
Ənduhi-zəmanədən mükəddər.
Söz dairəsi deyil bu əhval,
İnsaf mənə kim, olmazam lal.
2. Məndən təmə" etmə fikri-saib,
Əhvalımadır sözüm münasib.
Azdır demə cövhəri-səfasın,
Bir sor ki: nə verdilər bəhasın?
Billah, gər olaydı bir xiridar,
Min gənci-nihan qılardım izhar.
3. Filcümlə bu həm ki, oldu məstur
Bir şövq ilə zövqdən deyil dur.
Eybi hünər ixtiyar qılma!
Şe'rim həsədin şüar qılma!
Bihudə, yetər, təərrüz eylə,
Gər qadir isən, cəvab söylə!
Tərk eylə təərrüzü inadi
Kim, vadiyi-cəhldir bu vadi!
Dəm xeyr sözündən ur dəmadəm,
Vər xeyr deməzsən - əbsəm, əbsəm!

## BU, SƏMİMİ DOSTLARDAN BİZİM ÜZRÜMÜZÜ QƏBUL ETMƏK XAHİŞİMİZDİR VƏ ZƏKA ƏHLİNDƏN BİZİ BAĞIŞLAMAQ DUASI TƏMƏNNAMIZIDIR

1. İnsafın olsun, ey paxıl, insafın! Tə'nə vurma ki, cövhərin saf deyil! Gör ki, əhvalım nə qədər pozuq və iztirablıdır. Zəmanə zülmündən nə qədər kədərlidir. Bu əhvalı sözlə demək olmaz, yazığın gəlsin mənə - lal ola bilmərəm.

2. Məni qərəzli bilmə, məndən dəqiq fikir umma, sözüm əhvalıma münasibdir. Saf cövhərimə azdır demə, bir soruş ki, nə qiymət verdilər? Billah, bir müştəri, anlayan ilgi olsaydı, min gizli xəzinə açardım.

3. Bir sözlə, bu yazılıb bitən şövqdən və zövqdən uzaq deyil. Eybi hünər sanma! Şe'rimə həsədi şüar eləmə! Boş yerə, bəsdir, sataşma, əgər qüdrətin varsa, cavab ver! İnadı, öcəşməni burax, bu vadi cəhalət vadisidir! Daima xeyir sözündən dəm vur, əgər demirsənsə, sus, sus!

## İZAHLAR

Səh. 15. Fırtınanın bəhri — bəhr sözü burada həm dəniz və həm də əruzun bəhri mə'nasında işlədilib.

səh. 15. "üzüm ağ olsun" mənasındadır.

səh. 16. Dörd dost – Əbubəkr, Ömər, Osman, Əli nəzərdə tutulub.

səh. 16. "Kön fəkan"-da - ol, yaran.

səh. 20. "Kaf" və "Nun" "kon"-ol sözünün ərəbcə yazılışında işlədilən iki hərf: "k" və "n". Allah dünyanı bu sözü deyərək yaratmışdır.

səh. 22. Gündüzə və gecəyə işarə olunur– Redaktor.

səh. 23. Xaş-xaş – tiryək xam malı

səh. 24. Levlak - sən olmasaydın allah dünyanı yaratmazdı.

səh. 24. Yasin - quran surəsinin adı

səh. 24. Taha - Məhəmməd peyğəmbərin adlarından biri.

səh. 27. Ütarid, Bəhram və Keyvan - planetlərin ərəbcə adlarıdır.

səh. 29. Ərəb əlifbası ilə "ənbiya"(peyğəmbərlər) sözünün əvvəli və sonu əlif hərfiylə yazılır.

səh. 35. Harut və marut — planetlərin adı.

səh. 41. Tərcümə S. Vurğunundur

səh. 43. Elm, ədəb, şücaət və səxavət nəzərdə tutulur.

səh. 45. Gözdə bəbək kimi.

səh. 48. Burada bir bəzək boyası.

səh. 70. Key Xosrov, çin xaqanı.

səh. 84. Qara xalıya və Kə'bə daşının qara rənginə işarədir.

səh. 161—163. Bu bölmədə xeyli ulduz, səyyarə və göy bürclərinin Füzuli dövrünün astronomiyası və astrologiyası səviyyəsində təsviri verilmişdir

səh. 217. "İki aşiq" və "bir" sözləri əbcəd hesabına görə 943 olur. Beləliklə, əsərin yazıldığı tarix hicri 943-cü (miladi 1537-ci) ilə təsadüf edir. (Redaktor)

## İÇİNDƏKİLƏR

Bədii redaktoru ***Tale Məlik***.
Texniki redaktoru ***Zoya Nəcəfova***.
Korrektoru ***Ayna Hüseynova***.
Yığım operatorları ***İlhamə Kərimova, Həlimə Mehdiyeva***.
Bilgisayarda səhifələdi ***Məhəbbət Orucov***.

Yıqılmağa verilmiş 3.1.99. Çapa imzalanmiş 24.11.99
Ofset çap üsulu ilə. Formatı 70x90 1/16. Ofset kağızı.
Şərti çap vərəqi 16,38. Uçot nəşr vərəqi 15,0. Tirajı 1500.
Sifariş № 79. Müqavilə qiyməti ilə.

Azərbaycan Respublikasi Mətbuat və
İnformasiya nazirliyi
Azərbaycan Dövlət Nəşriyyatı
Bakı-370005, Hüsü Hacıyev küçəsi, 4

Azərbaycan Respublikasi Mətbuat və
İnformasiya nazirliyi
1 №-li mətbəə, Bakı ş., Ə.Bayramov küç. 3.